*Bu kitab “Azərbaycan klassik ədəbiyyatı kitabxanası.*
*XIII-XVI əsrlər Azərbaycan şeri. İyirmi cilddə. III cild”*
(*Bakı, Elm, 1984*) *nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni: **Cahangir Qəhrəmanov**

**894.361 - dc 21**
**AZE**
**Azərbaycan klassik ədəbiyyatından seçmələr.** Üç cilddə. II cild. Bakı, “Şərq-Qərb”, 2005, 408 səh.

XIII-XVI əsrlər Azərbaycan ədəbiyyatı yeni mühüm keyfiyyətlər qazanmış, özünəməxsus, mürəkkəb bir inkişaf yolu keçərək yüksək təkamül nöqtəsinə çatmışdır. İctimai-fəlsəfi məzmun, bədii dil və poetik üslub baxımından Füzuli qələminin qüdrəti ilə kamillik dərəcəsinə yetən bu dövr Azərbaycan poeziyası artıq Yaxın Şərq xalqlarının söz sənətinə təsir göstərməyə başlamışdır.

“Azərbaycan klassik ədəbiyyatından seçmələr”in bu cildinə XIII-XVI əsrlərin ən görkəmli şairlərinin – İzzəddin Həsənoğlu, Qazi Bürhanəddin, Əssar Təbrizi, İmadəddin Nəsimi Şah Qasım Ənvar, Kişvəri, Şah İsmayıl Xətayi, Məhəmməd Füzuli və b. seçilmiş əsərləri daxil edilmişdir. Məcmuədə öz ecazkar təsir qüvvəsini, gözəllik və təravətini bu gün belə itirməmiş müxtəlif janrlı ədəbi əsərlər – poemalar, qəzəllər, qəsidələr, rübailər, tuyuğlar təqdim olunur.

**ISBN 9952-418-53-9**

Azərbaycan Respublikasının Prezidenti

İLHAM ƏLİYEVİN

**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**

12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## MÜQƏDDİMƏ

Azərbaycan xalqının çoxəsrlik və zəngin tarixini bu tarixin özü qədər qədim və zəngin olan poeziyasız təsəvvür etmək mümkün deyil. Bu əzəmətli poeziyanın əsas ideya-bədii istiqamətini əsrlərdən-əsrlərə, nəsillərdən-nəsillərə verilən və müəyyən bir hissəsi bizim dövrümüzədək gəlib çatan ecazkar xalq mahnıları, nağıl və dastanlar, əmək, mövsüm, mərasim nəğmələri, bayatılar və başqa şifahi ədəbiyyat nümunələrindən gələn mövzu, süjet, dil və üslub xüsusiyyətləri təşkil edir.

Bununla yanaşı, tarixi inkişafın müxtəlif mərhələlərində Azərbaycan xalqı bir sıra başqa Şərq xalqları ilə iqtisadi, siyasi və mədəni ədəbi təmasda olmuş, həmçinin yadelli qəsbkarların basqınlarına məruz qalmışdır ki, bunlar da qədim və orta əsrlər Azərbaycan ədəbiyyatında dərin izlər buraxmaya bilməzdi. Məhz bunun nəticəsidir ki, istər farsdilli, istərsə də doğma Azərbaycan dilində yaranan yazılı ədəbiyyatımızda ərəb, fars, yunan, monqol-tibet, hind-budda folklorunun və ədəbi janrlarının təsirini görmək olur.

Azərbaycan ədəbiyyatının qədim və orta əsrlər dövrünə dair ilk tədqiqatlara, klassiklərimizin həyat və yaradıcılığına dair materialların toplanması işinə XX əsrin əvvəllərindən başlanmışdır.

Bununla belə, təəssüflə qeyd edilməlidir ki, bu dövrdə yaranmış ədəbi əsərlərin xeyli hissəsi müxtəlif səbəblər üzündən tarixin keşməkeşlərində itib-batmış, dövrümüzədək gəlib çatmamışdır. Ən çox sevilən və buna görə də xalq içərisində geniş yayılan əsərlər nüsxələrinin çoxluğu sayəsində saxlanılsa da, bir çox istedadlı şairlərin yaradıcılığından qısa parçalara və ayrı-ayrı şeirlərə ancaq cünglərdə və təzkirələrdə rast gəlmək olur.

Bundan əlavə, bizədək gəlib çatan əsərlərin bir çoxu əlyazma nüsxələrinin sayca azlığı və ya dünyanın ayrı-ayrı kitabxana və muzeylərində olması üzündən indiyədək testoloji baxımdan tədqiq olunmamış və onların tənqidi mətnləri nəşr edilməmişdir. Bütün bunlar klassik ədəbiyyatımızın mükəmməl və sistemli tədqiqini, ayrı-ayrı dövrlərdə gedən ədəbi prosesləri, onların qarşılıqlı və ziddiyyətli cəhətlərini və s. öyrənməyə mane olur.

Bununla yanaşı, qeyd etmək lazımdır ki, bu sahədə xeyli işlər görülmüş, bir sıra ciddi monoqrafiyalar yazılmışdır ki, bunlar Azərbaycan ədəbiyyatının müxtəlif dövrlərini daha dərindən işıqlandırmağa və ümumi mənzərəsini müəyyənləşdirməyə imkan vermişdir. Lakin ədəbi prosesin ümumi inkişafını, ədəbi ənənələrin ardıcıllığını müəyyənləşdirmək, ədəbiyyatda ideya

və estetik prinsiplər mübarizəsini hərtərəfli işıqlandırmaq və onun obrazlı sistemini yaratmaq üçün Azərbaycan ədəbiyyatşünasları hələ bundan sonra da xeyli tədqiqat işləri aparmalıdırlar.

* * *

XIII-XVI əsrlərdə Azərbaycan ədəbiyyatı çətin və mürəkkəb bir ictimai-iqtisadi şəraitdə inkişaf etmişdir. XIII əsrin əvvəllərindən başlayan ağır monqol əsarəti bir müddət ədəbiyyat, incəsənət və elmin inkişafını ləngitdi. Lakin işğalçılar da tarixi zərurətlə hesablaşmaya bilməzdilər. Yerli əhali ilə müqayisədə maddi və mənəvi inkişaf səviyyəsi xeyli aşağı olan monqollar azərbaycanlıları dövlət idarələrinə cəlb etməyə, onların mədəniyyət və həyat tərzini qəbul etməyə məcbur oldular. Beləliklə, monqollar nəinki Azərbaycan mədəniyyətinə və dilinə təsir göstərə bilmədilər, əksinə özləri tezliklə assimilyasiyaya uğrayıb, yerli əhaliyə qarışdılar.

Şəraitin çətinliyinə baxmayaraq, xalq öz mədəniyyətinin inkişafını davam etdirirdi. Monqol əsarəti dövründə belə Azərbaycan Şərqin ən mühüm mədəni mərkəzlərindən biri olaraq qalmaqda idi. Nəsirəddin Tusi (1201-1274) tərəfindən əsası qoyulan və bütün orta əsrlər Şərqində geniş şöhrət tapan Marağa rəsədxanası, Təbrizdə tikilən "Rəbi-Rəşidi" adlı böyük elm şəhərciyi Şərqin intibah mədəniyyəti mərkəzinə çevrilmişdi. Bu müəssisələrdə azərbaycanlılarla yanaşı başqa ölkələrdən gələn tələbələr də təhsil alır, Çindən, Hindistandan, Suriyadan və Misirdən dəvət edilmiş alim və müəllimlər çalışırdılar. Təbrizdə elmi məqsədlə yaradılmış kitabxanada Şərqin bir çox ölkələrindən gətirilmiş qiymətli əlyazmaları saxlanılırdı.

Tarixçilərdən Fəzlullah Rəşidəddin, Məhəmməd Hinduşah Naxçıvani, musiqi nəzəriyyəçilərindən Məhəmməd Əbubəkr oğlu Şirvani və Xacə Əbdülqadir Marağalı, riyaziyyatçı Übeyd Təbrizi, fəlsəfə sahəsində isə Mahmud Şəbüstəri dövrün məşhur alimləri kimi tanınmışdılar.

Ədəbiyyatşünaslıq sahəsində yaranan əsərlər içərisində Nəsirəddin Tusinin "Əsas ül-iqtibas" və "Meyar üş-şeir" kitabları, Şərəfəddin Rami Təbrizinin "Ənis ül-üşşaq" və "Hədayiq ül-həqayiq" əsərləri xüsusilə böyük maraq doğurur.

XIII əsr Azərbaycan bədii ədəbiyyatının inkişafında da bir sıra ciddi dəyişikliklər baş verir. Saray ədəbiyyatı, qəsidə şeri nisbətən zəifləyir. Monqol əsarəti və daxili feodal müharibələri poeziyada bədbinlik motivləri doğurur. Bu isə, öz növbəsində, sufi ədəbiyyatının, xüsusilə də onun mövcud quruluşdan mistik formada narazılıq ifadə edən panteist cərəyanlarının güclənməsinə

səbəb olur. Dövrün ən mühüm ədəbi hadisəsi isə, sözsüz ki, türkdilli Azərbaycan yazılı ədəbiyyatının yaranması sayılmalıdır.

Məlum olduğu kimi, XI–XII əsrlər Azərbaycan yazılı ədəbiyyatı əsasən fars, qismən də ərəb dilində yaranmışdır. XII əsrdə farsdilli ədəbiyyat ideya-bədii dəyəri baxımından son dərəcə yüksək zirvəyə qalxsa da, təbiidir ki, savadsız və fars dilini bilməyən geniş xalq kütlələri onun nailiyyətlərindən bəhrələnə bilməzdi. Bu ədəbiyyatdan ancaq fars dilini bilən feodal hakimləri və əyanları, həmçinin şəhər əhalisinin bəzi təbəqələri (tacirlər, ruhanilər, sənətkarlar, məmurlar və b.) istifadə edə bilərdilər. Təsadüfi deyil ki, şahlara baş əyməyən bəzi böyük şairlər istisna olmaqla, farsca yazan müəlliflərin əksəriyyəti özlərini ədəbiyyat və incəsənətin hamisi sayan feodal hakimlərinin saraylarında yaşayırdılar. Saraya yol tapmayan şairlər çox çətinliklə yaşamaq üçün vəsait qazana bilirdilər. Buna görə də XI–XII əsrlərdə yaranan farsdilli ədəbiyyatın böyük bir hissəsini saray ədəbiyyatı, şahları, sultanları tərifləyən mədhiyyələr təşkil edirdi. Mədəniyyət sahəsində iranpərəst siyasət yeridən yerli feodal sülalələrinin süqutundan sonra farsdilli Azərbaycan ədəbiyyatı tədricən tənəzzülə uğrayır. Çingiz xandan başlayaraq ilk monqol hakimləri İran ədiblərinin təmtəraqlı və qəliz üslubunu xoşlamırdılar. Buna görə də öz himayəçilərini itirən və farsca bilməyən yerli əhali tərəfindən qiymətləndirilməyən farsdilli ədəbiyyat monqol istilasından sonra tədricən öz mövqeyini türkdilli ədəbiyyata verməyə başlayır.

Qeyd etmək lazımdır ki, anadilli yazılı ədəbiyyatımızın yaranması heç də birdən-birə baş verməmiş, uzunmüddətli və təkamüllü bir inkişaf yolu keçmişdir. Bu ədəbiyyatın formalaşmasının səciyyəvi xüsusiyyətləri və ərəb-fars poeziyasının ona təsiri məsələləri ədəbiyyatşünaslığımızda ətraflı tədqiq olunmadığından bu barədə bir qədər ətraflı danışmalı olacağıq.

Y.E.Bertels ədəbi təsir məsələsi haqqında yazırdı: "Ədəbiyyat hadisələrinin bir xalqdan başqasına keçməsi faktının özü yox, onun səbəbləri, xüsusilə də alınmış materialın yeni mühitdə uğradığı dəyişikliklər maraq doğurur"[1].

Azərbaycan dilində yaranan yazılı ədəbiyyat istər məfkurə, mövzu baxımından, istərsə də janr, forma və vəzn nöqteyi-nəzərindən iki mənbə ilə – bir tərəfdən zəngin Azərbaycan folklor ədəbiyyatı və qədim ümumtürk yazılı abidələri ilə, digər tərəfdən isə artıq farsdilli Azərbaycan ədəbiyyatında sabitləşmiş ərəb-fars ədəbi qanun-qaydaları ilə bağlı idi.

Yazılı ədəbiyyatdan əvvəl Azərbaycan dilində çox zəngin şifahi xalq ədəbiyyatı nümunələri yaranması faktı təkzibedilməzdir. Bunu həm "Kitabi-Dədə Qorqud" dastanı, həm də görkəmli türk filoloqu Mahmud Kaşğarinin

---

[1] Е.Э.Бертельс. К вопросу о филологической основе восточных памятников. "Советское востоковедение", №3, 1955, səh.15.

1072–1074-cü illərdə yazdığı və bütün türk xalqlarının ümumi abidəsi sayılan "Divani-lüğət it-türk" əsərindəki çoxlu misra və beytlər, nəğmələr, epik məzmunlu parçalar təsdiq edir. Sözsüz ki, bu qüvvətli folklor ədəbiyyatı türkdilli yazılı poeziyamızın yaranmasına və formalaşmasına təsir göstərməyə bilməzdi. Bunu da qeyd etmək lazımdır ki, mövzu, ideya və süjet baxımından qədim türkdilli abidələrin, həm də Azərbaycan dastan və nağıllarının XI–XII əsrlərdə yaranmış farsdilli ədəbiyyatımıza da böyük təsiri olmuşdur. Məsələn, qədim türk abidələri üçün səciyyəvi olan bir çox bədii təsvir üsullarına, o cümlədən xaqanın öz xalqının qeydinə qalması, yüksək hərbi istedada malik olması, dünyagörmüş qocalarla məsləhətləşməsi, yürüşdən zəfərlə qayıtması, qəhrəmanın öz ulu babalarının adət-ənənələrinə sadiq qalması, qadına müsbət münasibət, yeddi rəqəminin dini-mifoloji təsəvvürlər üzündən təşrifati mənalarda işlədilməsi[1] və s. kimi hallara Nizami Gəncəvinin əsərlərində də rast gəlinir. Lakin türkdilli yazılı ədəbiyyatımızda yaranan epik əsərlərdə şifahi ədəbiyyatın ideya-tematik təsiri daha qabarıq şəkildə nəzərə çarpır. Doğma Azərbaycan dilində yazan şairlər folklor materiallarından daha geniş istifadə edir, xalq dastan və nağıllarından gələn motivlər onların şerinə yeni xüsusiyyətlər aşılayırdı.

Yaxın Şərq xalqları ədəbiyyatlarının mövzusu və süjet baxımından Azərbaycan yazılı poeziyasına təsir məsələsinə gəlincə, bu haqda geniş ədəbiyyat mövcud olduğundan bunun üzərində dayanmağı lazım bilmirik[2].

Vəzn, forma və janr baxımından türkdilli yazılı poeziyamıza ərəb-fars şerinin təsiri daha güclü olmuşdur. Bu, hər şeydən qabaq, klassik dövr şerimizin vəznində özünü göstərir. Məlumdur ki, zəngin el ədəbiyyatımız misralardakı hecaların sayının bərabərliyini nəzərdə tutan heca vəzni əsasında yüksəlmişdir. Yalnız qədim türkdilli kitabələrdə və "Kitabi-Dədə Qorqud" dastanında poeziyanın yeganə poetik vasitəsi kimi hələlik sabitləşməmiş vəzni və qafiyəni əvəz edən alliterasiyadan istifadə olunmuşdur. Ərəb şerinin milli forması olan, sonralar fars poeziyasına, ondan da Azərbaycan və başqa Şərq xalqlarının ədəbiyyatına keçən əruz vəzni isə misralardakı uzun və qısa hecaların

---

[1] И.Б.Стеблева. Поэтика древнетюркской литературы и ее трансформация в раннеклассический период. М., 1976, səh.72, 88.

[2] Bu məsələ haqqında yazılmış tədqiqatlardan bəzilərini göstəririk: H.Araslı, Şərqdə "Leyli və Məcnun" əsərləri. "Nizami" məqalələr məcmuəsi, Bakı, 1940, s.194–238; Q.Beqdeli. Şərq ədəbiyyatında "Xosrov və Şirin" mövzusu. Bakı, 1969; А.Н.Тагирджанов. К вопросу о поэме Фирдовси "Юсиф и Зулейха", "Советское востоковедение", V, 1948; Е.Э.Бертельс. Избранные труды. "Низами и Физули", М., 1962; R.Azadə. Azərbaycan epik şerinin inkişaf yolları, XII–XVII əsrlər. Bakı, 1975; Г.Ю.Алиев. Темы и сюжеты Низами в литературах Востока. М., "Наука", 1984.

müvafiq şəkildə əvəzlənməsinə əsaslanır. Uzun və qısa hecalar isə, öz növbəsində, onların yaranmasında iştirak edən saitlərin keyfiyyətcə uzun və qısa olmasını, həmçinin açıq və ya qapalı hecada yerləşməsini nəzərdə tutur. Öz mahiyyəti etibarilə əruz Azərbaycan dilinin quruluşuna, xüsusilə fonetikasına yabançı idi, çünki Azərbaycan dilində saitlər uzunluq və qısalıq baxımından bir-birindən fərqlənmirlər. Buradan da ilk dəfə Azərbaycan dilində əruz vəzni ilə şeir yazmağa başlayan şairlərin bir sıra ciddi maneələr və çətinliklərlə qarşılaşması aydın olur.

Azərbaycan şerində dəqiq qafiyə sisteminin yaranmasında da ərəb-fars şerinin təsiri az olmamışdır. Qədim türk yazılarında, yuxarıda deyildiyi kimi, qafiyəni misralar daxilində eyni samit səslərin təkrarından yaranan alliterasiya, həmçinin sait səslərin təkrarını nəzərdə tutan assonas hadisələri əvəz edirdi. Bununla yanaşı, həmin abidələrdə sətirlərin axırında qafiyə yaratmaq meylləri də get-gedə güclənirdi. Bunu "Kitabi-Dədə Qorqud" dastanında aydın görmək olur. Ancaq dəqiq qafiyə sisteminə əsaslanan ərəb-fars poeziyasının təsiri Azərbaycan şerinin dəqiq qafiyəyə keçməsi prosesini xeyli sürətləndirdi. Əgər əruz vəzni folklor şerimizə çox az sirayət etmişsə, dəqiq qafiyə növlərindən Azərbaycan şifahi xalq şerində də çox geniş, lakin yaradıcı surətdə istifadə olunurdu. Bununla belə, hərfi qafiyə nəzəriyyəsi alliterasiya və assonas kimi poetik formaları nəinki şifahi, hətta yazılı ədəbiyyatımızdan belə tam şəkildə sıxışdırıb çıxara bilmədi. İstedadlı şairlər bu poetik formalardan şerin ahəngini, musiqililiyini və bədii təsir qüvvəsini artırmaq üçün məharətlə istifadə edirdilər. Nəsiminin aşağıdakı beyti buna gözəl misal ola bilər:

Al ilə ala gözlərin aldadı aldı könlümü
Alini gör nə al edər, kimsə alışmaz alinə[1].

Klassik dövr poeziyamızın əsasını şifahi xalq ədəbiyyatında alan məcaz və bədii ifadə vasitələri sistemi də ərəb-fars poetik fiqurları ilə daha da zənginləşdi. Janr baxımından isə türkdilli yazılı ədəbiyyatımız ərəb-fars şerindən məsnəvi, qəsidə, qəzəl, rübai, qitə və s. şeir şəkillərini mənimsəmişdir.

Göründüyü kimi, mürəkkəb ədəbi-estetik bir kompleks təşkil edən türkdilli yazılı ədəbiyyatımızın yaranması müəyyən tarixi inkişaf mərhələsində qarşı-qarşıya dayanan iki şeir sisteminin qarşılıqlı əlaqəsi və uzun müddət davam edən mübarizəsinin nəticəsi kimi meydana gəlmişdir. Bu mübarizədə yerli feodal hakimləri, islam dini və müsəlman mədəniyyəti tərəfindən himayə

[1] Burada "al" sözü beytin əvvəlində və sonunda "hiylə" mənasında işlədilmişdir. İkinci misranın əvvəlindəki "ali" sözünün qədim mənası "aşiq" deməkdir.

olunan ərəb-fars poetikası üstün gəlsə də, bu poetikanın qanun-qaydalarının Azərbaycan şerinə tətbiq olunması heç də asan bir proses olmamışdır. Məsələn, əruz vəznində şeir yazan klassiklərimiz nəinki əruzun Azərbaycan dilinin qanun-qaydalarına daha çox uyğun gələn bəhrlərindən istifadə etmək zərurəti qarşısında qalırdılar, həm də öz şeirlərində tərkibində uzun və qısa saitlər olan çoxlu Azərbaycan şerinin qafiyə imkanlarını genişləndirmək məqsədilə də istifadə olunurdu. Bu baxımdan ilk Azərbaycan yazılı abidələrinin dilinin klassik Azərbaycan poeziyasının ən yüksək zirvəsi olan XVI əsr şerinin dili ilə müqayisəsi çox səciyyəvidir. Əgər Həsənoğlunun

Necəsən, gəl, ey yüzü ağım bənim!
Sən əritdin odlara yağım bənim.

– beytinin leksikasını yalnız doğma Azərbaycan sözləri təşkil edirsə, Füzulinin aşağıdakı misralarında bunun əksini görürük:

Mey nəfyini eyləyib şü'ar, ey vaiz,
Tutdun rəhi-tə'ni-eşqi-yar, ey vaiz!

Göründüyü kimi, burada "tutdun" felindən başqa, beytdə işlədilən leksik vahidlərin hamısı ərəb-fars sözlərindən ibarətdir.

Şerin poetik xüsusiyyətlərinə heç bir xələl gətirmədən ərəb və fars sözlərinin işlənmə dairəsini minimum səviyyəyə endirmək Həsənoğlunun yüksək ustalığının və şairlik məharətinin nəticəsidir. Belə bir çətin vəzifənin öhdəsindən gəlmək hər bir şairə müyəssər olmurdu. Bunu da qeyd etmək lazımdır ki, XIII-XIV əsrlərdə əruz və dəqiq qafiyə sisteminin Azərbaycan dilinin quruluşuna uyğunlaşdırılması prosesi hələlik başa çatdırılmamışdı[1].

Bütün bunların nəticəsidir ki, XIII-XIV əsrlərdə Azərbaycan dilində yazılmış bir sıra əsərlərdə tez-tez vəzn və qafiyə pozğunluqlarına rast gəlinir. Bu haqda "Dastani-Əhməd Hərami" poemasının tədqiqatçıları yazırlar: "Dastani Əhməd Hərami" dil və üslubca əski abidələrlə, daha çox isə "Kitabi-Dədə Qorqud" ilə yaxından səsləşir. Məsnəvi əruzun həzəc bəhrindədir. Şeirlər on bir hecalı (4-4-3) şeri xatırladır. Habelə vəzndən məqsədəuyğun şəkildə istifadə olunmur. Ara-sıra şeirdə vəznə uyaraq hecaların tələffüzünü qısaltma və ya uzatma da vardır. Bu da təsadüfi deyildir. Belə ki, anadilli

[1] Əruz vəzninin türkdilli poeziyada işlənmə xüsusiyyətləri haqqında ətraflı bax: Ahmed Aymutlu Aruz: Türk şiirinde kullanılan aruz vezinleri ve örnekleri. İstanbul, 1962; Əkrəm Cəfər. Əruzun nəzəri əsasları və Azərbaycan əruzu. Bakı, 1977.

poeziyamızın ilk çağlarında əruzla heca arasında kəskin ayrılıqlar görünmürdü. Əruz hələlik türkləşməmiş, milli şeir ölçüsü kimi yer tuta bilməmişdi. Bundan başqa, qafiyələr içərisində də tam qafiyələrlə, yarımqafiyələrlə yanaşı, bəzən də qafiyəsiz misra və qoşa misralarla qarşılaşırıq”[1].

Azərbaycan dilində yazılmış və bizim dövrümüzədək saxlanılmış ilk qəzəllər İzzəddin Həsənoğluya məxsusdur. XIII əsrin ikinci yarısında Əsfəraində yazıb-yaratmış bu görkəmli sənətkarın hələlik üç qəzəli üzə çıxarılmışdır. Onlardan ikisi Azərbaycan dilində, digəri isə farsca yazılmışdır. Şairin Nizami qəzəllərindən birinə nəzirə yazdığı və məzmun dərinliyi, forma kamilliyi ilə seçilən

Apardı könlümü bir xoş qəmərüz canfəza dilbər,
Nə dilbər? Dilbəri-şahid. Nə şahid? Şahidi-sərvər

– mətləli qəzəlində açıq-aşkar iki bədii mənbənin – klassik farsdilli poeziyamızın və türkdilli şifahi xalq yaradıcılığının təsiri hiss olunur. Bununla yanaşı, Həsənoğlu yaradıcılığında az da olsa mistik-panteist əhvali-ruhiyyəsinin də təsiri görünməkdədir:

Əzəldən canım içində yazıldı surəti-mə’ni,
Nə mə’ni? Mə’niyi-surət. Nə surət? Surəti-dəftər.

Şairin mistik-panteist məhəbbət fəlsəfəsində real insani sevgi ilə mücərrəd fəlsəfi sevgi birləşir. Bununla da müəllif real insani məhəbbətə geniş fəlsəfi məna verib, onu ilahi sevgi qədər güclü, pak və uca görmək istəyir.

Həsənoğlunun azərbaycanca yazdığı qəzəlləri bədii xüsusiyyətləri, ahəngdarlığı və səmimiyyəti ilə seçilir.

XIII əsrdə Azərbaycan dilində yaranmış qiymətli abidələrdən biri də “Dastani-Əhməd Hərami” poemasıdır. Bu poema Azərbaycan dilində yazılmış ilk məsnəvidir. Əsərin süjet xətti şər qüvvələrin timsalı olan Əhməd Hərami ilə xeyir qüvvələrin rəmzi kimi təsvir olunan Güləndam arasındakı konflikt üzərində qurulmuşdur. Gizli və açıq mübarizə şəklində davam edən konflikt Güləndamın qələbəsi ilə nəticələnir. Əsərdə zülmə, ədalətsizliyə qarşı dərin bir nifrət, nəcib, layiqli, humanist insanlara qarşı isə yüksək məhəbbət vardır. Poema məzmunu, ideya və dil-üslub xüsusiyyətləri ilə xalq ruhunu ifadə edir, nağıl və dastan ənənələri ilə səsləşir. Bu baxımdan poema müəyyən mənada öz orijinallığı ilə seçilsə də, onun müəllifi surət və xarakter yaratmaq təcrü-

---

[1] Ə. Səfərli, X. Yusifov. Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatı, Bakı, 1982, səh.152.

bəsini böyük Nizamidən öyrənmiş, onun humanist ideyalarından ilham almışdır. Bu, poemada geniş yer verilən qadına müsbət münasibət məsələsində də öz bədii ifadəsini tapmışdır. Poema həmçinin bədii təsvir vasitələrinin təbiiliyi, xəlqiliyi, dilinin sadəliyi və canlılığı ilə fərqlənir.

* * *

XIII əsrin sonlarından ölkədə başlayan nisbi sakitlik Azərbaycan xalqının ictimai-iqtisadi həyatında olduğu kimi, ədəbiyyatında da canlanmaya və onun daha sürətli inkişafına səbəb oldu. XIV əsr Azərbaycan ədəbiyyatı tarixində həyatı daha geniş əks etdirən epik janrın çiçəklənməsi dövrüdür. Bununla yanaşı, mövcud həyatdan narazılıq, məyusluq və ümidsizlik meyllərinin güclənməsi dövrün ədəbiyyatında da öz əksini tapır, bəzi şair və alimlərin sufi-panteist və hürufilik ideyalarına meyl etməsinə səbəb olur. Bəzi sufi ideoloqlar hakim siniflərin və islam dininin tələblərinə uyğunlaşaraq xalqa zidd, mürtəce mövqe tutsalar da, bir çox sufi təriqətləri geniş xalq kütlələrinin mənafeyini müdafiə edir, dolaşıq bir formada onun əhvali-ruhiyyəsini əks etdirir, həmçinin şeri və musiqini yüksək qiymətləndirir, onlardan təbliğat vasitəsi kimi istifadə etməyə çalışırdı. Məhz buna görədir ki, XVI əsr Azərbaycan şairlərinin əksəriyyətinin yaradıcılığında sufi və hürufilik fəlsəfi nəzəriyyələrinin bir çox mütərəqqi cəhətləri və ideyaları öz əksini tapmışdır. Bu dövr ədəbiyyatının ən mühüm xüsusiyyətlərindən və aparıcı istiqamətlərindən biri Nizami məktəbinin qiymətli ənənələrinin – humanizm, insana məhəbbət, cəmiyyətdəki eyiblərin tənqidi və b. motivlərin davam və inkişaf etdirilməsi idi. Lakin şeirdə nəsihətçilik, didaktik-tərbiyəvi motivlər siyasi-ictimai amillərin təsiri ilə fəlsəfi boyalarla tündləşir, sufi-panteistik formalarda təzahür edirdi.

Sufi poeziyanın ən görkəmli nümayəndələrindən biri Şeyx Mahmud Şəbüstəri (1287-1320) idi. Dövrünün təbiət elmlərini və panteist-fəlsəfi cərəyanlarını yaxşı öyrənmiş, bir çox Yaxın Şərq ölkələrinə səyahət etmiş bu mütəfəkkir alim şeirlə yazdığı “Gülşəni-raz” əsərində sadə və aydın bir dillə sufi terminlərinin şərhini vermişdir. Hüseyni Sadatın on beş sualına cavab olaraq yazılmış bu əsərdə müəllif verilmiş sualları dini-idealist baxımdan şərh etməyə çalışsa da, bir sıra dərin elmi mühakimələrə də yer verir, bəzi etik-əxlaqi məsələlərə toxunur. O, insanın böyük, uca, qadir olduğunu söyləyir və göstərir ki, əgər insan ruhən yüksəlmək, kamil olmaq istəyirsə, xudbin, lovğa olmamalı, özünə həqiqət, ədalət, mərdlik kimi insani keyfiyyətlər aşılamalı, elmi biliklərə yiyələnməlidir. Şairlikdən çox sufi alimi kimi tanınan Şeyx Mahmud Şəbüstəri “Gülşəni-raz” məsnəvisində, eləcə də nəsrlə yazdığı bir sıra başqa əsərlərində insana və kainata öz dövrünün qabaqcıl ziyalılarının baxışlarını əks etdirmişdir.

Şeyx Mahmud Şəbüstərinin elmi yolla ifadə etmək istədiyi fikirləri dövrünün ən böyük şairlərindən olan Marağalı Əvhədi (1272–1338) daha canlı və poetik dillə vermişdir. Nizami romantik şerinin ən yaxşı davamçılarından olan Əvhədinin yaradıcılığı çoxcəhətliliyi, mövzu kamilliyi və humanizmi ilə seçilir. O, ədəbiyyatımızı bir çox yeni ideyalar və yüksək sənətkarlıq xüsusiyyətləri ilə zənginləşdirmişdir. Şairin sufi şeri üslubunda yazılmış və panteist məzmun daşıyan əsərləri mövcud quruluşa, onun qanun–qaydalarına qarşı xalq etirazının ifadəsidir. Şair istər lirik şeirlərində, istərsə də iri həcmli "Dəhnamə" və "Cami–Cəm" adlı poemalarında yaşadığı cəmiyyətin həyatını əks etdirməyə çalışmışdır.

Romantik–lirik poema olan "Dəhnamə" əsərində iki gəncin eşq sərgüzəşti, təmiz məhəbbəti təsvir olunur. Şair göstərir ki, insan öz məqsədinə çatmaq üçün tələsməməli, ruhdan düşməməli, uzun müddət əzab–əziyyətlərə dözməlidir. Real insan sevgisini tərənnüm edən bu əsərin yığcam forması, lirik vüsəti və başqa bədii keyfiyyətləri "Dəhnamə" janrının sonrakı əsrlərdə də Şərq poeziyasında davam etdirilməsinə səbəb olmuşdur.

Əvhədi yaradıcılığının zirvəsi olan "Cami–Cəm" poeması isə Nizami humanist fikirləri ilə yaxından səsləşən, Yaxın və Orta Şərq ədəbiyyatında mühüm yer tutan didaktik poema janrını məzmun və formaca xeyli zənginləşdirən bir əsərdir. Müqəddimə və üç fəsildən ibarət olan bu poemada şairin altmış illik həyat təcrübəsinin yekunu – onun elmi, fəlsəfi, dini, etik görüşləri öz əksini tapmışdır. Bunların içərisində şairin pedaqoji görüşləri (insanlar haqqında mülahizələri, uşaqların tərbiyəsi, hakimlərin məzəmməti, şəhərlərin tikintisi və s.) xüsusilə böyük maraq doğurur, çünki bu məsələlərə heç bir şair onun qədər ciddi və dərindən yanaşmamışdır. O, uşaqları cəmiyyət üçün faydalı adamlar kimi tərbiyə etməyi ata–ananın ən başlıca borcu hesab edir.

Gözəllik və ədalətin təntənəsi üçün çirkinliklərin və eybəcərliklərin ifşası bu poemanın əsasını təşkil edir. Şair gah nəsihət vermək, gah da ictimai eyibləri tənqid etmək yolu ilə zülmkar hakimlərə, rüşvətxor məmurlara üz tutaraq, onları ədalətli və insaflı olmağa çağırır.

XIV əsrdə Nizami ədəbi məktəbinin humanizm, dostluq və məhəbbət ideyalarını yeni şəkildə davam və inkişaf etdirən ən görkəmli şairlərdən biri də Şəmsəddin Məhəmməd Əssar Təbrizi (1325–1390) olmuşdur. Gözəl astronom, görkəmli ədəbiyyatşünas və mahir bir şair olan Əssar lirik şeirlərində və bütün Yaxın Şərqdə tanınan "Mehr və Müştəri" poemasında irəli sürdüyü humanist ideyalar və demokratik fikirlər baxımından sələfi Nizamiyə və müasiri Əvhədiyə çox yaxındır.

Mövzusu qədim xalq ədəbiyyatından alınmış "Mehr və Müştəri" poemasında sədaqət və qəhrəmanlıq motivləri, insanın mənəvi gözəlliyi, səmimiyyət və dostluğu, cəsarət və mərdlik kimi keyfiyyətləri öz əksini tapmışdır.

Həmçinin şair qəhrəmanlarını ulduzlarla əlaqələndirməklə sanki insanın əməllərində, arzularında, mənəvi aləmində yerlə göyü birləşdirir.

Əssarın bu poeması həyatiliyi və sənətkarlıq keyfiyyətləri ilə XIV əsr ədəbiyyatımızda əhəmiyyətli hadisədir.

Əgər Marağalı Əvhədi və Əssar Təbrizi öz əsərlərinin fikri-ruhi meylləri ilə Nizami ənənələrini davam etdirirdilərsə, XIV əsrin başqa bir tanınmış şairi Arif Ərdəbili "Fərhadnamə" poemasını bilavasitə Nizaminin "Xosrov və Şirin" əsərinin təsiri ilə yazmışdır. Bununla belə, Arif Ərdəbili "tamamilə orijinal bir əsər meydana çıxarmışdır"[1]. Arifin poemasında Fərhad və Şirin haqqında Azərbaycanda yayılmış şifahi xalq ədəbiyyatı motivləri üstünlük təşkil edir. Şirin və Xosrov surətləri isə burada Nizaminin poemasına nisbətən çox zəif verilmişdir. Arif həyatiliyə, reallığa daha çox meyl edir. Nizamidən fərqli olaraq, o, ciddi ictimai, fəlsəfi ümumiləşdirmələr yolu ilə getmir, əsərindəki surətləri adi insanlar səviyyəsinə endirir. Arif ayrı-ayrı epizodların təsvirində bəzən Nizamini təkrar etsə də, məzmun və süjet istiqaməti baxımından öz dövrünün ədəbi-ictimai həyatı ilə səsləşən yeni bir əsər yaratmışdır.

Poemada insanın nəcib duyğuları, məhəbbəti, əməyi, həyat eşqi realist bir tərzdə təsvir edilmiş, həyat və insanlar hərtərəfli və dolğun əks olunmuşlar.

XIV əsr anadilli poeziyamızda yaranan epik əsərlər arasında Sulu Fəqihin "Yusif və Züleyxa", Yusif Məddahın "Vərqa və Gülşah" poemaları xüsusi yer tutur. "Yusif və Züleyxa" poemasının mövzusu Tövrat və Qurandan alınsa da, əsərdəki bir sıra motivlər xalq ədəbiyyatı və folklorla səsləşir.

Canlı xalq danışıq dilində yazılmış "Vərqa və Gülşah" romantik poemasında iki sevən gəncin nakam məhəbbəti qələmə alınmışdır. Mövzusu şifahi xalq ədəbiyyatından götürülmüş bu əsər də öz süjet xətti və ideyası ilə Nizaminin "Xosrov və Şirin" poeması ilə yaxından səsləşir. Poemada qəhrəmanların təmiz və saf məhəbbəti, arzu və ümidləri, sevinc və kədərləri olduqca həyati və canlı şəkildə verilmişdir. Bəzi səhnələrin təsvirində müəllif Nizaminin "Leyli və Məcnun" poemasından istifadə etmişdir. Yusif Məddah da Nizami kimi qəhrəmanların məhv olmasının səbəbini dövrün feodal-patriarxal qanun-qaydalarında görür və köhnə adət-ənənələrə qarşı öz etirazını bildirirdi.

XIV əsr Azərbaycan poeziyasında lirika janrı da mühüm yer tutur. Bu janrda yaranmış əsərlər də bir tərəfdən XII-XIII əsrlər yazılı ədəbiyyatın, digər tərəfdən isə şifahi xalq yaradıcılığının təsiri altında inkişaf edirdi. Bununla yanaşı, bu dövrdə çox geniş yayılmış sufi-panteist cərəyanlar, xüsusilə hürufilik təriqəti lirik şeirlər yazan şairlərin də elmi-fəlsəfi görüşlərində silinməz izlər buraxmışdır. Ona görə də bu şairlərin fəlsəfi lirikasında feodal

[1] R. A z a d ə . Azərbaycan epik şerinin inkişaf yolları, XII-XVII əsrlər, səh.137.

zülmünə, soyğunçu müharibələrə, ədalətsizliyə, etiraz motivləri öz bədii ifadəsini mistik formada tapır.

Hürufilik təriqətinin əsasını məşhur şair və mütəfəkkir Şah Fəzlullah Nəimi Təbrizi (1339-1396) qoymuşdur. Öz fəlsəfi mahiyyəti etibarilə sufizm ilə üzvi surətdə bağlı olan hürufilik də Allahı ilkin, yaradıcı və mütləq bir qüvvə kimi qəbul edirdi. Bununla belə, hürufilər feodal istismarına, Teymurilər despotizminə qarşı çıxır, həmçinin ədalət, xeyirxahlıq, humanist ideyaları təbliğ etməyə, cəmiyyətdəki nöqsanları əxlaqi-mənəvi təkamül yolu ilə aradan qaldırmağa çalışırdılar. Nəimi hürufilik haqqındakı təlimini "Cavidannamə" əsərində şərh etmişdir. Burada o "öz varlığını və ümumiyyətlə, kamil insanı müqəddəsləşdirir, özünü mal-dövlət əndişəsi ilə məşğul olan zülmkarlara, qaniçən hökmdarlara yaltaqcasına xidmət edən riyakar və fitnəkar şəriət xadimlərinə qarşı qoyur. Məhz buna görə də hakim ruhani-feodal zümrələr Fəzlullahı və onun ardınca gedən hürufiləri kafir, din düşməni elan etdilər"[1].

Nəiminin qəzəl, tərcibənd, qitə və rübailərindən ibarət olan divanında sufizm ideyalarının təsiri, "ilahi məhəbbətin" tərənnümü əsas yer tutur. Onun, eləcə də başqa sufi şairlərin dilində "aşiq", "məşuq", "hüsn", "yar" kimi sözlər məcazi mənada – "hüsni-mütləq", "ruhi-mütləq" mənalarında işlənir.

Beləliklə, dini-mistik təmayüllərinə baxmayaraq, bu dövrdə hürufilik yadelli işğalının və feodal zülmünün güclü etirazına, insanı müdafiə edib Allahla eyniləşdirməyin əsas boyasına, təzahür formasına çevrilir.

Lirik janrda yazan sufi şairlər sırasında XIII əsrin axırı, XIV əsrin əvvəllərində yaşayan Nəcməddin Əbubəkr Zərkub Təbrizini və onun müasiri Hümam Təbrizini də göstərmək lazımdır. Əgər birinci şairin yaradıcılığının ideya mənbəyi Nizami lirikası ilə bağlı idisə, ikincisi böyük məharətlə Sədi qəzəllərini təqlid edirdi.

Farsca yazan şairlər arasında epik şeirdə olduğu kimi, lirika janrında da Marağalı Əvhədinin əsərləri öz xəlqiliyi və humanist ideyaları ilə seçilirdi. Onun qəzəl, qəsidə, rübai və tərcibəndlərdən ibarət olan lirik şeirlər divanında ictimai-fəlsəfi, əxlaqi fikirlər əsas yer tutur. Bu şeirlərdə dövrün ağrılarından, hakimlərin ədalətsizliyindən doğan dərin ictimai kədər, insanları gözəlliyə və səadətə çağırış sədaları hiss olunur, dünyəvi məhəbbət insanı həyata bağlayan nəcib bir hiss kimi təsvir edilir.

Əvhədi Yaxın Şərq ədəbiyyatında qəzəl janrının ən böyük ustalarından biri kimi tanınmışdır. Görkəmli İran şairi və filoloqu Məlik üş-şüəra Baharın fikrincə, bu janrda o, məşhur Hafiz Şirazidən belə geri qalmamışdır[2].

---

[1] Azərbaycan ədəbiyyatı tarixi, I c., Bakı, 1960, səh.217.

[2] История персидской и таджикской литературы. Под ред. Яна Рипка. М., 1970, səh.245.

XIV əsr Azərbaycan poeziyasında ikidillilik – yəni həm fars, həm də Azərbaycan dillərində şeir yazmaq ənənəsi də davam edir. Görkəmli şair və sufi filosof Şah Qasım Ənvar (1356-1434) bir sıra qəzəllərini həm Azərbaycan, həm də fars dillərindən istifadə etməklə yazaraq, sanki bu ədəbi hadisənin simvolik formasını yaratmaq istəmişdir. Ənvarın istər divanında toplanan fars və Azərbaycan dilində yazdığı şeirlər, istərsə də “Ənis-ül-arifin” əsəri mahiyyət etibarilə sırf ürfani-fəlsəfi məzmun daşıyır. Dövrünün sultanlarından qorxmayan şair öz şeirlərində, həmçinin sufi təlimində insanları qardaşlığa və bərabərliyə çağırırdı. Əbdürrəhman Caminin yazdığına görə, Şah Qasım Ənvarın müridləri xurafat və ehkamlara etinasız yanaşır və bərabərləşdirici cəmiyyət ideyaları yayırdılar[1].

XIV əsrdə doğma ana dilində yazıb-yaradan şairlər içərisində görkəmli ədib və dövlət xadimi Qazi Bürhanəddinin əsərləri xüsusi yer tutur.

Qazi Bürhanəddinin əsərləri həm insanpərvərliyi, nikbinliyi, mənəvi əxlaqi keyfiyyətləri, həm də forma, bədii dil baxımından orta əsrlərin sxolastik şeir normalarına zidd idi. Onun ruhoxşayan cazibədar şeirlərində xalq yaradıcılığına məxsus bir gözəllik, səmimiyyət və təravət vardır. Şairin lirik qəhrəmanı öz mənəviyyatı, etibarı, sədaqəti, həyatı, gözəlliyi duyması, mənliyini, vüqarını yüksək tutması ilə seçilir. Ərəb və fars dillərində də şeirlər yazan, Şərq poetikasının qanun-qaydalarına dərindən yiyələnən Qazi Bürhanəddin ədəbiyyatımızı tuyuq janrı ilə zənginləşdirmişdir. Öz mənşəyini qədim türk folklorundan alan tuyuq forma baxımından bayatı və rübaini xatırladır və onlar kimi a-a-b-a sistemi ilə qafiyələnir. Lakin axırıncı iki şeir formasından fərqli olaraq, tuyuq əruzun rəməl bəhrinin –∪––|–∪––|––∪– sxemi ilə yazılır. Həm də tuyuqun qafiyəsi çox vaxt cinas sözlərdən düzəlir. Türkdilli xalqların yazılı ədəbiyyatına tuyuq janrını ilk dəfə Qazi Bürhanəddin gətirmişdir[2]. Sonralar Nəsimi, Lütfi, Nəvai, Babur və başqa şairlər də tuyuq janrında şeirlər yazmışlar. Tuyuq formasında şeir yazmaq çətin olsa da, bu janr geniş xalq kütlələrinin asan başa düşdüyü və çox sevdiyi bir şeir növü olmuşdur. Qazi Bürhanəddinin başqa şeirləri kimi, tuyuqları da bədii-poetik məziyyətləri, ruhu, məzmunu etibarilə şifahi ədəbiyyat ənənələri ilə səsləşir:

Həmişə aşiq könlü büryan bolur,
Hər nəfəs qərib gözü giryan bolur.
Sufilərin diləgi mehrab, namaz,
Ər kişinin arzusu meydan bolur.

---

[1] История персидской и таджикской литературы, səh.271.
[2] Е.Э.Бертельс. Избранные труды. “Навои и Джами”, М., 1965, səh.57.

Sonrakı dövr türkdilli şerimizin güclənməsində, onun xəlqilik və dünyəvi ideyalarla zənginləşməsində Qazi Bürhanəddin yaradıcılığının müsbət rolu olmuşdur.

Anadilli yazılı ədəbiyyatımızın həqiqi banisi, onu Yaxın Şərqin ənənəvi ədəbi dilləri səviyyəsinə yüksəldən isə İmadəddin Nəsimi (1369-1417) olmuşdur. Bu ölməz sənətkarın ədəbi fəaliyyəti haqqında "Azərbaycan klassik ədəbiyyatı kitabxanası"nın müvafiq cildində ətraflı məlumat veriləcəkdir. Burada isə biz yalnız bunu deməklə kifayətlənirik ki, Nəsiminin yaradıcılığı ona qədər əsasən fars dilində inkişaf edən klassik ədəbiyyatımızın doğma Azərbaycan dilinə keçməsi prosesində dönüş nöqtəsi oldu. Nəsimidən sonra gələn Azərbaycan şairlərinin əksəriyyəti bu böyük sənətkarın zəngin təcrübəsinə arxalanaraq öz ana dilində yüksək sənət əsərləri yaratmağa başladılar.

* * *

XIV əsrin sonlarında Azərbaycan yeni bir dəhşətli istilaya – Teymurləng istilasına məruz qalır. Ancaq 1405-ci ildə, bu amansız fatehin ölümündən sonra, onun sağ qalan iki oğlu və on yeddi nəvəsi arasında hakimiyyət uğrunda gedən daxili müharibələr Azərbaycan feodallarına ölkənin istiqlaliyyətini bərpa edib, öz müstəqil hakimiyyətlərini yaratmağa imkan verdi. Azərbaycanın şimalında müstəqil Şirvanşahlar, cənubunda Qaraqoyunlular, daha sonra isə (1467-ci ildən) Ağqoyunlular dövlətləri yarandı. Yaranmış vəziyyət ölkənin iqtisadi cəhətdən bir qədər dinc inkişafına, təsərrüfatın bərpasına, elmin və mədəniyyətin yüksəlməsinə kömək etdi. İncəsənətin müxtəlif sahələrində, xüsusilə rəssamlıq və memarlıqda müəyyən nailiyyətlər qazanılır. Böyük şəhərlərdə elmin müxtəlif sahələrində fəaliyyət göstərən yeni ziyalılar nəsli yetişir.

XV əsr Azərbaycan ədəbiyyatı tarixində türkdilli poeziyanın daha da inkişafı və çiçəklənməsi dövrüdür. Yerli Azərbaycan feodal dövlətlərinin yaranması, bu dövlətlərin Azərbaycan dilinə əhəmiyyət verməsi ədəbiyyatda da öz əksini tapır. Poeziyada Şərq şerinin bütün növlərini əhatə edən bir çox lirik və epik əsərlər meydana çıxır. Məhz bu dövrdən etibarən Azərbaycan ədəbiyyatında məhəbbət lirikası üstünlük təşkil etməyə başlayır. Hamidi, Həqiqi, Xəlili, Bəsiri, Kişvəri, Hidayət kimi şairlər qəzəl janrında böyük şöhrət tapırlar. Şirvanşahlar sarayında yaşayan və fars dilində yazan Bədr Şirvani və bəzi başqa şairlər öz şeirlərində feodal hakimlərinin tərifinə geniş yer versələr də, XV əsr şairlərinin çoxu əsərlərində şəhər sənətkarlarının və əhalinin başqa yoxsul təbəqələrinin görüşlərini, arzu və istəklərini ifadə edir, hakim sinifləri, riyakar zahid və vaizləri, ümumiyyətlə, ruhaniləri tənqid edirdilər. Belə fikirlərini onlar qısa və ötəri şəkildə məhəbbət mövzusunda yazdıqları şeirlərdə ifadə edirdilər. Məhəbbətdə bərabərlik fikrini irəli sürən,

real insani sevgini, dostluq və sədaqəti tərənnüm edən bu şairlər məhəbbətə fəlsəfi məna verərək, dünyanın, həyat və təbiətin sirlərini eşq, sevgi ilə izah etməyə çalışırdılar.

Məhəbbət məfhumundan hakim təbəqələrin mənafeyini müdafiə edən və feodal-ruhani görüşlü şairlər də geniş istifadə edirdilər. Lakin onlar bəşəri məhəbbəti ilahi məhəbbətlə, daha sonralar isə "dinə və din xadimlərinə olan məhəbbətlə" əvəz edirdilər[1].

Əsrin birinci yarısında lirik janrda yazıb-yaradan şairlərdən Cahanşah Həqiqinin, ikinci yarısında yaşayan şairlərdən isə Kişvərinin yaradıcılığı diqqəti daha çox cəlb edir.

Qaraqoyunlular dövlətinin banisi Qara Yusifin oğlu Mirzə Cahanşah Həqiqi (1397-1467) bacarıqlı bir dövlət xadimi olduğu kimi, istedadlı şair kimi də şöhrət qazanmışdır. Onun divanı Azərbaycan və fars dillərində yazdığı qəzəl və rübailərdən ibarətdir. Şeirlərindən görünür ki, şairin dünyagörüşünün və sənətkarlıq xüsusiyyətlərinin formalaşmasında Nəsimi şerinin böyük təsiri olmuşdur. O, qəzəllərində Fəzlullah Nəiminin də adını hörmətlə çəkir, özünü onun müridi hesab edir.

Həqiqi qəzəllərində "insani eşq, gözəlliyə pərəstiş, həyata bağlılıq, sədaqət humanizm və sair bu kimi ümumbəşəri hisslər öz əksini tapmışdır"[2].

Əsrin ən görkəmli şairi isə ədəbi irsi lazımınca öyrənilməyən Kişvəri olmuşdur.

Kişvəri şeirlərində güclü azadlıq meylləri və həyat eşqi duyulur. O, insanları ömrü mənalı keçirməyə, həyatın gözəlliklərindən zövq almağa çağırır. Sadə xalq danışıq dilindən bacarıqla istifadə edərək yazdığı qəzəllərdə şair real, həyati məhəbbəti tərənnüm edir. Heç bir dini təriqətə qoşulmayan sənətkarın şeirlərində bədii, fəlsəfi ümumiləşdirmələrlə yanaşı həyatilik, gerçəkliyə bağlılıq var. Bəzən isə şair həyatdan, dövrün ədalətsizliklərindən şikayətlənir:

Məni ta ruzgari-səngdil ayırdı yarımdan,
Nə gördüm ruzi-xoş hərgiz, nə xoşluq ruzigarımdan.

Kişvəri şeirlərində məşhur özbək şairi Əlişir Nəvainin təsiri duyulmaqdadır. Bu isə onun nəinki özünə qədərki anadilli poeziyadan, həm də ümumi türkdilli ədəbiyyatın ən mütərəqqi və böyük şairlərindən də bəhrələnməsinin sübutudur.

Bu dövrdə epik əsərlər yaratmaq ənənəsi də davam edir. Nizami "Xəmsə"sinin təsiri ilə fars dilində yazılan poemalarla (Əşrəfin "Xəmsə", Salim

---

[1] H. Araslı. Böyük Azərbaycan şairi Füzuli. Bakı, 1958, səh.44.

[2] L. Hüseynzadə. Mirzə Cahanşah Həqiqi. "Şeirlər", səh.10.

Təbrizinin "Leyli və Məcnun" əsərləri) yanaşı, Azərbaycan dilində də bir neçə epik əsərlər yaranır. Azərbaycan şairləri Şərqdə geniş yayılmış "Yusif və Züleyxa" mövzusuna daha çox müraciət edirlər. Bu mövzuda yazan şairlərdən Xətayi Təbrizi, Şəms, Xəlifə Təbrizi və Salim Təbrizini göstərmək olar. Bunların arasında öz ideyası və xarakterləri ilə Şəmsin "Yusif və Züleyxa" poeması xüsusi yer tutur. Burada müəllif ata və oğul məhəbbəti, aşiq sevgisinin qüdrəti, saf əxlaq kimi bir sıra həyati məsələlərdən bəhs edir, yaratdığı bir silsilə dolğun insan obrazlarının köməyi ilə bu məsələlərin həllinə çalışır. Əsərdə paxıllıq, tamahkarlıq, böhtan kimi mənfi keyfiyyətlərin tənqidinə də xüsusi fikir verilir.

Bütün bu deyilənlər göstərir ki, XV əsrdə Azərbaycan poeziyası keyfiyyət etibarilə yeni bir pilləyə qalxır, həm lirika, həm epik şeir sahəsində bir sıra gözəl sənət nümunələri yaranır. Bununla yanaşı, ölkənin daxilində hakimiyyət uğrunda gedən mübarizələr və başqa hadisələr poeziyanın inkişafına mənfi təsir göstərir, onun vüsətini məhdudlaşdırırdı.

* * *

XV əsrin ikinci yarısında Azərbaycanda feodal dövlətlərinin zəifləməsi, feodal pərakəndəliyinin və ara müharibələrinin güclənməsi müşahidə olunur. Xalq kütlələrinin antifeodal hərəkatı genişlənməkdə idi. Bu hərəkat obyektiv olaraq əhalinin daxili müharibələrdə və feodalların özbaşınalığına son qoymaq, mərkəzləşmiş qüvvətli dövlət yaratmaq tələbatını əks etdirirdi[1].

XVI əsrin əvvəllərində ölkədə vahid Azərbaycan dövləti qurmaq üçün əlverişli şərait yaranmışdı. Bu şəraitdən bacarıqla istifadə edən Səfəvilər sülaləsi XVI əsrin əvvəllərindən hakimiyyəti öz əllərinə alıb, qüdrətli vahid Azərbaycan dövləti yaratmağa müvəffəq oldular.

Mərkəzləşmiş Azərbaycan dövlətinin yaranması ölkənin siyasi, iqtisadi vəziyyətində olduğu kimi, mədəni həyatında da yüksəlişə səbəb oldu. Elmin müxtəlif sahələrinə aid yeni əsərlər yaranır. Marağa rəsədxanası bərpa olunur. İncəsənətin inkişafında daha böyük nailiyyətlər qazanılır. "Şərqin Rəfaeli" kimi şöhrət tapmış Kəmaləddin Behzad (1455–1535) və dövrün digər görkəmli sənətkarlarından dərs alan bir dəstə istedadlı azərbaycanlı rəssam XVI əsrin ortalarında Təbrizdə orijinal və yüksək yaradıcılıq xüsusiyyətlərinə malik olan rəssamlıq məktəbi yaradır. Dövrün mühüm hadisələrini əks etdirən çoxlu tarix və təzkirə kitabları yazılır. Dövrün alim və sənətkarlarının yaradıcılığı əhatə dairəsinin genişliyi və rəngarəngliyi ilə seçilir.

XVI əsr Azərbaycan poeziyası bundan qabaqkı əsr şerinin mütərəqqi ənənə və meyllərinin bilavasitə davamı və daha yüksək mərhələsi kimi mey-

---

[1] Azərbaycan tarixi, I c., Bakı, 1961, səh.242.

dana çıxır. Sənətkarlığın, xüsusilə şeir texnikasının son dərəcə güclənməsi, zəngin, çoxcəhətli obrazların yaranması, fəlsəfi fikrin, dünyəvi ideyaların və ictimai motivlərin daha da inkişafı bu dövr poeziyasının başlıca cəhətləridir. Səfəvilər dövlətinin Azərbaycan dilindən dövlət dili kimi istifadə etməsi, xüsusilə bu dövlətin banisi Şah İsmayılın öz ana dilində gözəl şeirlər yazması poeziya sahəsində də Azərbaycan dilinin hakim mövqe tutmasını təmin edir. Burada görkəmli şərqşünas İ.S.Braginskinin aşağıdakı fikrini də göstərmək sözsüz yerinə düşərdi: "Bizə belə gəlir ki, ərəb, fars və türk ədəbiyyatları əlaqələri sayəsində VII əsrdən XVI əsrədək ədəbi hegemonluğun özünəməxsus bir şəkildə ərəbdilli ədəbiyyatdan (VII-IX əsrlər) farsdilli (X-XIV əsrlər), sonra isə türkdilli (XV əsrdən etibarən: Nəvai, sonra Füzuli və b.) ədəbiyyata keçməsi baş vermişdir"[1].

Yeri gəlmişkən bunu da qeyd etmək lazımdır ki, bəzi tədqiqatlarda XVI əsr Azərbaycan poeziyasının təqlidi xarakter daşıması haqqında rast gələn fikirlər düzgün deyil. Azərbaycan şairləri farsdilli klassik ədəbiyyatın təcrübəsindən yaradıcı surətdə istifadə edərək, onu milli xalq ədəbiyyatından gələn ideya, süjet və poetik ünsürlərlə zənginləşdirir, orijinal sənət əsərləri yaradırdılar. Xəzaninin aşıq qoşmalarını xatırladan və heca vəznində yaratdığı şeir parçaları, Şah İsmayılın məhəbbət mövzusunda yazdığı əsərləri buna gözəl misal ola bilər. Həmçinin Füzulinin nəinki Azərbaycan bədii fikir tarixinə, eləcə də türkdilli xalqların ədəbiyyatına bir çox yeni və gözəl keyfiyyətlər gətirməsi məlumdur[2].

XVI əsrdən başlayaraq klassik Azərbaycan ədəbiyyatında eyni zamanda həm Azərbaycan, həm də fars dilində (bəzən də həmçinin ərəb dilində) şeir yazmaq halı bir növ ədəbi normaya çevrilir. Bununla belə, bu dövrdə yazan şairlərin demək olar ki, hamısının yaradıcılığında ana dili üstünlük təşkil edir. Bu, hər şeydən əvvəl, Azərbaycan poeziyasında şeir texnikasının, poetika qanun-qaydalarının cilalanması və yüksək bir səviyyəyə çatmasının nəticəsi idi. Azərbaycanlı şairlərin eyni zamanda fars dilində də şeirlər yazmasının səbəbini isə bu halın artıq ənənə şəkli alması və XI-XIV əsrlər güclü farsdilli poeziyasının onlara təsiri ilə izah etmək lazımdır.

Əsrin ədəbiyyatının səciyyəvi xüsusiyyətlərindən biri də şerə, sənətə olan marağın olduqca artması, poeziyanın təsir dairəsinin genişlənməsi idi. Hətta əmirlər, xırda şəhər sənətkarları, məmurlar və ruhanilər belə şeir yazmağa cəhd edir, ədəbiyyatla maraqlanırdılar. Aydındır ki, bunların heç də hamısı peşəkar şair olmayıb, əslində şeir həvəskarları idilər. Ancaq onların arasından görkəmli sənətkarlar da çıxırdı.

---

[1] И.С.Брагинский. О проблеме периодизации истории персидской и таджикской литератур. "XXV Международный конгресс востоковедов. Доклады делегации СССР", М., 1960, səh.7.

[2] M.Quluzadə. Füzulinin lirikası. Bakı, 1965, səh.206-207.

Səfəvi hökmdarlarının şiə məzhəbini təbliğ etməsi ilə əlaqədar olaraq dövrün poeziyasında bəzən dini motivlər, sufi-şiə, həmçinin hürufilik ideyaları da öz əksini tapırdı. Ancaq istedadlı şairlər bu maneələri aradan qaldıraraq, müəyyən dərəcədə mistik formada olsa da dünyəvi hissləri, mənəvi-ruhani keyfiyyətləri tərənnüm edirdilər. Mütərəqqi şairlərin yaradıcılığında məhəbbət lirikası və fəlsəfi şeir aparıcı rol oynayırdı. Həbibi, Süruri, Tüfeyli, Həqiri, Gülşəni, Xəlili, Şahi, Fəzli, Xəzani, Rəhməti kimi şairləri xalqın arzu və əməllərinə rəğbət, feodal-saray ədəbiyyatının təmtəraqlı mədhiyyəçilik üslubundan qaçmaq, ehkampərəstliyə etiraz səsi, xalq ədəbiyyatına yaxınlıq kimi ümumi keyfiyyətlər birləşdirirdi. Öz ana dilində yazan bu və bir çox başqa sənətkarlar ərəb və fars dilində yaranmış lirika səviyyəsində dayanan divanlar yaradır, azad fikirlilik, mənəvi ideyaları təbliğ edirdilər.

XVI əsrdə Azərbaycan xalqının başqa türk xalqları ilə ədəbi əlaqələri də xeyli genişlənir. Hələ XV əsrin ikinci yarısında özbək intibah mədəniyyətinin qüvvətli təzahürü və Nəvai ədəbi məktəbinin geniş şöhrət tapdığı zamanda Herata gələn azərbaycanlı şairlər Səfəvilər dövründə vətənə qayıtdıqdan sonra öz əsərlərində özbək mədəniyyətinin nailiyyətlərindən, Nəvai irsindən bacarıqla istifadə edirdilər. Belə şairlərdən Ziyayi, Xülqi, Allahi, Bəsirini göstərmək olar.

XVI əsrdə Süruri, Bidari, Səhabi, Pənahi, Xəlifə, Xəzani, Hafiz, Mir Qədri, Həsini, Qasimi, Gülşəni, Arifi, Matəmi kimi şairlər isə müxtəlif səbəblər üzündən Türkiyəyə köçməli və yaradıcılığının müəyyən bir hissəsini orada davam etdirməli olmuşlar. Bu şairlərdən çoxu hələ öz sağlığında böyük hörmət qazanmış və Türkiyə ədəbiyyatına, sənətinə təsir etmişlər[1].

Dövrün ən görkəmli nümayəndələrindən biri – qəzəlləri uzun müddət Yaxın Şərq şairləri üçün nümunə olan, XV əsrin sonu XVI əsrin əvvəllərində yazıb-yaratmış Həbibi idi. Şairin əldə olan qəzəlləri içərisində dostluq və gözəlliyin tərənnümünə və aşiqanə duyğuların ifadəsinə həsr edilmiş şeirlər üstünlük təşkil edir. Füzuli kimi böyük bir şairin onun:

> Gər səninçün qılmayam çak, ey büti-nazikbədən,
> Gorum olsun bu qaba əynimdə pirahən-kəfən

– misraları ilə başlayan qəzəlinə nəzirə yazması Həbibinin orijinal poetik üslubunun, dərin həyati duyğularının və obrazlı ifadələrinin sonrakı dövr poeziyamıza təsir göstərməsinin aydın sübutudur.

Əsrin birinci rübündə yazıb-yaratmış ən görkəmli sənətkarlardan biri də Şah İsmayıl Xətayi idi. Xətayinin yaradıcılığında dini-siyasi motivlərə tez-

---

[1] Azərbaycan ədəbiyyatı tarixi, I c., Bakı, 1960, səh.300.

tez rast gəlinsə də, şairin belə əsərlərində mübariz bir ruh, əzəmət, qürur hissi vardır. Məhəbbət mövzusunda yazdığı qəzəllər şifahi xalq şerindən, həyatdan gələn meyllərin təsiri ilə yeni məzmun, yeni xüsusiyyət kəsb edir, sadəliyi və oynaqlığı ilə seçilir. Şair xalq şerinə rəğbətlə yanaşaraq qoşma, gəraylı, bayatı janrlarında da gözəl şeirlər yazmışdır.

Xətayinin yaradıcılığında epik əsərlər – "Nəsihətnamə" məsnəvisi və "Dəhnamə" poeması da mühüm yer tutur. Didaktik mahiyyət daşıyan bu əsərlərdə şair şiə görüşlərinin təbliği ilə yanaşı, oxucularına sədaqət, mübarizlik, iradəlik kimi keyfiyyətlər aşılamaq istəmişdir. Ədəbi irsinin mühüm bir hissəsini xalq ədəbiyyatı ənənələri əsasında – heca vəznində, xalq şeri formasında yazan Xətayi şəxsiyyəti və yaradıcılığı ilə özündən sonrakı Azərbaycan mədəniyyəti üzərində dərin izlər buraxmışdır.

Ənənəvi mövzuda yazılmış, lakin həmin mövzuya müəyyən fikri və üslubi yeniliklər gətirmiş epik əsərlər sırasında Həqirinin və Zəmirinin "Leyli və Məcnun" poemalarını qeyd etmək lazımdır. Həqirinin əsəri Azərbaycan dilində "Leyli və Məcnun" mövzusunda yazılmış ilk poemadır. Poema Nizaminin, Əmir Xosrov Dəhləvinin, Hatifinin eyni adlı əsərlərinin təsiri altında nəzmə çəkilsə də, "qayəsi, ideya istiqaməti, obrazlarının özünəməxsus səciyyəsi, ruhu, nəhayət, dili və üslubu etibarilə orijinal sayıla bilər"[1].

Hələ XIII əsrdən başlayaraq inkişaf etməkdə olan türkdilli Azərabyacan poeziyası ictimai-fəlsəfi məzmun, bədii dil və poetik üslub cəhətindən XVI əsrdə Füzuli (1494-1556) qələminin qüdrəti ilə özünün ən yüksək kamillik dərəcəsinə çatır. Azərbaycan, ərəb və fars dillərində klassik poeziyanın bütün forma və janrlarında ölməz əsərlər yaradan bu böyük şair öz dövrünün məsələlərinə demokratik mövqedən yanaşmış, yaradıcılığının sinfi və tarixi məhdudluğuna baxmayaraq, bütün Yaxın Şərq ədəbiyyatının XVI əsrdə dünya mədəniyyəti xəzinəsinə daxil olan ən mütərəqqi əsərlərini yaratmışdır. Azərbaycan ədəbi dilinin qəti şəkildə formalaşması bu böyük dahinin çoxcəhətli ədəbi fəaliyyətinin nəticəsi olduğu kimi, sonrakı əsrlər klassik ədəbiyyatımızın inkişafı da onun adı ilə bağlıdır.

* * *

Bütün bu yuxarıda deyilənlər aydın göstərir ki, XIII-XVI əsrlər Azərbaycan poeziyası özünəməxsus spesifik, mürəkkəb bir inkişaf yolu keçərək yüksək təkamül nöqtəsinə çatmışdır. Əgər farsdilli poeziyamız hələ XII əsrdə Nizami dühası ilə öz yüksək inkişaf zirvəsinə çatmışdırsa, anadilli şerimiz həmin səviyyəyə XVI əsrdə Füzuli sənətinin qudrəti ilə yüksəlmişdir. XIII-XV

[1] R. A z a d ə. Göstərilən əsəri, səh.183.

əsrlər Azərbaycan şeri özünəməxsus bütün xüsusiyyətlərinə baxmayaraq, əsasən klassik farsdilli poeziyanın təcrübəsini mənimsədiyi halda, XVI əsrdən etibarən bu ədəbiyyat öz milli çərçivəsindən kənara çıxmağa və artıq Yaxın Şərq xalqlarının şeir sənətinə təsir göstərməyə başlayır. Əgər bu ədəbiyyat öz genetik kökləri ilə qədim türk xalqlarının şifahi xalq yaradıcılığı ilə, rabitə əlaqəsi ilə isə Yaxın Şərq xalqları ədəbiyyatı ilə bağlı idisə, tipoloji baxımdan İntibah mədəniyyətinə uyğun gəlirdi. Axırıncı əlaqə forması klassik dövr poeziyamızın mahiyyətini və məfkurə istiqamətini müəyyənləşdirmək cəhətindən başlıca şərtdir. Bu ədəbiyyat orta əsrlər şəraitində yaranıb inkişaf edən, lakin öz mahiyyətilə feodalizm cəmiyyətinin ruhuna zidd olan, xalqın arzu və azadlığını, insani ləyaqətini yüksəklərə qaldıran humanist poeziya idi. Həsənoğlu, Qazi Bürhanəddin, Nəsimi, Kişvəri, Füzuli kimi öz dövrünün ən mütərəqqi və savadlı ziyalıları real həyatın gözəlliklərini, bəşəri məhəbbəti, azad fikirliliyi, dostluq və sədaqəti tərənnüm edirdilər. Məhz bu xüsusiyyətlərinə görədir ki, orta əsrlər Azərbaycan poeziyası bu gün belə öz ecazkar təsir qüvvəsini, gözəllik və təravətini itirməmişdir.

***Cahangir Qəhrəmanov***
***Kamil Allahyarov***
1984

# İZZƏDDİN HƏSƏNOĞLU

*XIII əsr Azərbaycan ədəbiyyatının görkəmli nümayəndələrindən biri olan İzzəddin Həsənoğlunun yaradıcılığı ədəbiyyat tariximizdə doğma Azərbaycan dilində yaranan poeziyanın ilk nümunələri kimi çox qiymətlidir. Şair Azərbaycan dilində yazdığı şeirlərdə Həsənoğlu, farsca yazdığı şeirlərdə isə Puri-Həsən təxəllüsünü işlətmişdir.*

*Təzkirə kitablarında Həsənoğlunun həyatı haqqında verilən məlumatlar olduqca az və səthidir. Dövlətşahın yazdığına görə, o, Xorasanda yerləşən Əsfərain şəhərində doğulmuşdur. Orta əsrlərdə Şərqdə geniş yayılmış təsəvvüf təriqətinə qoşulmuş və Şeyx Camal Əhməd Zakirin müridi olmuşdur.*

*Şairin "Divan"ı da bizim zəmanəmizədək gəlib çatmamışdır. Hazırda Həsənoğlunun elmə məlum olan üç qəzəlindən ikisi Azərbaycan, biri isə fars dilində yazılmışdır. Bu şeirlər onun iki dildə yüksək sənət əsərləri yaratmağa qadir mahir bir şair olduğunu göstərir.*

Ayırdı könlümü bir xoş qəmər yüz, canfəza dilbər,
Nə dilbər? Dilbəri-şahid. Nə şahid? Şahidi-sərvər.

Mən ölsəm sən büti-şəngül sürahi, eyləmə, qül-qül,
Nə qül-qül? Qül-qüli-badə. Nə badə? Badeyi-əhmər.

Başımdan getmədi hərgiz səninlə içdiyim badə,
Nə badə? Badeyi-məsti. Nə məsti? Məstiyi-sağər.

Şəha, şirin sözün qılır Misrdə bir zaman kasid,
Nə kasid? Kasidi-qiymət. Nə qiymət? Qiyməti-şəkkər.

Tutuşmayınca dər atəş bulunmaz xisləti-ənbər.
Nə ənbər? Ənbəri-suziş. Nə suziş? Suzişi-məcmər.

Əzəldən cam içində yazıldı surəti-mə'ni.
Nə mə'ni? Mə'niyi-surət. Nə surət? Surəti-dəftər.

Həsənoğlu sənə gərçi duaçıdır, vəli sadiq,
Nə sadiq? Sadiqi-bəndə. Nə bəndə? Bəndeyi-çakər.

* * *

Necəsən, gəl, ey yüzü ağım bənim?
Sən əritdin odlara yağım bənim,
And içərəm səndən artıq sevməyim,
Sənin ilə xoş keçər canım bənim,
Hüsn içində sana manənd olmaya,
Əsli yuca, könlü alçağım bənim.
Al əlimi irəyim məqsudimə,
Qoyma yürəkdə yana dağım bənim
. . . . . . . . . . . . . . . . . . . .
. . . . . . . . . . . . . . . . . . . .
Sən rəqibə sirrini faş eylədin,
Anun ilə oldu şımtağım bənim.
Qışladım qapında itlərin ilə,
Oldu kuyin üşdə yaylağım bənim.
Bən ölücək yoluna gömün bəni,
Baqa dursun yarə toprağım bənim.
Toprağımda bitə həsrətlə ağac,
Qıla zari cümlə yaprağım bənim.
Bu Həsənoğlu sənin bəndən dürür
Anı rədd etmə, yüzü ağım bənim.

# QAZİ BÜRHANƏDDİN

*Görkəmli Azərbaycan şairi və dövlət xadimi Qazi Bürhanəddin (1344–1398) Qeysəriyyədə doğulmuşdur. Onun əsl adı Əhməddir. Oğuzların Sülar boyuna mənsub olan Qaxi Bürhanəddinin ata-babası nəsillikcə zəmanəsinin siyasi xadimləri kimi tanınmışlar.*

*İlk təhsilini atasından alan Əhməd 14 yaşında ikən Mirə getmiş, beş ilə yaxın orada fiqh, fəraiz, hədis, təfsir, heyət, tibb, həndəsə, nücum elmlərini mükəmməl öyrənmişdir. Sonra təhsilini Şamda və Hələbdə davam etdirmişdir. 20 yaşında Qeysəriyyəyə qayıdan Qazi Bürhanəddin dövlətin siyasi həyatında fəal iştirak edir, daha sonra isə hakimiyyət başına keçərək, dövləti bilavasitə idarə etməyə başlayır. Qorxmaz, uzaqgörən, siyasətcil bir hakim və elmi, sənəti sevən bir şair kimi şöhrət tapan Qazi Bürhanəddin 1398-ci ildə Ağqoyunlu nəslindən olan Qara Yolüq Osman bəy tərəfindən öldürülmüşdür.*

*Qazi Bürhanəddinin yaradıcılığı Azərbaycan dilində yazdığı "Divan"ından, ərəb və fars dillərində yazdığı şeirlərdən, "İksirüs-səadət fi əsrarül-ibadət" və "Tərcihüt tövzih" adlı elmi əsərlərindən ibarətdir.*

## QƏZƏLLƏR

Necə bir şol cadu gözün qəsdi-canü dil qıla,
Necə bir şol incə belün bu tənümi qıl qıla.

Gözlərüm gəmisi ləngər saldı qan dənizinə,
Ğərqi-xun olsun əgər əzmini basahil qıla.

Şol günəş yüzünə qarşu bən hilali olmışam,
Ola bu əksüklüyi kim, hüsnünüz kamil qıla.

Necə qıla bir könül ki, hər qılıyçün zülfinün,
Kirpüginün hər qılından bir dəmi-sail qıla.

E'tidali-qamətündən ədl ümar dəlü könül
Ki, məgər sərvini bizdən yanaya mail qıla.

* * *

Ləbün meyiylə bir dəm dimağ əgər tər ola,
Gərək ki, sözlərümüzdən cihan mü’əttər ola.

Gözüm nəmi nəmə əksük qomaz, vəli yarun,
Yaşuma gər nəmə nur isə daxı xoştər ola.

Qoya bilürsə başı ayağına xəlqi-cəhan,
Gərək ki, zülfi kibi cümlə sərbəsər sər ola.

Həva dimağuma urdi əcəb dəgül şimdi,
Bu göz yolından əgər yaşlarum müqəttər ola.

Xəyaluna taparam bütpərəst xod degüləm,
Nerəyə baxar isəm surətün müsəvvar ola.

Məgər ki, bu könülüm arzuyi-şəkkər edər
Ki, dayima ağızumda ləbün mükərrər ola.

Nigara, lə’li-ləbün aşiqi dürür bu könül,
Key isə cənnətün içində hövzi-Kövsər ola.

Sabah turu gəlip yüzünə baxan gözlər,
Gərək ki ğəm çərisi üsdinə müzəffər ola

Nigaran rast diyəlüm çü sərvün oldu rəvan,
Qiyamət oldi gərək qamu sərvə sərvər ola.

Dəm olmadımı dəmündən ki, bir dəm ola ana,
Neçə-neçə qapudan taşpa həlqei-dər ola.

Oduna çün ki, bərahım eşqilə düşə dil,
Xəyalunun bütini yonmağ ilə azər ola.

Günəş ilə gecənün ictima’i yox, ya nəçün,
Bu qarə zülfi nigarun yüzində dərxor ola.

Bu rast qəddüni çəngi görürsə dutma əcəb,
Əgər müxalif edüp sazını mühəyyər ola.

Nigara udi saçun qıldı yenilə qanun,
K’anun xəyaliylə dil-dil həmişə məcmər ola.

* * *

Bülbül yenə çağırdı ki, fəryad yad ola,
Qəddün yenə salındı ki, şimşad şad ola.

Gözün əgərçi zülmini irurdi ğayətə,
Umum budur, ləbün ilə bidad dad ola.

Sərvün ayağı bağlıvü ney bağıldur beli,
Qəddün kibi kim ola ki, azad zad ola.

Novruzdur, sənünilə bir eyş edəm gərək
Ki, dünya əhli görəvü əyad yad ola.

Badi-səba saçun ilə oynayalı, şəha,
Bildük ki, işbu dəhri-qəmabad bad ola.

* * *

Gecə-gündüz bənüm işüm zar ola,
Qorxaram fitnə gözün bidar ola.

Səndən özgəyə bazımaz gözlərüm,
Görməyə məgər səni, naçar ola.

Necə qurtara bilə kişi könül,
Çünki mə’şuqi büti-əyyar ola.

Zəhr içün tiryakı qoymax olamı,
La-cərəm ki, gül qatında xar ola.

Gah mehrab ola qaşlarun bana,
Gah zülfün belümə zünnar ola.

Də'viyi-zöhdü nəmazuna sənün,
Taş bağırun mövcibi-inkar ola.

Eşqə bürhan gösdərür yüzün əgər,
Bir nəfəs lütfün bizümlə yar ola.

Qanqı dindədür rəva bu hal ki,
Bən xumaru ləblərün xəmmar ola.

Çün xəyalun qıldı gözümdə məqam,
Vacib oldı ki, ana idrar ola.

Kim ki, bizari ola bazarıdur,
Kim ki, bazar isdəyə ba-zar ola.

Şol könüldə ki, sən olasın, şəha,
Diləməzəm ki, daxı dəyyar ola.

* * *

Can-cana irmədiyisə, tən-tənə irdi, şükr ana,
İşbu bizüm zəmzəməmüz, tən-tənə irdi, şükr ana.

Anca cigər qanını bən ləbləriyilə içmişəm
Ki, sunıcax ağızuma, əl qanə irdi, şükr ana.

Can ləbünüzə irəli təng dürür, macalı yox,
Eyşi gərək fərax ola can-canə irdi, şükr ana.

Gəldi xəyalı könlümə, özini buldu xanədə,
Muşduluq oldu könülə, qul xanə irdi, şükr ana.

Rövşən idi bu kim, yüzin sevər idüm qədimdən,
Şimdi bizüm bu də'vimüz bürhanə irdi, şükr ana.

* * *

Bizümlə hiylə qılur, nedəlüm cəhani-fəna,
Dilər ki, quşca canum eşqinün oduna yana.

Gözü çü qıl qələmilə yazar yürəgümdə
Qızıl mürəkkəb ilə yüzdə yazduğu oxuna.

Necə xətayi deyəlüm bü türkinin gözünə
Ki, atar isə yabana, nişanəyə toxuna.

Nəsim verdi yelə, dutxun eylədi könüli,
Apardı keysularınun qarasına, axına.

Vasili və’dəsi irdivü keçdi, irəmədüm,
İrağa saldı fələk, könülümi yaxına.

Qanadı yox könülümün ki, uça sevdüginə,
Qanadı qanı, nigarun gözü ki, qanə qana.

Yüzündə gördügümi bən, görürsə hər bidil,
Fəya kəramətə mən-zallə ya’budil-vəsəna.

Cəfayə səbr edəlüm ol visalı gözədibən,
Fəraqdan ola ki, çərx daxı həm usana.

Saçında azdı könülümü azduğu uzanur,
Könül dilər anı ki, azmağ azana uzana.

* * *

Eşqi odı dilbərün bu başa çıxarsa,
Ola əcəb ol od ilə başa çıxarsa.

Taşə taşun gözləri cigər qaniylə,
Hüsni cəmalı şü’an taşa çıxarsa.

Anı ki, gizləmişəm bu tar könülümdə,
Yedi fələkdən yuxarı aşa, çıxarsa.

Tatuna can verməgə bəhanə gərəkdür,
Qılma ana tə’nə, gər şabaşa çıxarsa.

Könüli sal bəndə qara saçlarun ilə,
Dik gözünün oxlarına qaşa çıxarsa.

* * *

Sun bizə saqi ayaq, dəgdi bulunmaz yayaq,
Çünki cahandur keçər, bizi qoymagıl yayaq.

Gözü uyxular kibi, bizi salar uyxuya,
Sora əgər varasın, biz uyuruz, ol oyaq.

Kişi budur qaşınun key bizi oxa dikər,
Gər bulur isə səfa qurban içündür qoçaq.

Gözləri car eylədi tolu ayaq içməgə,
Dünyayı toldur götür ki, bütün olsun yasaq.

Pirü xərəf əqlimüz eşq ilə oldu yigit,
Çün qocala adəmi, ana gərəkdür tayaq.

* * *

Qopdu yenə könlümdə zəmzəmeyi-eşq,
Söylənür oldu içümdə dəmdəmeyi-eşq.

Hər nə ki, hökm etmiş idi, gəldi başuma,
Sübhi-əzəldən bərü bu məlhəmeyi-eşq.

Varlığumun cümləsini gəldi apardı,
Varlığuma qonuq olalı həmeyi-eşq.

Lə'li-ləbün hər nə ki, qodı könülümdə,
Dökdi gözüm camına bu qumqumeyi-eşq.

Salalı hüsnün atın vücudum elinə,
Düşdi atınun öninə bu rəmeyi-eşq.

* * *

Könüldə qopalı, sənama, bir səfaye-eşq,
Doldu bu aləmə yenə bizdən, nidayi-eşq.

Bu dərdümün dəvasına əql edəməz əlac,
Bənzər bu dərdə ki, gərək olur dəvayi-eşq.

Qanı könüldə suvü gözümün yaşını, qan
Bənzüm görmişin altun edər kimyayi-eşq.

Ənbər saçı çinində canum müşki çin edər,
Olmadı bəndən özgəyə hərgiz xətayi-eşq.

Zülfi nihayətinə bu eşqüm irəmədi,
Gərçi yöriyiməz kişi hərgiz bepayi-eşq.

Çün gəldi eşq mülkini ana sımarladum,
Tədbiri-məmləkət hələ qaldı bərayi-eşq.

Qanilə dəstamaz aluram ləbləriyçün,
Ta bir dükana rast qılam əzbərayi-eşq.

Eşqün axıtdı qanumıvü lə'li-ləblərün,
Ərz edər özini ki, bənəm xünbəhayi-eşq.

Yürək dəlük-dəlük olıbən nalələr qılur,
Də'visi bu ki, yə'ni bənəm işimdi nayi-eşq.

Tardur könül bəğayətü eşqün dənizi od,
Can necə qatlanıbilə pəs dər həvayi-eşq.

Bən yar eşqiyilə doğuban böyimişəm,
Məhrum olmaya kişi əndər-sərayi-eşq.

* * *

Suxtə könüllərə qıldı yenə car eşq,
Ey neçə aşiqləri qıldı yenə zar eşq.

Qıldı yanaxlarumı cümlə mu'əsfər məgər,
Anun içün eylədi cədvəli-bərkar eşq.

Gərçi ki, məxmər edər ləbləriyilə canı,
Şükr ana ki, gözlərin eylədi xumar eşq.

Küfrini geysusinün canumuz iman bilur,
Bağlayala belümə bir qarə zünnar eşq.

Doldu könüldə həva, qomadı halı məkan,
La-cərəm oldi qamu bu dərü divar eşq.

Aşiqü mə'şuqənün eşqilədür varlığı,
Baxıcağ ol ortada yenə günahkar eşq.

Xəstəyə olan şifa, əhdinə qılan vəfa,
Məclis içində səfa, gül bitürən xar eşq.

Biz neçəsi eşqilə olmayalum bir çün,
Biz yoğikən vəhdətə eylədi iqrar eşq.

Vərdişi-eşq eyləsə bizciləyin kişilər,
Nola çü vərziş qılur günbədi dəvvar eşq.

* * *

Gəlün içəlüm bir-iki camı dolu badə,
Cəhd eyləyəlüm verməyəlüm ömüri badə.

Bi-dadə könül bağladı canum gözün ilə,
Bir parə qılursan daxı ol varmaya dadə.

Bən sana canum verəmü sən yada könülün,
Andan daxı götürməyisər hiç bizi yadə.

Bən sərf sevərəm səni, sən sadə gözəlsən,
Gərək ki, bayışayidi bə sərf ilə sadə.

Zülfündə yol uzundurü belündə iş incə,
Lə'lün nola gər verür isə bizə ziyadə.

Belündə özin oynadı canum zi-mühəqqəq,
Zira ki, gözin açdı, baqa gördi fənadə.

Bən eşqünə varlıx verürəm, kim verür artux,
Olmaya rəva kim, verəsiz hüsni məzadə.

Hüsnün kibi bən eşq ilə gərək ki, ad alam,
Azadə qaçan qane' olisərdür az adə.

Bən sözi təvil edəməzəm, şöylə fəridəm
Ki, qalmaya cüz eşq vücudumda ziyadə.

* * *

Bir müddət əgər bulmaz isən yar eşigində,
Cəhd eylə qərar etməgə naçar eşigində.

İqrar gərək ki, qılasın cürmü xətanə,
Zira ki, ulu cürm ola inkar, eşigində.

Gər yar isəm ana, kişiyi görməgil əğyar,
Zira ki, şahun olmaya əğyar eşigində.

Sultan qulu ol ki, ola aləm sana Bağdad,
Yörəgə yörəniməyə əğyar eşigində.

Gülşəndə əgər bir güli sən qoxlar isən,
Əlünə nola batar isə xar eşigində.

Zor ilə zərə sevdügümün çün tanı yoxdur,
Yüz naləvü bin ah edərəm zar eşigində.

Can xəstəvü lə'lündən umar dərdə dəvasın,
Öldürmə şəha, sayruyi əttar eşigində.

* * *

Ğəmzən sənəma, urdı yenə yarə yürəkdə,
Nə saxlamışam görseyidün yarə yürəkdə.

Bən saxlamışam hüsni xəyalını nigarun,
İnanmaz isən tur bərü gəl, arə yürəkdə.

Şaha, könül ölündür, daxı bir yörənü gəl,
Gör ki, nə qılur zülfi-siyəh qarə yürəkdə.

Şol cadu gözün sehr ilə aldı canumu, leyk,
Miskin könüli eylədi biçarə yürəkdə.

Bən gül görürəm yüzüni gözümdəvü leykin,
Yer düzərəm öndin sənəma, xarə yürəkdə.

Azadəsiyəm, nola hələ bəndənüz oldum,
Eşqün odınun yerini gör qarə yürəkdə.

* * *

Al çəngüni çəngi əlünə, başla nəvayə,
Söhbətdə ki, sən çalmayasın çəngi, nə vayə.

Keysularunun bin başı var, naz ilə oynar,
Bən bir başumı oynadam, uş badi-həvayə.

Yar dərdi dəvadur canuma, olmasun əksük,
Dəgşürməzəm öüncə bən ol dərdi dəvayə.

Bibərgü nəva eşqün uzun yoluna girdüm,
Gülbəri yüzün ilə irəm olamı nəvayə.

Bən sərvün içün rast budur, bisərü payəm,
Bənzəmişəm ol bədri-cəmalunla növ ayə.

* * *

Gəl halumu gör, daxı yetər səni əsirgə,
Gör kimi sevərəm, daxı gəl bəni əsirgə.

Heyf olmayamı qaşlaruna çin salasan sən,
Bən xod ölürəm, sən hələ şol çini əsirgə.

Canü dil ilə əql sənündür, nə deyəyüm,
Lütf eyləvü bax tanrıya, bir dini əsirgə.

Məşşatə niçün ğaliyə sürtər bu yüzunə,
Heyf olmayamı keysuyi-miskini əsirgə.

Ləblərün içün lə'l demək qatı günahdır,
Sən deməvü şol cövhəri-rəngini əsirgə.

Məddah nə təhsin edə bilə səni, şaha,
Sən qaxıma ol mədh ilə, təhsini əsirgə.

Yüzünə günəş, alnına ay nisbət olumaz
Dişlərinə gəl bax, daxı pərvini əsirgə.

* * *

Dilbəra, insafə, gəlgil, neçə-neçə dilbəri,
Bən yüzüni görəli xod dilbəriyəm, dilbəri.

Bən ayağuna fəda, baş qoymuşam xeyli dürür,
Sən bu halumi bənüm bəs anlamağıl sərsəri.

Boyuna tuba nə nisbət, bir quru ağac durur,
Kim götürə belə dilə sərvi, yaxud ər'əri.

Bən sən ayı görəli, irdüm kəmalə anca ki,
Hüsnüni vəsf etmək içün oldi zehnüm ənvəri.

Şi'ə əhlindən dəgüləm, leyk vardur bu qədər
Ki, Hüseyni lə'lün içün oldı axıduram Cə'fəri.

Dünyada daxı nə dilər şol kişi ki, dər-bəhar,
Suna ayağ əlinə mə'şuqəi-xoşmənzəri.

Özgələri mədh edənlər görəli şah yüzüni,
Bir yeni tumar edüp yudılar əski dəftəri.

Nə rəvadur ki, görə lə'li-ləbüni hər dəğəl,
Bilməgə anı bənüm tək kişi gərək cövhəri.

İncü dişünün xəyalı düşəli könülümə,
Yüzümə yalduzlamışam sərbəsər abi-zəri.

* * *

Fitnə gözün könülümün afətidür, afəti,
Can aparmax işvələrün adətidür adəti.

Zülfüni xalun yanında dağıdırsan, yə'ni nə,
Xod dutulmax könülümün hacətidür hacəti.

Gər qiyamət günini bilməz isə heç kimsənə,
Bən bilürəm ol nigarun qamətidür qaməti.

Kimsənə haqqun cəmalı müshəfin oxumadı,
Bən oxudum hüsnüni ki, ayətidür ayəti.

Eşqimün heç kimsənə qayətinə irəmədi,
Zira ki, hüsnün cəmalun qayətidür qayəti.

* * *

Qaplan olmuş könül, şikarı qanı?
Eşq eşigində ahü zarı qanı?

Gözlərindən çü ayağ içdi könül,
Gözünə qarşu bir xumarı qanı?

Başın dizində qomuş bənöfşə bu gün,
Görmiş ol zülfi-biqərarı, qanı?

Bülbülə zari gösdərəydüm əgər,
Görsəydüm bən ol nigarı, qanı?

Gözi ahusi seyd qıldı bəni,
Totağındakı dür şikarı qanı?

İncə beli tənümi qıl qıldı,
Təni qıl qılmağun kənarı qanı?

İxtiyarilə vardı dil tapuna,
Şimdi bu könül ixtiyarı qanı?

* * *

Əcəba, dərdümün dəvası qanı?
Əcəba, rəncümün şəfası qanı?

Ayağı tozuna yüz ururam
Ki, göz ağrısı tutiyası qanı?

Zülfi bel binübən irişdi canə,
Ənbərin xəttinün yayası qanı?

Kimiyayilə qıldı zər yüzümi,
Yarı bulmağa simiyası qanı?

Sidqümi bildi hüsni eşqində,
Bəs bizə vəslinün cəfası qanı?

Əl-ayağ ilə başü can oynamayan,
Eşqi yolunda dəstü pası qanı?

Yaxası hicr oduna yüz bin yil,
Qoxmayan eşq ilə yaxası qanı?

* * *

Könül nigara qonuq oldu, mərhəbası qanı?
Gözüm dənizlər axıdur, aşinası qanı?

Yürəgümün qanına girdi, lə’li qanludurur,
Nola, sorar isəm andan ki, xunbəhası qanı.

Gözümi cadu gözün xəstə qıldı xeyli dürür,
Ayağun izi, tozi oldu tutiyası qanı?

Bənüm qanum bu cəhan boynına düşər, zira
Gərək ki, gösdərə bana cəhan səfası qanı?

Ətəgin, əlini dutduğum övliyalarun,
Gərək ki, irişeyidi bana duası qanı?

* * *

Xoş görəlüm sənün ilə fəsli-xəzanı,
Sun bərü cam ilə tolu abi-rəzanı.

Ruhi-rəvan sun rəvan ölümə ey ruhum,
K’oynayayum yoluna bu ruhi-rəvanı.

Olmadımı dəm ki, bir nəfəs sana irəm,
Necə çəkəm ayrulığ ilə nigəranı?

Eşqün ilə bən ziyanı sud dutaram,
Sağışa gətürməzəm bu sudü ziyanı.

Yaxınına gəlmədin vücudumı yaxar,
Görümədüm bu bəni yaxanı ya xanı.

Canum içində yerini düzdi könülüm,
Sanmaz idüm yar ilə ola bəna canı.

Bir dəm umaram ki, ola yar ilə bir dəm,
Ol dəmi gətür, ver talana dükanı.

* * *

Uşdu şəkər ləblərinə miskü Xötən qarıncası,
Oldu ana cümlə fəda, əqlü könül varıncası.

Sordum ləbindən dərdümi, dodağın aldı ağzına,
Bənzər müfərrih isdədi, bu aşiqün sor necəsi.

Mə’şuqə çox ziba, vəli tuzluvü şuxu şəngi az,
Üşşaq arasında daxı ayruxsudur bir neçəsi.

Vəsli qısa, hicri yoğun olur imiş bu dünyada,
Mə’şuqənün bulınacax saçı uzun, beli incəsi.

Sima bəni zülfün kibi, eşqündə çünki doğruyam,
Simasına bax aşiqün, bari anı suçıncasi.

* * *

Xub cahanda çox, vəli nazikü dilruba gərək,
Cana vida’ qıluban eşqinə mərhəba gərək.

Bən kim olam ki, dəprədəm bir qılını keysusunun,
Başın əlinə alıban ol iş içün səba gərək.

Ğönçə ağızın açmağa kimün əli irişisər,
Atəşi-eşq mövsümi irişibən həva gərək.

Ta ki, səfa girə ələ Kə'bə yüzində ol bütün,
Cünnə daxi qəba olub, yenə qəba əba gərək.

Dərdiyilə çü əsrugəm, dürdiyilə yazam xumar,
Pəs nedəlüm çü xəstəyüz, dərdümüzə dəva gərək.

* * *

Bu könlüm dənizi daşa gərək,
Düşmən ura başını daşa gərək.

Düşmənə deyin ki, aşını verə,
Bu dənizlər başından aşa gərək.

Quru qılmayısar yaşu quru,
İrə lütfi quruya yaşa gərək.

Başuma irmədin olursam baş,
İrürəm işbu işi başa gərək.

Kim dilər isə k'avlayə şahin,
Gövdəsi ortalıxda laşa gərək.

* * *

Bana yenə totağundan şərabi-nab gərək,
Diriğ olmayısar, gər cigər kəbab gərək.

Könlümə qodi eşqinü oda yaxdı onı,
Günahı yoxdur anun, gənc dərxərab gərək.

Gözümə gər basar isə yüzün xəyalı əyax,
Nisar içün yaşum incu, yüzüm zərab gərək.

Bənini gördümü dedüm: bu hindu bunda nədür?
Dedi ki, cənnət isə, nola bir əzab gərək.

Yoluna varlığı qoyub gərək ki, söhbət edəm,
Mühib ki, irə həbibinə nə hicab gərək.

* * *

Canumı eşqünə satdum, daxı bəha nə gərək?
Bana xu yoluna can verməgə bəhanə gərək?

Nigara, qamətünə qılmışuz könülü fəda,
Zira ki, sərvi-rəvanə rəvan rəvanə gərək.

Dükana baxmadı, bazarı olmadı könülüm,
Vəleyk, lə'li-ləbünçün varam dukanə gərək.

Qanumı ləbləri içdivü düşdi arayə qan.
Canum daxı quşanuban bu qana qanə gərək.

Nigara, zülfüni tağıt, qarası çox olsun,
Ya ada, ya sana layiq çəri yasanə gərək.

Kənarı andanu andan kənarə istəməgil,
Miyanə dərdi-dil əhli işi miyanə gərək.

Çü lütfüni bilürəm, gər günah qıldum isə,
Yazanə qılma cəfayi, cəfa yazanə gərək.

* * *

Bülbül ünün eşitdi, ğövğayə çəkər bu dil,
Gül qoxusunu aldı, səhrayə çəkər bu dil.

Gül yoluna gözlərüm qızardalı eşqini,
Nərgisləri yoluna sevdayə çəkər bu dil.

Keysuları binmişdur hər ləhzə nəsim atın,
Xəttinə varur bənzər ya yayə çəkər bu dil.

Bən anavü könülüm könilinə qomışam,
Bir əhli-dil anlasa nə qayə çəkər bu dil.

Bir busə umar ləbdən yüzin yüzə dəgşürür,
Anlasalar anı ki, hər ayə çəkər bu dil.

Bən sinəmi sınayu açdum bu nəsim içün,
Yaxama yapışuban yaxayə çəkər bu dil.

Can tihi məhəbbətdə heyrandurü sərgərdan,
Qalmadı məni bunda səlvayə çəkər bu dil.

* * *

Dəlüsiyəm zülfünün, silsilə dəprətməgil,
Ta diyəməm halumi, qıl-qıla dəprətməgil.

Belün ilə incəyəm, ağzun ilə təngdil,
Kəndünə bax, halumi bil, belə dəprətməgil.

Can verəyüm qəmzənə, gərçi ki, canidür ol,
Dil derisəm gözünə, dil dilə dəprətməgil.

Can anı dilər ki, yaş yolına ola rəvan,
Şayəd ana der isəm, sil-silə dəprətməgil.

Ol derisə gisusi canuma şol dəm ola,
Hər qılına der isə qıl, qıla dəprətməgil.

Söyləmədi dilüm lə’li-ləbün vəsfini,
Dedüm ana kəndüdən dil, dilə dəprətməgil.

Şunda ki, qıldum fəda küllümi bən küllünə,
Tən tənəvü can cana, dil dilə dəprətməgil.

* * *

Saçuna uğrayu gələn nəsimə uçdu könül,
Bu dünyada daxı nə zər, nə simə uçdu könül.

Nə dəm durur ki, nədəm gəlməz ola ardınca,
Vəleyk dün gecə key şol nədimə uçdu könül.

Müsafir oldu könül hüsni eli içində,
Məlahətin görəli şol müqimə uçdu könül.

Nolayidi qamu quşlar bu gülşənə gəlsə,
Təfərrüc etsə arada ki, kimə uçdu könül.

Özümi bulımazam ki, şərh edəm tapuna
Ki, hicrünilə ə'zabi-əlimə uçdu könül.

* * *

Qədəm basalı yoluna, qədəm-qədəm yanaram,
Tapunda şəm' kibi uşda dəm-bədəm yanaram.

Cahanı tən diləröm bən ki, oduna yanam,
Bu varlıq ilə yanarsam, oduna kəm yanaram.

Yaxamı hiç qomaz əldən, yaxam əlində durur,
Əl urmadın yaxama, demədin yaxam yanaram.

Cəmalı günəşi çün toğa hüsn gögində,
Məcalum olmaya k'andın yana adam yanaram.

Gözümün irməz əli ki, nəzər qıla yüzinə,
Vəgər göz ucuyilə özgəyə baxam, yanaram.

* * *

Mürği-səhər başladı zümzümeyi-zirü bəm,
Saqi, tolu sun bizə altun ayax lə'l-fam.

Gərçi həram ola qan qıldum ana bən həlal,
Ol bana vasil niçün qıldı əcəb rəs həram.

Eşqün ilə kimsənə görməmişəm bən səlim,
Gər kişi görmiş isə bizdən ana yüz səlam.

Od ilə su nola gər cəm' ola bəndə bu dəm,
Zülf ilə yüzündə gör məcmə'i-sübhü zəlam.

Ur ağızun ağzuma, sor canumı gövdədən
Ki, bulasın dünyada aşiqi-məla-kəlam.

Hey de bəgüm nəfsünə, olma vücuduna qul,
Taci-təcərrüd gözət, ey sana canum qulam.

Səndən anı dilərəm ki, biləsən ki, varam,
Bəndəsinə hər şahun ancaq olur ehtimam.

Boynumadur keysusi hər gecə təht-ül-ünq,
Ağzımadur ləbləri ta bəğiyamət lisam.

Könlümi sən siyalı qıldı gözüm qan rəvan,
Axıda içindəkin gər sınur olursa cam.

Ta ləbünə irmədi bulmadı cövhər bəha,
Ta dişüni görmədi bulmadı lö'lö' nizam.

Fitnə dürür gözlərün könlümə axır zəman,
Qəddün edər canuma sa'əti-ruzi-qiyam.

Oldu yüzün hər səhər canumuza iftitah
Oldu saçun hər gecə ömrümüzə ihtitam.

Xərq edər isə nola kirpügi bu yürəgi,
Çünki yaş ilə bulur xərqi anun iltiyam.

* * *

Tökər gözüm yaşın seylab hər dəm,
Qılur yer yüzini sirab hər dəm.

Könül Təbrizinə gələli ol şah.
Axıdur gözlərüm sürxab hər dəm.

Səma'i çərxi neylədi canuma,
Gözümi eylədi dulab hər dəm.

Qaçan qonuşam ol mahilə deyü,
Əlündə zicü üstürlab hər dəm.

Ləbün eşqinədür meyxanələrdə
Ki, içərlər şərabi-nab hər dəm.

Ləbün əfsununun mö'cizliginə
Müqirdür cümleyi-əhbab hər dəm.

Hicab oldu yaşum kirpüklərümə
Qaçan yol bula anda xab hər dəm.

* * *

Dərdməndəm, dərdə timar isdərəm,
Xəstəyəm, gözüni bimar isdərəm.

Bir nəzər qılsan nola, əhvaluma,
Zi dəlü əsrügi, me'mar isdərəm.

Qaşıdur mehrabü yüzi qiblədür,
Bəs niçün zülfini zünnar isdərəm?

Gözlərümün köşəsidür odağun,
Onun içün ana idrar isdərəm.

Canü tən, əqlü dilü varlıx verüb,
Yara qul oldum, bir iqrar isdərəm.

Degüləm bazari, bizar olmazam,
Ta ki, canum ola bazar isdərəm.

Ta ki, bir göz daxı düşə ol nəzər,
Daima əflaki dəvvar isdərəm.

Cevr əlindən canü dil qurtarmağa,
Ənbəründən iki tatar isdərəm.

Keysun içində azar canum, vəli
Sən bəni görgil ki, azar isdərəm.

Sevərəm zülfünlə ağızuni bən,
Ömrüm uzun eyşümi tar isdərəm.

Gözi uyır, lə’l söylər, sevərəm,
Fitnə xuftə, baxtı bidar isdərəm.

Qıl yarar canum ki, irə belinə,
İncə yola girməgə yar isdərəm.

Gözi qıldı könül elini xarab,
Gəzmişəm bən el ilə şar isdərəm.

* * *

Yar kənarə gəlicək, bən çü miyanə gəlmişəm,
Şimdi ki, irdi fürqəti, dərd ilə canə gəlmişəm.

Necə ki, qaşları bəni ox kibi atdı yabanə,
Ağzum açup, əlin öpüp, yenə kəmanə gəlmişəm.

Can ilə əqlü dil verüp, dərd ilə eşq almışam,
Yə’ni ki, ulu xocayam, sudü ziyanə gəlmişəm.

Ayruca canı həq verür, ta ki, cahana götürə,
Bən canum oynamağ içün, işbu cahanə gəlmişəm.

Dari-bəqa sanur kişi işbu cəhani-faniyi,
Bən bu fənayə girmişəm, əmnü əmanə gəlmişəm.

Lütf ilə qəhri həq bana birbiyəsin beribidi,
Bəs bu bəsirət əhlinə dam ilə danə gəlmişəm.

Elmi-əzəldə çünki həq seçdi qamu olacağı,
Bənü neçə bənüm kibi bunda bəhanə gəlmişəm.

Heç edügini könülüm bildi belini görəli,
Görəli lə'li işvəsin, şimdi, gümanə gəlmişəm.

* * *

Bülbül yenə giryandurü, gülşən yenə xürrəm,
Ğönçə yenə xəndandürü, nərgis yenə pürğəm.

Bülbül gərək ağlaya sabahadəkin, anca
Ki, düşə həyadan gəlinün üsdinə şəbnəm.

Sübh ol günəş içün dəmi-sərd ura rəvamı,
Ya lə'liyiçün lalə ağızın aça dəm-dəm.

Sevdama müfərrih dilədüm lə'li-ləbindən,
Kan olmaya gər aydur isə ol bana əm səm.

Tək sən bənüm ol, uçmağı kimə gərək isə,
Tərk eylədi bir buğdayiçün uçmağı Adəm.

Xalunda səfa anladum, ey Kə'beyi-dilha,
Ol zəmzəmə eylədi bənüm gözümi Zəmzəm.

Mərhəm dilədüm sirr ilə yarama ləbindən,
İrürdi səba keysusına, eylədi vərhəm.

* * *

Dedi: könlündə nə vardur, dedüm: həm,
Dedi: gözündə nə vardur, dedüm: dəm.

Dedi: nədür bu aləmdə buradun,
Dedüm: bir dilbəri-zibayi-həmdəm.

Çü dərdün böylə müzmərdür könüldə,
Niçün olmaz canun canuma müdğəm?

Ləbün dərdiyilə qanum su oldu,
Nola gər dərdüm içün umsam, əmsəm.

* * *

Gözlərünün oxuna bən şaha, nişanə gəlmişəm,
Müşkilə düşdügüm bu ki, zülfünə şanə gəlmişəm.

Ləbləridür canum bənüm, canum irincə ol ləbə,
İrdi canum ləbünə ki, sidq ilə canə gəlmişəm.

Dökdi ləbün yürək qanın, qana bulaşdı, qarşuma
Şimdi ləbünə yapışub diş ilə qanə gəlmişəm.

Yüzümi zər gözüm yaşın lə’l ilə lö’lö düzibən,
Ağzunı cövhəri görüp, yə’ni dükanə gəlmişəm.

Zülfi qılı bəni əgər saldı kənara, xoş ola,
Bən tənümi qıl edübən yenə miyanə gəlmişəm.

* * *

Şaha, sənün cəmalunu görəyim, andan öləyim,
Susamışam, visaluna irəyim, andan öləyim.

Bunca zaman ləbün içün saçun qaranusındayam,
Abi həyat qandadur, sorayım, andan öləyim.

Dün gecə duşda bən səni bənüm ilə görür idim,
Bu duşumun tə’birini yorayım, andan öləyim.

Bəzmi-əzəldə irəli canuma eşqi hüsninün,
İrəmədüm, varamadum, irəyim, andan öləyim.

Canumu əqlimü könül zülfün içində yitdilər,
Təşviş əgər olmaz isə, tarayım, andan öləyim.

* * *

Cahanda xubları gördük, vəfası yox, neydəlim,
Könüli xəstə qılur ol şəfası yox, neydəlim.

Bu suffədə ki, günəş, ay müzəhhəb etmiş anı,
Qaçan ki, olmayasın sən səfası yox, neydəlim.

Gözün könüli qılur xəstə caduliqiyilə,
Bu dərdə dərddən özgə dəvası yox, neydəlim.

Canum oda düşəli, topraq edərəm yüzümi,
Qara saçuna sənun çün həvası yox, neydəlim.

Əgərçi hüsnün apardı saçuna könülümi,
Neçəsi qurtıla çün dəstü pası yox, neydəlim.

Fəna durur bu cahanü ləbün fənada fəna,
Bu könlümün ki, fənadur, bəqası yox, neydəlim.

Səgirtdi saçlarınun bizə yenə tatarı,
Yayaları ki, irişdi, xətası yox, neydəlim.

* * *

Bir dilbəri-biqərarə düşdüm,
Keysuyi-siyah-karə düşdüm.

Gülşən yüzinün gülün dərərkən,
Gül dərmədümü xarə düşdüm.

Əsridüm anun ləbi meyindən,
Şol nərgisi-pürxümarə düşdüm.

Zülfünə dolaşıban çü Mənsur,
Şol sərvi-qədində darə düşdüm.

Cənnət görübən cəmalın anın,
Yolunda həzar narə düşdüm.

Zülfi yeli qoxusun eşitdim,
Aldum başum ol diyarə düşdüm.

Namus ilə ardan çü uram,
Bu varlığım ilə arə düşdüm.

Qan yaşum ilə nigar oldum,
Çün sənciləyin nigarə düşdüm.

Dayim bu meydanda oynadum can,
Pəs şimdi niçün kənarə düşdüm.

* * *

Dünyadə yenə bən qoca bir gəncə irişdüm,
Viranə içində sanasan gəncə irişdüm.

Zülfeyni pərişan idi, gözləri hərami,
Şükr ana ki, bən lə’linə imincə irişdüm.

Belinə irişəm deyü bən bu yola girdüm,
Şol belə ki, ol qıldur uzun, incə irişdüm.

İçincə nigarum bir-iki ayağ, içərkən
Tolu ayağı sundumü içincə irişdüm.

Narınca beliyçün nola nar olsa könüldə,
Sərvində çü bən şol iki narınca irişdüm.

## RÜBAİLƏR

Şad olur isəm vəslün ilə qəm olamı,
Bən irməz isəm nəsnə sizə kəm olamı,
Səd parəvü məcruh edər idüm cigəri,
Lə'lün ilə bilsəm ana mərhəm olamı.

Məstanə gözün danei-badam olamı,
Xal ilə saçun danei-ba-dam olamı,
Şirin dodağun baxdum idi, baxdumdur,
İşbu azacux dünyada bir kam olamı.

Sərvün ki, rəvan oldu, rəvana verərmi,
Lə'lüni bu dünya dolu cana verərmi,
Bən canı fəda qılur isəm, baxmağa bir göz,
Hüsnünə sənün şər' ilə qana verərmi.

Könlüm yenə ol Leyliyə Məcnun olmuş,
Yaşım yenə yar yoluna Ceyhun olmuş,
Ləbləri çəkişmiş könlümi olamı,
Baxdum aralarında məgər xun olmuş.

Şükr ana ki, bən dilbəri-narın sevərəm,
Könülümi yar yolına narın sevərəm,
Bu gün sevərəm ağzını ki, öləm anınçün,
Ta yenə diriləm deyü yarın1 sevərəm.

Ol göz ki, yüzün görməyə, göz demə ana,
Şol yüz ki, tozun silməyə, yüz demə ana,
Şol söz ki, içində, sənəma, vəsfün yox,
Sən badi-həva tut anı, söz demə ana.

Dedüm ki, ləbün; dedi, nə şirin söylər,
Dedüm ki, belün; dedi, nə narın söylər,
Dedüm ki, canum cümlə fədadur saçuna,
Dedi ki, bu miskin hələ varın söylər.

Dedi ki, niçün gözüni pürnəm görürəm,
Ya könülüni bən nişə pürğəm görürəm,
Dedüm, sənəma, anıniçün ki, ləbüni
Dayim görəməzəm, vəli dəm-dəm görürəm.

Bən ləblərüni canuma əm səm görürəm,
Gözün yarasın könülə mərhəm görürəm,
Eşqün odını ki, yaxa iki cahanı,
Bən kəndü canuma yalunuz kəm görürəm.

Eşq əhli yarı yolına məstanə gərəkdür,
Sevdüginün eşigini yastınə gərəkdür,
Cananəyiçün oynaya ol canını şöylə
Ki, tə'nə ura Rüs'təmi-dastanə gərəkdür.

Yürək gözünün yolına səd parə gərəkdür,
Gisularun içində dil avarə gərəkdür,
Biçarəyə ki, qaldı bu gisun ilə miskin,
Şol lə'li-ləbündən, sənəma, çarə gərəkdür.

Cananəyə can verməgə üşşaqə səladur,
Can verməzü cananə dilər, bu nə bəladur,
Aləm qamusı gər arastə ola hazır,
Bən sana əgər irər isəm, anda xəladur.

## TUYUĞLAR

Yaxşı anladum cahanda və yə yox,
Yardan özgə bu xumarum, ayə, yox,
İki aləmdə ümid sərvər dürür,
Andan ayru daxı hiç sərmayə yox.

Sənciləyin dünyada xub az imiş,
Nəğməni "Rast" anladum, "Şəhnaz" imiş,
Könüllər kəkliginə bu dünyada,
İlla şahin gözlərün şəhbaz imiş.

Söz deyəm sana əgər inanasın,
Yar gözündür gözünə, nə sanasın,
Yarunı anda biləsin pədürür,
Gər karimə qarşu sən yasanasın.

Görmədüm sən tək lətif, nazük cəvan,
Tapuna olsun fəda canü səhan,
Qətrəcə lütfün bizə irər bolsa,
Qətrə tək ola qatumda bin umman.

Həmişə aşiq könli büryan bolur,
Hər nəfəs ğərib gözi giryan bolur,
Sufilərün diləgi mehrab, nəmaz,
Ər kişinün arzusı meydan bolur.

Can bu meydan içrə agah ola gah,
Eşq ərinün varlığı ah ola ah,
Kim bu yolda toğru gər varur isə,
Ərligün əvrənində şah ola şah.

Bu dünya bir nəfs içün olmış yalax,
Dibi yaxındur anun, degül irax,
Zülfüni tağıtma, cəm eylə bəgüm,
Yoxsa olur bu cəhan alax-bulax.

Gözlərün dərdlülərün dərmanıdur,
Canu dil ol ikinün qurbanıdur,
Canuma sevmək səni irağ işdürür,
Netsə olur, ol çələb fərmanıdur.

Zülfün açsan dünyada təşviş olur,
Qatı baxarsan cigərlər riş olur,
Gözlərün qan dökməgə qurşanursa,
Dünyada çox kişilər dərviş olur.

Səni sevməyən, bəgüm, adəm degül,
Nə dəmi var, kim ki, bağrı dəm degül,
Sən gözün qəmzəsini atma şuna,
Kirməyə gər yarunuz mərhəm degül.

Bən sevən xublar içində şah imiş,
Sanasan, yılduz içində mah imiş,
Bən dənizə salmışam bir canumı,
Qamu işi başaran Allah imiş.

Gül ol ola bülbülini gözləyə,
Şah ol ola bir qulını gözləyə,
Xub ana deyəm ki, hər dəm içində,
Bülbülinün gulgulını gözləyə.

Zülfi ağlumı yabana yayamı,
Gözləri qəmzəsi bəni ayamı,
Görməyicək səni, gözüm dünyayı
Bir kəminə çöpçügəzə sayamı.

Dilbərün işi itabü naz olur,
Çeşmi-cadu qəmzəsi qəmmaz olur,
Ey könül, səbr et, təhəmmül qıl ana,
Yarə irişmək işi az-az olur.

Keçdi keçən, var isə devran budur,
Şimdi qopan canlara cevlan budur,
Kimdə ki, var isə gəlsün ortaya,
Gizləmək pəs neyiçün, meydan budur.

Eşq əri bu dünyada dil-riş imiş,
Rəncün içində bu gün dərviş imiş,
Geyməkü yeməkdən artux, istəmək
Ər kişinün canına təşviş imiş.

Hər zaman suya varup gəlməz sənək,
Qayda keçər ər yerinə hər zənək,
Tanrıdan bolsa inayət bir qula
Laçını daxı qapar yer kükənək.

Ərənlər düşmənləri avlaşurlar,
Qəmzələr bir-birini qovlaşurlar,
Bən qulıyam dünyada ol nərlərün
Ki, bu dəm meydanumda kükrəşürlər.

Dünyada qoçlar başı sərvər bolsa,
Qoçları bir-birindən sıçrar bolsa,
Nə gərək anda kişi, can oynamax,
Canu dil sərvərinə yarar bolsa.

Könülüm tək görmədüm bir çin könül,
Qamu könül könlümə pərçin könül,
Tolaşup zülfünə yitürmiş özin,
Ey könül, qara könül, miskin könül.

Hər nəfəs qəmdən könül azad oldı,
Könüllər bu arada dilşad oldı,
Dünya müşərrəf durür adum ilə,
Bu ara şimdi hələ Bağdad oldı.

Dünyada gərçək aşiq qanı qanı,
Aşıq isən gözünün qanı qanı,
Hər aşiq mə'şuq içün baş oynarsa,
Bən aşiqün yoluna canı canı.

Ər yigit qayda ürkər ürkülərdən.
Yaxşı at bəlinləməz ilkülərdən,
Düşmənlər bizdə bolsa ditrəşsünlər,
Qağan aslan qaypınmaz dilkülərdən.

Dünya deyən kişiyə bir vayədür,
Yemək-içmək bu canə bir dayədür,
Dünya bir keçüt dürür, gələn keçər,
İlla sərvər yigidə sərmayədür.

Yar oldur ki, yar ilə həmdərd ola,
Yarından yüz qaytaran yar sərd ola,
Yemək-içmək yaxşılıx günin görən,
Ər günində gər dönə, namərd ola.

Ərənlər öz yolunda ər tək gərək,
Meydanda ərkək kişi nər tək gərək,
Yaxşı-yaman, qatı-yumşax olsa xoş,
Sərvərəm deyən kişi ərkək gərək.

Yar yüzində incüdür, dürdanədür,
Zülfi damü qara xalı danədür,
Yolına ölür isəm, tutma əcəb,
Yar içün can oynamax mərdanədür.

Dünyada ər varlığı dildar imiş,
Eyşü-işrət rövnəqi didar imiş,
Yüzi gül, sünbül saçı, ənbər xəti,
Pəs cəmalı külbei-əttar imiş.

Gözəl çox, arasnda dilbər qanı,
Daşlar kör, orta yerdə cövhər qanı,
Qoçu buğra, ayğırı çox görmüşüz,
Adəmilər içində sərvər qanı.

Cana can verməyənün nə canı var,
Can verənün adıyilə sanı var,
Ər kişinün məta'i ərlik olur,
Cövhərinün lə'l ilə mərcanı var.

Ərənlər bu dünyaya qılmaz nəzər,
Bunda, əqli var kişi qılmaz qərar,
Bu dünya kölgədürür, qovar qaçsan,
Bir kişi ki, qaçar andan, ol qovar.

Gün necə ki, seyr edər cövlanında,
Görməmiş siz tək cüvan dövranında,
Ərənlər cərgəsində deyilən söz,
Yerinə yetmək gərək meydanında.

Bülbül özini bu dəm tə'rif edər,
Növbaharı görənlər təşrif edər,
Tuti gər bünyad edə qəvlü əməl,
Muna ləklək musiqi təsnif edər.

Necə ki, gögdə günəş seyranıdur,
Bu cahan ərənlərün meydanıdur,
Yevü nedürgil, alu bağışlaqıl,
Hər zaman bir yigidün devranıdur.

Yar gərək yarıyilə həmrəng ola,
Gər nişatü eyşi sülhü cəng ola,
Ol iki yarun ki, uyuşmaz belə,
İşləri ortada şişəsəng ola.

Cana qalma gər yara irəm dersən,
Bağa düşgil şaftalu derəm dersən,
Başa, cana, dünyalığa qalmaqıl,
Ərənlər meydanına girəm dersən.

Saçun tək bu dünyada ənbər varmı,
Gözün tək bağ içində əbhər varmı,
Cənnət içrə hurilər cəm’ olıcax,
Xublara sənciləyin sərvər varmı.

Yarı əğyarə kor isəm cəhl ola,
Cəfa yardan çəkər isəm səhl ola,
Yar ölür isə yarıyçün qəm degül,
Səhl ola iş, çünki dilbər əhl ola.

Üstündə devlət bu gün sayvan olsun,
Səadət yenə bizgə eyvan olsun,
Necə ki, bən sağamu qayqurmanuz,
Var canum yigitlərə qurban olsun.

Şol kişinün ki, canında dərdi var,
Əlki-surxü rəngi-ruyi-zərdi var,
Əldə beş barmağı duz kimi görmişdür,
Mərd olan yerdə labüd namərdi var.

Qoşunlar bir-birinə qaxşaşmaşda,
İki aləm çərisi çaxşaşmaşda,
Topumuz bolınısar xalqa ümid,
Bu cəhan xalqı işi oxşaşmaşda.

# ƏSSAR TƏBRİZİ

*Şəmsəddin Məhəmməd Əssar Təbrizi (1325–1390) XIV əsr Azərbaycan ədəbiyyatının ən görkəmli nümayəndələrindəndir. Təbrizdə doğulub, dövrünün elmlərinə mükəmməl yiyələnmiş şair heç bir hökmdarın sarayına getməmiş, azad zəhməti ilə yaşamışdır. Onun yaradıcılığı bir sıra orijinal keyfiyyətləri, xüsusilə yeni məzmunlu humanist və demokratik ideyalarla fərqlənir.*

*Şairin irsi lirik şeirlər divanından, "Mehr və Müştəri" poemasından və qafiyə haqqında yazdığı "Əlfavi fi te'dadül-qəvafi" adlı elmi risalədən ibarətdir.*

## "MEHR VƏ MÜŞTƏRİ"

*Əsərin yazılma səbəbi*

Ağılları zayil edir bu zəmanə, bu dövran,
Cəhalətdir indi bizim yer üzündə hökmran.
Üz döndərmiş maarifdən sanki bütün insanlar,
Həyatı bir oyuncağa çevirmişdir nadanlar.
Allah özü köhnə paltar geyib gəlsə nəhayət,
Onu paxla qiymətinə almaz avam cəmaət.
Ya da qatır arxasına minərsə bir nərrəxər,
Yəqin onu hamı tutar Məsihayə bərabər.
Alim, fazil bu dünyada çəkər min cür əziyyət,
Ğidaları – ürək qanı, göz yaşından ibarət.
Xüsusilə şe'rə yoxdur bu cahanda e'tibar,
Yoxdur belə məta' üçün dövrimizdə xəridar.
Əzəl gündən şairləri bədbəxt etmiş bu fələk,
Ağladaraq, odlanırlar məclislərdə şamlar tək.
Üryan qalmış canlarına məhəl qoymaz bir kişi,
Can sapına od vurmuşdur ahlarının atəşi.
Qəlb oduyla canlarını əridərlər an bə an,
Dilləri də zərər verər özlərinə hər zaman.
Dillərinə bir yem olar bədənləri həmişə,
Can yanğısı yekun vurar gördükləri hər işə.

Bir tərəqqi xəyalıyla məclislərə gedərlər,
Lakin orda vaxt keçdikcə hey tənəzzül edərlər.
Hər alçağa bir yağlı dil töküb bir baş vuraraq,
Hər nakəsin qarşısında ayaq üstə duraraq,
Dəm vurarlar gündüzləri ülviyyətdən, nəhayət,
Gecələri borclular tək hey çəkərlər xəcalət.
Şair namərd süfrəsinə işıq salan zamanda,
Ona gülüb, özü isə gizli-gizli yananda.
Öz dilindən oda düşüb əriyərkən o hər vəqt,
Başqasına ləzzət verər bu yanmaqla o bədbəxt.
Gecələri sübhə kimi oyaq qalıb ah çəkər,
Bir pərvanə arzusuyla, şam tək yanıb yaş tökər.
Xidmət üçün daim durar ayaqda, əl-sinədə,
Öz dilinin bəlasından can qurtarmaz yenə də.
Şairlərin bu halını görüb çəkdim xəcalət,
Gedib üzlət guşəsində tək oturdum nəhayət.
Tək qalmağa adət edib öz qəlbimlə danışdım,
Yavan çörək yeyə-yeyə öz süfrəmə alışdım.
Bir guşədə oturmağı xoş bildim hər büsatdan,
Nakamlığı kam bilərək əl üzdüm bu həyatdan.
Bir doğru söz görmədikdə hər söhbətdə, görüşdə,
Dilsizliyi üstün tutdum gördüklərim hər işdə.
Ancaq vardı bir səmimi dostum, sadiq yoldaşım,
Mənim ağır günlərimdə hayanım, qəlb sirdaşım,
Bir xoş, tənha, xəlvət gecə gəldi mənim yanıma,
Günəş kimi bir hərarət verdi sanki canıma.
Bu sövdalı, həyəcanlı beynimə bir od vurdu,
Ürəyimdən qalcan odla xəyalımı doldurdu.
Dedi: "Dostum qəm çəkərək olma belə bədgüman,
Bir günahın yoxkən nədir qəlbində bu həyəcan?
Xalqın səni sevən zaman ona arxa çevirmə.
İlhamını bu üzlətdə soldurub bada vermə!
Zəmanədə bircə sənsən söz mülkünə hökmüran,
Heç yararmı verməyəsən xalqına bir ərməğan?
Bu gün sən'ət aləmində işıq verən günəşsən,
Öz qəlbinlə nəcabətilə ürəklərə bir əşsən.
Təb'in rəvan, diləyin xoş, sözlərinsə şirindir,

Bir əsər yaz ürəkləri işıqlandır, sevindir.
Sənin sehrin birləşdirmiş atəşlə su selini,
Bəs nə əfsun bağlamışdır indi sənin dilini?..
Öz qəlbinin nuru ilə məclislərdə şam yandır,
Aşiqlərin gecəsini bu işıqla nurlandır.
Ürəyinlə gecələrə işıq verə bilərkən,
Bəs nə üçün öz nurundan bizi məhrum edirsən?
Ürəyinin odu ilə ərisə də bədənin,
İşıqlanar qərinələr fikirlərinlə sənin.
Səndə sonsuz ləyaqət var, bacarıq var, sənət var,
Bu qüdrətlə məclisləri bəzəməzmi sənətkar?
Nə üçün sən bu üzlətdə üz çevirdin dövrana,
De nə üçün öz-özünü salmışsan bu zindana?
Nə üçün bir əsir oldun zəmanənin əlində,
Sən ki, ustad adlanırsan şairlərin dilində.
Bu daxmada gecələri girmə bağlı hasara,
Yoldaşlardan üz döndərib çəkilmə bir kənara!
Bu xəlvətdə öz-özünlə danışırsan durmadan,
Sənə baxıb qeyrətimdən oda düşüb yanır can.
Gecə-gündüz səni anıb mən yanıram şərərsiz.
Sənsə məndən gecə-gündüz qalmadasan xəbərsiz.
Sevdan ilə oda düşdüm, yanaraq külə döndüm.
Əvvəl qızğın atəş ikən indi gör necə söndüm?
Lakin yenə unutmadım səni təmiz ürəklə,
Yollarında bu canımı sürdüm min bir diləklə.
Bir nəfəsə bağlı qalan həyatımı sal yada,
Sabaha tək yaşamaqçın ümid varmı dünyada?"
Dedim: "Dostum ürəyimin yarasına vurma əl,
Sən də bir dərd artırma bu dərdlərimin üstə gəl,
Bəsdir daha bundan artıq incitmə bu qəlbimi,
Bədənimi oda salıb əritmə bir şam kimi.
Amansız bir hərarətlə tə'nə vurdun mənə sən,
Əl çək daha ürəyimi incidən bu tə'nədən.
Ey vəfalı dostum, yanma sən də mənim oduma,
Sakit burax ta ki, bir dərd olmayım öz dostuma.
Mən ki bir an içindəcə öləcəyəm qəflətən,
Bəs nə üçün çalışaraq düşüm yanlış yola mən?

Həyatında hər kəs ümid etsə bir boş xəyala,
Yəqin ki, öz həyatını uğradacaq zəvala.
Azalmağa başlayırsa bədəndəki hərarət,
Nəvaziş və ehtiramla verilər ona qüvvət.”
Birdən sözü dəyişdirdi o mahir söz ustadı,
Bir mətləbdən başqa mətləb üzərinə adladı.
Dedi: “Gizli xəzinədir sözlərində məlahət,
Mə’naların açarıdır səndəki bu fəsahət.
Sən gəl indi bu guşədə otur bir məsnəvi yaz,
Sənin kimi bir bülbülə axı susmaq yaramaz.
Nə olar gəl eşqə dair yarat elə bir dastan
Ki, məhəbbət atəşilə cuşə gəlsin hər insan.
Öz qəlbinin odu ilə yarat elə bir əsər
Ki, heç zaman unutmasın səni gələn nəsillər”.
Ona dedim: “Xoşdur dostum verdiyin bu nəsihət,
Bədənimə bir ruh kimi həyat verdi bu söhbət.
Lakin işlər nizam tapar iş buyuran olarsa,
İş görülər əgər işə qabil bir rəhbər varsa.
Kim görmüşdür axar susuz işə düşsün dəyirman,
Kim görmüşdür ki, çalğısız rəqsə gəlsin bir insan?
Şe’riyyətin gəlininə deyilməkçin afərin,
Əvvəl onun camalına yaraşıqdır toy, kəbin.
Lakin Təbriz şəhərində sözün yoxdur dəyəri,
Bu bazarda sən’ət üçün tapılmaz bir müştəri.
Ənvərinin özü əgər olsaydı bu məkanda,
Onun üzü, Qətran kimi, qaralardı bir anda.
O gündən ki, təbiətin anasından doğuldum,
Bir hörmətə çatmaq üçün çox çalışdım, yoruldum.
Əyilmədim bir kəsə mən, pozulmadı vüqarım,
Öz rəncilə həyat sürmək oldu mənim şüarım.
Bəsdir mənə kəramətli Allahımın ne’məti
Ki, boynumda yoxdur mənim bir adamın minnəti.
Bu dərdlərə razılıqdan yaxşı dərman tapılmaz,
Bir cəvahir xəzinədən daha qiymətli olmaz”.
Cavab verdi: “Bir əyrilik görürəm avazında,
Bir bəhanə nəğməsini çalırsan öz sazında.
Boş təvazö’nəyə lazım e’tirazə yer varmı?

Məgər günəş camalını pərdələmək olarmı?
Sən şahlara yazdın sonsuz qəsidələr, mədhlər
Ki, hər beyti yüz kitabın mə'nasına bərabər.
Öz təb'in, öz ilhamınla inci deşdin çox mahir,
Divanın bir xəzinədir içi dolu cəvahir.
İndi də gəl bir guşədə boş uzanma dur otur,
İlhamının qüdrətilə şe'rə min-min bəzək vur".
Yenə dedim: "Əziz dostum, ey vəfalı, mehriban,
Bu sən'ətdə əziyyətlər çəkmişəm mən çox zaman.
Bilirəm ki, İsa dəmli böyük şair Nizami,
Bu üslubda xətm elədi hər sözü, hər kəlamı.
Məsnəvidə o misilsiz incəliklər yaratdı,
O ustadın məharəti məsnəvini ucaltdı.
O təfəkkür meydanında at oynadan zamanda,
Fələk özü geri qaldı şairdən bu meydanda.
Onun təb'i mö'cüzələr yaradarkən sahir tək,
İdrak onun qarşısında durdu tə'zim edərək.
Misilsizdi xəyalının yaratdığı hər əsər,
Allahın öz vergisiydi Nizamidə bu hünər.
Bu sən'ətdə bir söz varsa Nizamiyə məxsusdur,
Başqa sözlər əfsanədir, solğun, cansız, ruhsuzdur.
O şairin hər kəlamı bir hikmətdir, mətindir,
Ona qarşı dura bilib bir söz demək çətindir.
Cəsarətim çatmır durum Nizamiyə müqabil,
Buna görə ürək edir başqa yola təmayil".
Dedi: "Qane etməz sənin bu sözlərin heç kəsi,
Səhlənkarlıq ağacının kafərlikdir meyvəsi.
Söz mülkündə şirin dilli bir natiqkən olma lal,
Söz və sən'ət meydanında bir üstünlük ələ al.
Fəzilətin qumaşını açıb göstər aləmə,
İncə şe'r gəlininin camalını gizləmə.
Əgər şüur bədəndirsə, şe'rin ona bir candır,
Ruhdur sənin şe'rlərin, onun cismi cahandır.
Sən Əssarsan yağlı, şirin sözlərinlə an bə'an,
Bu dünyanın süfrəsinə halva gətir ərməğan.
Bu sözləri eşitmişəm daim sənin özündən,
Mən sənəti dərk etmişəm sənin hər bir sözündən.

Demişsən ki, çox kamildir o şair, o sənətkar
Ki, incilər deşə bilsin təb'indəki iqtidar.
Şe'rin hər bir növində o göstərərək məharət,
Mə'na dolu əsər yazsın, hər sözündə hərarət.
Sən ki, belə bir şairsən, aləm sənə peyrəvi,
Kitabında yoxdur ancaq bircə növi' məsnəvi.
Gəl indi də bu səbkidə özünü et imtahan
Ki, onunla tamam olsun yaratdığın bu divan".
Gördüm onun sözlərində rədd edilməz məntiq var,
E'tirazə yer yox idi, həqli idi aşikar.
Dedim: "Dostum, mən razıyam, e'tirazım yox buna,
Qədəm qoydum məsnəvilə söz yaratmaq yoluna.
Pərdəsindən çıxan zaman şe'riyyətin gəlini,
Öz hüsnüylə kəsər yəqin bədxahların dilini.
Açıb dedim eşitdiyim bir mövzunu nihayət,
Ona "Mehrü Müştəri"dən etdim çoxlu hekayət.
Dedim – təmiz bir məhəbbət dastanıdır bu dastan.
Şəhvət hissi qarışmamış bu sevgiyə heç zaman.
Be sevdanın havasında yoxdur riya qubarı,
Onda qanat çala bilməz həva-həvəs quşları.
Saf eşqdən, məhəbbətdən bəhs edən hər süxənvər
Şəhvət ilə dolu hissə neçin sevda dedilər?"
Sona qədər bu dastanı nəql etdim bir xoş səslə
Dilə gəlib dostum, məni təbrik etdi həvəslə.
Dedi: "Bəh-bəh çox maraqlı bir dastandır bu dastan,
Lakin məni bir məsələ edir xeyli nigəran:
Bu dastanda başdan-başa qəm var, qüssə, kədər var,
Söz burada bəndə düşər, büdürəyər sənətkar.
Möhnət ilə saf məhəbbət sığışarmı bir yerə,
Heç xurma da qanqal ilə qarışarmı bir yerə?
Söz də mey tək nəş'ə verən olmalıdır əl-əlbət
Ki, hər kəsin ürəyinə versin sevgi, hərarət.
Söz bağında gül açarsa gülər daim xoş bahar,
Gözəllərin yanağı da qızıl güldən rəng alar.
Toydan söhbət gedən zaman nur saçılar gözlərdən,
Matəmlərdən söz açılsa qəm tökülər üzlərdən.
"Xosrov-Şirin" dastanına bir dəm nəzər salaraq,

Sonra da bir "Leyli-Məcnun" dastanına dönüb bax.
Bu misilsiz dastanlarda fərqi görüb al ibrət,
Sənə doğru yol göstərir onlardakı ziddiyyət".
Ona dedim: "Sözlərində, şübhəsiz ki, həqlisən,
Xatirimə bir neçə şey gəldi bu xoş söhbətdən:
Biri budur ki, söz bilən, məharətli sənətkar,
Zərif mə'na yaratmanı hər üslubda bacarar.
Söz sehrilə, qəm pərdəsi arxasından hər zaman,
Cilvələnər gülərüzlü, xumar gözlü min canan.
İkincisi – hikmətli söz rast gələr bir təzada,
Çünki qəmlə fərəh daim bir yerdədir dünyada.
Eşq odur ki, ariflərin nəzərində solmasın,
Ortalıqda heyvan kimi şəhvət hissi olmasın.
Hər təriqət sahibinə bəllidir bu həqiqət
Ki, varlığın Ceyhununa körpü salar məhəbbət.
Öz sözüylə könüllərə açar saldı Nizami,
Ona baxıb çox şairlər eşqi tutdu kilami.
Çox əsərlər yazıb onlar səpdilər bu cahanda,
Lakin təmiz "eşqnamə" yazmadılar bir an da.
Qələm çaldı həva-həvəs yollarında hər ustad,
Buna görə əsərinə "həvəsnamə" qoydu ad.
Təmiz və saf məhəbbətə zəval yoxdur heç zaman,
Şəhvət fili bir zərbilə əzər eşqi durmadan.
Eşqin şahı qoşununu itirərsə dünyada,
Ürəklə can binasını uçurub verər bada.
Şəhvət ruhu yerə çırpar, ədaləti məhv edər,
Ülviyyəti duymaq olmaz bir kimsəyə müyəssər.
Hər özündən dəm vurana canan eşqi nə layiq,
Çünki onu öz kamına aşiq bilər xəlayiq.
Hər kəs olsa özünə xoş ruzigarın aşiqi,
O özünün aşiqidir, deyil yarın aşiqi.

* * *

Cahana bax cismdir o, məhəbbət ona candır,
Fələk topdur, eşqin hökmü onu vuran çovkandır.
Pak və təmiz məhəbbətin vardır bir çox məqamı,
Hər məqamda sədaqətin bir nişanı məramı.

Əvvəlinci məqamda var iradəyə e’timad,
Bu mənzildən doğar daim səadətə e’tiqad.
Sonra həvəs, ondan sonra sən’ətinə məhəbbət,
Şübhəsiz ki, bunlar verər yar eşqinə dəyanət.
Sonra gəlir səmimiyyət, ondan sonra düz ilqar,
Aşiq daim olmalıdır ilqarına vəfadar.
Öz kamını unudaraq coşmalıdır qəlbdə qan,
Öz canını yar yolunda verməlidir o qurban.
Bu yollardan keçə bilən alar bütün dünyanı,
Bu mənzildə təxtə çıxar eşqin böyük soltanı.
Bu mə’nada çox söz demiş hikmət əhli hər zaman,
Şərh etmişlər təmiz eşqi əsərlərdə firavan.
Biri demiş o soltandır, qəhredici hökmü var,
Bu Soltanın fərmanıyla ürək olar tarümar.
Soltan Mahmud gücündən də çoxdur onun qüdrəti,
Hər Soltanı bir qul edər onun qadir hikməti.
Ürəklərin me’marıdır, əgər bilmək istəsən,
Hər arzunu istəyirsən məhəbbətdən istə sən.
Biri demiş əbədiyyət mənzilinə ilhamdır,
Biri demiş doğru yola işıq salan bir şamdır.
Bu barədə hər alimin bir fikri, bir zikri var,
Hər biri öz fikrini bir cür etmiş intişar.
Mən onların hamısını burda yazmaq istəsəm,
Bu dastanı yazmaq üçün gücsüz qalar bu qələm.
Lakin bütün fikirlərdən yaxşı demiş peyğəmbər,
Təmiz eşqin barəsində dil açarkən bir səhər.
Demişdir o, fələklərdə ruhlar pıçıldaşanda.
Yaranmışdır Sevda, Sevgi, Məhəbbət bu cahanda.
Əgər bu hiss enməsəydi aləmə o xilqətdən,
Yer üzündə iz olmazdı məhəbbətdən, ülfətdən.
Aşiqlərdə baş verən bu şeydalıqlar, bu cəlal,
Adətlərə sığışmayan hər qəribə nadir hal.
Ülviyyətdən gələn hissi etmədədir hekayət,
Onu sonra söz bilənlər eylədilər rəvayət.
Söylədilər aşiq-mə’şuq dastanını ürəkdən,
Bir yerdə can verənlərdən, təmiz və saf diləkdən.
Hər aşiqin əhvalını şərh eləmək çətindir,
Hər birinin fəlsəfəsi, hikməti çox dərindir.

Əcəl mənə aman versə əgər bir az ölümdən,
Sizə dastan söyləyərəm hikmətlərlə dolu mən.
Ki o məndən sonra uzun qərinələr yaşayar,
Bu dünyaya ilhamımdan qalar ölməz yadigar.
Əssar, bəsdir, vaxt itirmə bu sözlərdən gəl əl çək,
Sərraflara xoş görünməz boş ibarə söyləmək.
Yaxşıdır ki, eşqə dair yarat elə bir əsər,
Elə nadir bir əsər ki, dillərdə olsun əzbər.

## MEHR VƏ MÜŞTƏRİNİN BİRGƏ DƏRS OXUMASI

Ey könül, sən tamam bildin elmdəki hikməti
Ki, qaldırdın yüksəklərə bayraq kimi sən'əti.
Mə'naları dərk edənə elmin özü sübatdır,
Diqqət etsək elmü əməl əsil abi-həyatdır.
Hər kəsin ki, bu ne'mətdən bir azacıq payı var,
O bilir ki, cəhl ağacı ancaq ölüm verər bar.
Belə dedi hikmətlərdən xəbər verən bir fazil:
Məntiq ilə hikmət öyrən, hər bir gizli sirri bil!
Mehr şahlıq səmasında günəş kimi gözəldi,
Bəxtiyarlıq üfüqündən tülu' edib yüksəldi.
Gündən-günə artdı onun əzəməti, cəlalı,
Qabiliyyət zirvəsinə qalxdı onun kəmalı.
Görən kimi onda böyük ləyaqət var, ağıl var,
Hünərməndlik tə'liminə qərar verdi hökmdar.
Ölkəsində vardı kamil, fəzilətli bir ustad,
Hər bir elmə vaqiflikdə çıxarmışdı böyük ad.
Fərman verdi də'vət olsun saraya o durmadan,
Ona xəl'ət, hədiyyələr verilsin bol, firavan.
Müəllimi gətirərək şaha təqdim etdilər,
Şəhzadəylə Müştərini ona təslim etdilər.
O möhtərəm müəllimə, adlı-sanlı ustada,
Tapşırdılar uşaqları, alışdırsın həyata.
Uşaqların tə'liminə başladı o durmadan,
Açdı bilik qapısını üzlərinə mehriban.

Onlar dərsdən zövq aldılar ləyaqətlə hər səhər
Bilikləri hifz olundu hər gün birə on qədər.
Fəzilətin xəznəsinə idrakları nur saçdı,
Hər birisi bu nur ilə işıqlandı, dil açdı.
Onlar bilik səmasına yüksəldikcə an bə açdı.
Onlar bilik səmasına yüksəldikcə an bə an,
Hər tərəfdən günəş doğdu işıqlandı asiman.
Qızğın işin sayəsində ürəkdən qəm silindi,
Sərf-nəhvin qanunları getdikcə çox bilindi.
Sonra idrak gözlərini onlar daha açaraq,
Bir-bir bütün elmlərə göstərdilər çox maraq.
Zəmanədə maarifin hər növindən alıb pay,
Bir-birilə yarışırdı hər işdə o iki ay.
Pəri üzlü Mehr, hünər meydanında çapıb at,
Bilik, ədəb, təvazödə hər görəni qoydu mat.
Nə zaman ki, kağız üstə gözəl xətlər səpərdi,
Qələm kimi ağıl onun əllərini öpərdi.
Onun xətti ürəklərə güc verərdi hər zaman,
Yaqut onun xətti ilə kəsb edərdi rəngü can.
Yazan dəmdə süls, tovqi’, nəsx, rüqa’, reyhani,
Şərh edərdi hər birində incə dərin mə’nanı,
Bədaye’dən, fəsahətdən rəvan fikir söylərdi,
Maanidən, bəyandan da yaxşıca baxəbərdi.
Üsul, hikmət aydın idi onun hər bir sözündə
Hey’ət, nücum, elmləri əks edərdi üzündə
Hər kəlamı sərrast məntiq əsasında qururdu,
Hədisləri şərh etməyə min cür bəzək vururdu.
Sərfi-nəhvi, fiqhi, tibbi söyləyəndə ustada,
Onun kimi bir tələbə tapılmazdı dünyada.
Musiqi, saz, kaman, inşa aləmində mahirdi,
Ədəbiyyat qismətində iste’dadlı şairdi.
O səxavət şahmatında mat edərdi Hatəmi,
Qəhrəmanlıq nərdində də mars edərdi aləmi.
Tarixdən o öz dövründən söz açdığı zamanda,
Səyridərdi öz atını səvari tək meydanda.
Az müddətdə göstərdi o elə böyük şücaət
Ki, dillərdə dastan oldu şöhrəti binihayət.

Xudavəndin belə imiş əzəl gündən nəzəri
Ki, Mehrilə bir məktəbdə dərs oxusun Müştəri.
Hər ikisi tə'lim aldı bir cərgədə mehriban,
Öyrəndilər hər bir elmi bir ruh kimi iki can.
Bir məclisə işıq verdi öz nurilə iki şam,
Bir atəşlə odlandılar onlar hər gün, hər axşam.
Müştərisə Mehri daim daha üstün sanırdı,
Onun qəlbi bu atəşdən daha qızğın yanırdı.
Beyni cuşə gəlirdisə ürəyinin odundan,
Ancaq dili könül sirrin açmayırdı heç zaman.
Onun ürək badəsinə sevgi meyi dolmuşdu,
Sanki xumar gözlər kimi meydən sərxoş olmuşdu.
Hər dəm onu dəniz kimi qərq edirdi kədəri,
Bu məqamda özündən də xəbərsizdi Müştəri.
O qədər o, Mehrə yaxın hiss edirdi özünü
Ki, nə iman, nə küfrü ar bağlayırdı gözünü.
Eşq olsun o sevgiyə ki, ürəkdən məst olaraq,
Yırtar varlıq pərdəsini fikrə verə təmtəraq.
Hiylə, riya şişəsini çırpa daşa durmadan,
Xilas edə idrakını hər bir hiylə, riyadan.
Əldə tutsa hər kəs möhkəm səmimiyyət bayrağı,
İpə keçməz, şübhəsiz ki, arzusunun ayağı.

## HACİB ÖZ OĞLU BƏHRAMI ŞAHA TƏQDİM EDİR Kİ, MEHRƏ GÖZƏTÇİ OLSUN

Şahın yaxın bir hacibi vardı arsız, bihəya,
Onun paxıl ürəyində gizlənmişdi min riya.
Qaşı çatıq, gözü batıq, eybəcərdi surəti,
Zahirindən daha pisdi daxilində xisləti.
Hacibin bir oğlu vardı daha rəzil, hiyləgər,
Adı Bəhram, Keyvan kimi şüümsüzdü o bifər.
Dövran kimi vəfasızdı, fələk kimi qəddardı,
Fitnəkar və böhtançıydı, vəhşi kimi xunxardı.
Divlər kimi insan əti yeməyə o hərisdi,

Bəd nəzərdi, ürəklərə ağrı salan xəbisdi.
Mərəz kimi cansıxıcı, nəbz kimi aldadan,
Ya da canı təhlükəyə salan mənfur sərətan.
İlan kimi zərərliydi, əqrəb kimi kinəvər,
Donuz kimi alçaq idi, tülkü kimi hiyləgər.
Hacib onu Şapur şaha təqdim edib, əydi baş
Öpdü təxti, dizə çökdü, göz oynatdı, atdı qaş.
Min bir hiylə işlədərək yağlı-yağlı dil açdı,
Hər pərdədə min bir hava çalıb qəsdə yol açdı.
Dedi: "Şahım icazə ver qaldırım bir pərdəni,
Gecə-gündüz xeyxahın, sadiq qulun bil məni.
Ayağına üz sürtmüşəm, baş qoymuşam yolunda,
Bir gözətçi kəsilmişəm daim sağ və solunda.
Sənin lütfün hər bir zaman mənə vermiş təzə can,
Pay almışam bu həşmətli, göy calallı qapından.
İcazə ver ki, Bəhram da mədrəsəyə qoyulsun,
Şahzadənin qulluğunda, ona sadiq qul olsun.
Bir addım da ayrılmadan, olsun onunla həmdəm
Ki, sıxmasın şahzadənin ürəyini kədər, qəm".
Şah görüncə bu təklifi öz rə'yinə müvafiq,
Günəş üzlü Mehrə bildi Əhriməni o layiq.
Lakin Şapur xəbərsizdi oyunundan fələyin.
Bilməyirdi nə fitnələr törədəcək bu ləin.
Dedi: "Yaxşı qoy bu gündən oğlun Bəhram hər zaman,
Olsun Mehrin hər işində ona məhrəm, pasiban".
Hacib şahdan bu fərmanı eşidəndə oldu şad,
Qaşlarından düyün qaçdı, nəfəs aldı şən, azad.
Bundan sonra Bəhram oldu Mehrə sabit pasiban,
Bütün günü bir an belə ayrılmadı yanından.
Hansı güldür ki, olmasın tikan onun həmdəmi,
Nə möhrədir ki, olmasın ilan onun məhrəmi?
Zəmanənin ifritəsi süt verməz bir cocuğa,
Ta ki, onun al-qanını tökməyincə tuluğa.
Bu süfrədən yeyə bilməz kimsə bircə duz-çörək,
Onun incə dişlərini sındırmasın bu fələk.
Xoşdursa da yar əlindən badə alıb güləsən,
Ancaq hicran əzabı da ardınca var, biləsən!

## BƏDRİN MÜŞTƏRİYƏ TAPŞIRILMASI

Vəzirin bir dostu vardı, hər bir işdə hayandı,
Onun təmiz sədaqəti səhər kimi əyandı.
Bədr adlı bir oğlu vardı on dörd günlük ay kimi,
Ona görə Bədr olmuşdu adı, özü səmimi.
Himməti çox böyük idi yaşı kiçik olsa da,
Belə zirək və şüurlu az tapılar dünyada.
Tərbiyəsi çox gözəldi, təvazökar, üzü şən,
Bütün gözəl xasiyyətlə olmuş idi müzəyyən.
O da oldu müştərinin gecə-gündüz sirdaşı,
Mədrəsədə dərs zamanı otururdular yanaşı.
Günəş üzlü Mehr ilə də çox yaxındı Müştəri,
Bir atəşlə qızışırdı bu dostların qəlbləri.
Qələm kimi süzülürdü başlarından min istək,
Ürəkləri bir nöqtədə pərkar kimi sərgərdan,
Tumar kimi qıvrılırdı onlar qəmdən, hicrandan.
Dəvat kimi ləblərini qaraldardı hirs, qəzəb,
Sevda ilə beyinləri olmuş idi mürəkkəb.
Mədrəsədə birgə tə'lim alırdılar o güllər.
Bir gülşəndə uçurdular bu xoş səsli bülbüllər.
Otururdu o, Mehr ilə iki gül tək üzbəüz,
Tikilirdi məhəbbətlə bir-birinə iki göz.
İşarəylə danışırdı iki təmiz yar-yoldaş,
Etmirdilər qəlb sirrini xəyanətkar gözə faş.

## BƏHRAMIN HİYLƏ QURMASI

Hacib oğlu hiddətləndi bu dostluğu bilərək,
Ürəyində coşdu kini, qəlbi yandı kürə tək.
Bu dostluqdan yara dəydi ürəyinə, müxtəsər –
Öz-özünə çox düşündü, qurdu min cür hiylələr.
Dedi, gərək mən bu işdə çox sərt olam, şübhəsiz,
Elə pozam bu dostluğu ki, qalmasın ondan iz.
Mən onların işlərini elə rəngə salaram,
Ki, eşidən heyrət etsin, mən də alım intiqam.

Müştərini məhv eləyər quracağım bir tədbir,
Lakin məni çəkindirir hörmətilə baş vəzir.
Yox, yox gərək mən çox incə hiylə quram əl-əlbət,
Bu oyunda işlədəm çox incə, böyük məharət.
Müəllimin qəlbi sadə, ayna kimi saf, təmiz,
Onu gərək inandıram sözlərimə şübhəsiz
Baş tutarsa bu yol ilə mənim hiyləm, kələyim,
Hasil olar nəhayətdə arzum, qəsdim, diləyim.
Müəllimə bağışlaram töhfə kimi simü zər,
Olar onun köməyilə istədiyim müyəssər.
Əgər ona bəyəndirsəm öz fikrimi nəhayət,
Mən günəşdən bac alaram gülər mənə səadət.
Xülasə, o ehtiramla müəllimə yanaşdı
Xəlvət yerdə yavaş-yavaş ona gizli sirr açdı.
Dedi: "Sənin xidmətində ay halqalı qulamdır,
Ruhun işıq mənbəyidir, qəlbin səssiz kəlamdır.
Sənin rə'yin ölüyə də "yaşa" desə, o yaşar,
Tuti sənin rə'yin ilə insan kimi danışar.
Sənin təb'in küdurətdən təmizdir bir ayna tək,
Bu aynaya hər kəs baxsa öz eybini görəcək.
Cənabına çox aydındır mənim sonsuz hörmətim,
Birüzlüyəm, sözlərimdə yoxdur özgə niyyətim.
Nöqsanı sən ləğv edərsən, sənsiz heç bir iş aşmaz,
Səndən gizli bir iş tutmaq şagirdlərə yaraşmaz".
Ürəyi saf müəllim də cuşə gəlib bu sözdən,
Dedi: "Fikrə düyün vurma, açıq söylə sözü sən.
Nə hadisə baş vermişdir, çəkinmə de, qoxmadan,
Ta ki, qalxsın ortalıqdan hər çətinlik, hər nöqsan.
Əgər təmiz ürəklisən aç sirrini söylə bir,
Qoy qalmasın ürəyində səni əzən gizli sirr".
Daş ürəkli Bəhram dərhal incə kələk quraraq,
Sözlərinə bəzək vurdu yaratmaqçın çox maraq,
Dedi: "Yalan desəm mənə qənim olsun kirdigar,
Gizlətmədən deyəcəyəm sənə bir-bir nə ki var.
Bilirsən ki, Şapur şahın bircə oğlu Mehrdir,
Ancaq onun varlığıyla nəfəs alıb, fəxr edir.

Ancaq onun camalında görür cümlə cahanı
Onsuz olmaz nə qərarı, nə şöhrəti, nə şanı.
İndi Mehri təsxir etmiş vəzir oğlu Müştəri,
İstəyir ki, gecə-gündüz onda olsun nəzəri.
Hey əlləşir hər məqamda ona etsin nəzarət,
Bilməyir ki, beləliklə törədəcək fəlakət.
Şuxluq ilə əl çəkməyir, hey sitallıq göstərir,
Etmək istər daim onu öz əlində dəstgir.
Belə getsə Mehri yəqin dərsdən geri salacaq,
Nəhayətdə Mehrin dərsi nəticəsiz qalacaq,
Bunu indi hamı bilir, pıçıldaşır hər görən,
İstəmirəm bu səbəbdən sən xəcalət çəkəsən.
Mehrin başı qarışacaq boş işlərə ol agah,
Bir gün əgər bu işlərdən xəbər tutsa padişah,
Sənə böyük cəza verər, məhv olaram onda mən,
Sonra gərək baş götürüb qaçam bütün ölkədən.
Əhvalatı şahdan gizli tutmaq deyil məsləhət,
Xəlvətcə tez öz fikrini şaha çatdır əl-əlbət.
Müştərini tənbəl kimi qələmə ver birtəhər,
Bil şahzadə geri qalsa, sənə cəza verilər.
Gəl bu sözü qoz içi tək çıxart indi qabıqdan,
Ta ki, sabah çəkməyəsən bu əməldə sən ziyan.
Ağıllılar isti ikən dögərlər bil dəmiri.
Hüşyar olan vaxt itirməz icrada bir tədbiri.
Şapur sənə bir alim tək inanmışdır xəzinə,
Məsələni açıq de şah qiymət versin sə'yinə.
Müəllimin ürəyinə tə'sir etdi bu sözlər,
Müştəriyə qarşı onu dəyişdirdi bu xəbər.
Bu hiyləyə aldandı o qəlbi təmiz müəllim,
Düşündü ki, sussam sonra Şapur olar düşmənim.
Hiddətindən, qəzəbindən sir-sifəti saraldı,
Xəyalının tüstüsündən qəlbi, beyni qaraldı.
Dedi qurnaz Bəhrama: "Get – arxayın ol büsbütün,
Şaha bunu çatdıraram yəqin bil ki, haman gün.
Neçin oğlu geri qalar dərslərdən qoy bilsin şah,
Qoy görməsin sabahkı gün müəllimdə bir günah".

## MÜƏLLİMİN ŞAHI XƏBƏRDAR ETMƏSİ

Axşam günün aynasını aldı ələ asiman,
Saldı gecə zülmətinin qutusuna durmadan.
Qaş qaraldı, müəllimsə tez saraya yollandı,
Hüzurunda Şapur şahın çox ədəblə dayandı.
Öpüb yeri tez başladı əvvəl şahı duaya,
Ondan sonra şüru’ etdi sonsuz mədhü sənaya.
Dedi: “Şahın bəxti gülsün, yarı olsun səadət,
Tacü taxtı möhkəm olsun yaşasın şən, səlamət.
Tə’xirsiz bir məsələ var etmək lazım onu həll,
Şah icazə versə əgər söyləyərəm müfəssəl.
Xəlvət olsa məclis əgər söhbət daha xoş olar,
Daha geniş şərh edərəm məsələni aşikar”.
Bu sözləri eşidə də maraqlandı padişah,
Əmr elədi hamı getsin xəlvət olsun barigah.
O sadədil müəllimə dedi: “Buyur sirri aç,
Gizli qalan xəstəliyə çünki olmaz bir əlac”.
Həvəsləndi müəllim bu iltifatdan, açdı dil,
Tuti kimi təkrar edib eyni sözü dedi: “Bil
Padişahın kərəmindən pay almışam mən hər vəqt,
Ola bilməz xidmətində indi çəkim xəcalət.
Bircə zərrə səhvim olsa qoy adlanım günahkar,
Xain bilib qoy qətlimə fərman versin hökmdar.
Böyük şaha bu aydındır, işdə yoxsa ciddü cəhd
Gözlərə nur dolmaz əsla, işıqlanmaz fəzilət.
Ancaq səyü ehtimamla gülər elmin gəlini,
Bilik layiq olanların tutar möhkəm əlini.
Çalışmayan ən sadə bir məsələni anlamaz,
Bilik əmək tələb edir, tənbəl bilikli olmaz,
Müştəridə mən görmürəm dərsə həvəs, ciddiyyət,
Onda yoxdur bilik üçün ən azacıq ləyaqət.
Vaxtlarını boş keçirir, işi ləvhü ləəbdir,
Dərslərini hazırlamır, özü də biədəbdir.
Yoxdur onda nə oxumaq, nə də yazmaq həvəsi,
Fəzilətdən yoxdur onun bir azacıq bəhrəsi.

Mədrəsədə işi ancaq Mehrə mane’ olmaqdır,
Mehri qoymur dərslərini təkrar edə, maymaqdır.
Şahzadəni özü kimi tənbəlliyə sövq edir,
Buna görə dərslərimiz günü-gündən pis gedir.
Mehrə baxsın o maşallah çox sahibi-kəmaldır,
Müştərilə yaxınlığı ona böyük zəvaldır.
Şah icazə versə əgər ayıraram onları
Ki, dəyişsin Mehrin bəlkə tə’lim üçün kirdarı.
Bundan sonra onlar gərək bir otaqda qalmasın,
Ta ki, heç vaxt aralıqda fitnə-fəsad olmasın”.
Bu sözləri eşidəndə şahın artdı qəzəbi,
İstədi ki, parçalasın dərhal o biədəbi.
Şahın özü dərrakədən kasıb, dayaz, nadandı,
Belə yalan səfsətəyə asanlıqla inandı.
O sadədil müəllim də gələcəkdən qorxaraq,
Bilə-bilə uydurmuşdu yalan sözlər, işə bax!
Hirsləndirib şahı getdi, Şapur şahsa qaldı tək,
Hiddətindən göz yummadı bütün gecə sübhədək.
Çox düşündü necə ölçü götürsün o bu işə,
Müəllimin sözü onu salmış idi təşvişə.
Fikr etdikcə artdı onun bədənində hərarət,
Qərar verdi Müştərini sürgün etsin nəhayət.

# DASTANİ-ƏHMƏD HƏRAMİ

(*parçalar*)

*XIII əsr anadilli poeziyamızın ən gözəl, mükəmməl abidələrindən biri olan "Dastani-Əhməd Hərami" poemasının müəllifi hələlik müəyyən edilməmişdir. Əsərin yeganə əlyazma nüsxəsini türk alimi Tələt Onay aşkara çıxarıb, 1928-ci ildə geniş ön söz, lüğət və şərhlərlə nəşr etdirmişdir.*

*Poema ikinci dəfə 1978-ci ildə Bakıda Ə.Səfərli tərəfindən nəşr olunmuşdur.*

## DASTANİ-ƏHMƏD HƏRAMİ

Bu dastanı bu gün bünyad edəlim,
Həqin qüdrətlərin biz yad edəlim.
Gəlin, ey mə'ni bəhrin seyr edənlər,
Bu dərya gövhərindən xeyr edənlər.
Mə'anidə qılı iki biçənlər,
Dilindən daima gövhər saçanlar.
Gəlin, barı bu gün söhbət qılalım,
Mə'ani kanının dürrün bulalım.
Anın birligini zikr eyləyə dil,
Xatırda qalmaya zərrəcə müşkil.
Zira kim dilləri söylədən oldur,
Anın hikmətləri qullara boldur.
Anın hikmətlərinə əql irişməz,
İşinə kimsənə hərgiz qarışmaz.
Anın keyfiyyəti bulunmadı hiç,
Məkanı qandadur bilinmədi hiç.
Nə zahirdir o kim gözdən iralmaz,
Nə batindür o kim hərgiz görülməz.
Anın əvvəlinin önü bulunmaz
Anın axırının sonu bulunmaz.

Nə dilim var anı şərh eyləyəm bən
Nə bilim var ki, şərhin söyləyəm bən.
Anın dil zikrini etmək gərəkdir,
Anın doğru yolun getmək gərəkdir.
Yüzüm qara, sözüm qısa, suçum bol,
Belim əgri, yolum doğru, boyum sol.
Şaşı baxdım, cüda düşdüm bən andan
Bənim halım necə olusər andan.
Qova-qova könül dünyaya irdi,
Ömür keçdi saqalı, saç ağardı.
Əbəs yerlərdə xərc etdim yaşım bən,
Yeridir daşlara dögsəm başım bən.
Həmin vardır ümidimiz səfadan,
Məgər mədəd irişə Mustafadan.
Ümidimiz iki aləmdə oldur,
Anın şəfqətləri qullara boldur.
Dökəli ənbiya "Nəfsi" deyisər,
O ümmətlərinin qeydin yeyisər.
Salam olsun anun yaranlarına,
Müdam rəhmət irişsin canlarına.
Əbubəkr, Ömər, Osman, Əlidir.
Eyi dirliklidir bunlar, vəlidir.
Bular tutmadılar kibrü, kinayət
Bular bildi nədir dinü dinayət,
Səfa xatirlər içində kin olmaz,
Kin olduğu könüllərdə din olmaz.
Sürəlim könlümüzdən kibrü, kini,
Yıxarlar kibr edənlər mülki-dini.
Gəl imdi Mustafaya ver səlavət,
Deyəlim necədir anla hekayət.
Eşit gəl bir Həraminin sözünü,
Əgər görür isən mə'ni yüzünü,
Olursa həqq-taaladan inayət,
Qılam bu qissəyə bir-bir hekayət.

Məgər kim ol zamanda bir Hərami,
Dərib döşürmüş idi çox hərami.
Özü gürbüzdürür ya'lak bahadır,
Bahadırlıq yolunda key bəhadır.
Bilirdi sehr elmindən bəğayət,
Hücum elmində də qadirdi qayət.
Gər əfsun oxuyub bir gəz ürəydi
Oluq dəm ayı gögdən endirəydi.
Əli Sina elmindən bilirdi,
Şəhabəddinə ol hizmət qılırdı.
Qılıc salsa bin ərə təpinəydi,
Qağan aslan kibi kim çapınaydı.
Demişlər adına Əhməd Hərami,
Çavı dolmuş idi ellər təmami.
Doquz kişi anın yoldaşlarıydı,
Dünü gündüz bilə haldaşlarıydı.
İgin gürbüzlər idi ol ərənlər,
Oları qan qaşanırdı görənlər.
Düraq edibdilər bir sərp arayı,
Oları kimsə varmaya arayı.
Ol aradan yolı kəsmişlər idi,
Ey neçə qafilə basmışlar idi.
Delim mal yığladılar anda olar,
Hesabı yoxc qumaşı, simü zərlər.
Gecə-gündüz şikar edərlər idi,
Gerü ol qalaya girərlər idi.
Buların çavı düşdi Ruma, Şama,
Kimsənə varmaz oldu ol məqama.
Çün on kişi bu hali böylə gördi,
Danışıq etdi, bir-biriylə oturdi.
Dedi Əhməd Hərami: ey yarənlər,
Mən eşitdim ki, Bağdadı görənlər,
Anın sultanın içən söylədilər,
Anın malın qatı vəsf eylədilər.
Gəlin, bundan biz enəlim Bağdadə
Şikar edə və key ərqun av edə.

Özümüz şəhr içində gizləyəlim,
O şahın xəznəsini gözləyəlim.
Kim ol sultanın adıymış Şəhinşah
İkən çox mali varmış oldum agah.
Kilidin açalım, malın alalım,
Cəhanda biz ana bir iş qılalım.
Bənim hər yerdə əfsunum yazılur,
Kilidlər açılır, qapu pozulur.
Nə durursuz, durun, bir-bir quşanın,
Nə qayırın, nə qorxun, nə üşənin.
Adıdır dünyada qalan kişinin,
Əgər erkək ola və gər dişinin.
Bular durı gəlib dedi ki, sərvər,
Can üstünə nə dersən, ey dilavər.
Xəzinə qapısın bərkitdilər xoş,
Tutub Bağdad yolunu getdilər xoş,
Tutub Bağdad yolunu getdilər xoş.
Düni günə qatıb bular çü getdi,
Beş-on gündə bular Bağdada yetdi.
Bir oda tutdular şəhrin ucunda,
İkən azadəvü qovğa yox anda.
Günüzin özlərin gizlərlər idi,
Dün olsa yolların gözlərlər idi.
Xəzinə qandalığın bildi bunlar,
Qolay yol nerdə isə buldu bunlar.
Oturdu ol gecə bunlar danışdı,
Qaçan kim dünün iki bəxşi keçdi.
Yerindən durdu ol Əhməd Hərami
Bilə yaranları düpdüz təmami.
Cəbə cövşən silahı geydi anlar,
Qəza yoluna qoyub başı canlar,
Xəzinədən yana əzm etdilər çün,
Kəmindən çıxub enib getdilər dün.
Gedərkən irdilər bir xoş araya,
İkən gökçək yapılmış bir saraya.
Yuca, möhkəm, lətif key toş yapılmış,
Zehi me'mar anı arəstə qılmış.
Füsuskari yapılmış anda hər daş

Qızıl altun sıvayla xoş münəqqaş.
Məgər sultan qızı, ol xub dilaram,
Gecə-gündüz qılırdı anda aram.
Bəğayət xub idi ol şahi-şəngül
Yüzü gül, sözü bülbül, saçı sünbül.
Güləndam idi ol nigarın adı,
Şəkərdən şirin idi sözü dadı.
Utanır inci dişi danəsindən,
Sədəf ağzındakı dür danəsindən.
Gümüşdür, tazə boyi billurə bənzər.
İki cadu gözü səhharə bənzər.
Anın kimi kimsənə görməmişdi,
Anı görən nişanın verməmişdi.
Yanar idi şəmidanı ilində,
Yazardı xət rəqəm tutmuş əlində.
Divani xət içində sehr edərdi,
O xətt içində yanı mehr edərdi.
Çıraq şövqü qamu pəncərələrdən
Saçardı şö'ləsin hər arələrdən.
Nə yerdə isə od pünhan degildir
Bular gizlənməgə imkan degildir.
Həramilər çün ol odu görürlər
Danışıban ol aradə dururlar.
Dedi Əhməd hərami: bən varayım,
Kiməsnə varmı bu köşkdə görəyim.
Kəmənd atdı yuxarı çıxdı ol dəm,
Görür kim oturur bir xubi-aləm.
Qələm əldə yazar yazı oturmuş,
Yüzündən gün kibi bürqə götürmüş.
Qaçan kim qızı gördü döndü getdi,
Yenə yoldaşları qatına yetdi.
Qızı ol urmadı hərgiz muhalə,
Yetişmədi anın fikri bu halə.
Dedi: yürün gedəlim, kimsə yoxdur,
Bilin kim fəthimiz bu yolda çoxdur.
Uruban lafı bunlar tədbir etdi,
Eşit təqdir işi anlara netdi.
Rəvanü çüst ol aradan getdilər,

Xəzinədən yana azim etdilər.
Güləndam sözlərini duymuş idi,
Əlindən qələmini qoymuş idi.
Şoluqdəm pəncərə dibinə vardı,
Kəmənd biği əgildi, baxdı, gördi.
Görür on kişi qatıraq gedərlər,
Xəzinədən yana azim edərlər.
Dedi: bunlar əgər bizdən olaydı,
Bu vaxtın qancəri seyran qılaydı.
Məgər bu kişilər xırsızmı ola,
Anın için düşüb gedər bu yola?
Şu gənc arslan kibi xubi-zamanə,
Qaqıdı xişm ilə oldu divanə.
Şoluqdəm belinə qılınc quşandı,
Bulardan qorxdu və nə heç üşəndi.
Bular çün xəznə qapusinə yetdi,
Yanınca bunların söyləyi getdi.
Bir əfsun oxudu Əhməd Hərami,
Xəzinə inlədi düşdü təmami.
Dükəli çünki açıldı qapular
Utalu-utalu çün getdi bular.
Taş eşikdə qərar etdi nigarın
Pənah etdi nədir gör intizarın.
Yalın eylədi ol hindi qılıcı,
Görün nə qılur ol fitnə qılıcı.
Gələlim biz həramilər sözünə,
Biləsiz anların fikri, sözü nə?
Xəzinəyə bular kim girdilərdi,
Qumaş, altunu aqca aldılardı.
Göhər, inci, əqiq, lə'li-Bədəxşan,
Qızıl, altun, cəvahir, dürrü mərcan.
Həzaran lövn-lövn əlvanlı daşlar,
Hesabsız dəxi altunü gümüşlər.
Gərəyincə bulardan aldılardı,
Gerü getməgə niyyət qıldılardı.
Sözə gəldi dedi Əhməd Hərami:
Qılın bir dəm, ey yoldaşlar, arami.
Durun bir danışıq var eyləyəlim,

İşimizin sonunu söyləyəlim.
Nə var tanrı bir isə iş ikidir,
Ölüm dedikləri sanma ikidir.
Məbada izimiz duyulmuş ola,
Yolumuz dörd yana qaplanmış ola.
Ol ucdan mənzilə irəməyəvüz
Ögümüz, usumuz dərəməyəvüz.
Nişanım dəbrənir dəkin degildir,
Bu gün damarlarım sakin degildir.
Birin-birin çığın taşra varınız
Olun hazır, yolunuzu görünüz.
Üçünüz, dördünüz taşra varınca,
Bu iş mə'lum olur bir dəm durunca.
Həm adəm səsinə urun qulağı
Gözədibən qılın hazır yarağı.
Anın kibi olursa yoğurun tez,
Bənə tezcək gəlin, xəbər verün tez.
Həzər eyləyəlim biz ol yağıdan,
Bənəm gürbüz yağıları dağıdan.
Bənim nə'rəmə kimsə durmaz irdi,
Necə kişilər ünümdən canı verdi.
Bular gərçi bu işi tədbir etdi,
Xuda gör kim necəyi təqdir etdi.
Həman ol birisinə kim buyurdu.
Yüzün qayırmadı qapıya sürdü.
Qapısının ikisin çıxdı əgildi,
Haman taş qapıda ömrü dağıldı.
Başın çıxardı, kim baxaydı andan,
Boğazından çalar ol güli-xəndan.
Fələk peymanəsin ol dəmdə içdi,
Başı uruldu anın taşra düşdi.
Biri dəxi irişdi ol şərabə,
Nə şərabdır ömür verdi xərabə.
Macal verمədi anı dəxi çaldı,
Həman dəm gögdəsindən başın aldı.
Qılınc ilə çün anı dəxi yıxdı,
Sürüdi gögdəsin taşra buraxdı.
Dəgər növbət yenə anın birinə,

Varır ol dəxi anların yerinə.
Hələ nə söz uzadayım, a sərvər,
Doquzunun başın kəsdi o dilbər.
Həman Əhməd Hərami qaldı anda,
Qalanı qərq olub yatırdı qanda.
Bu gəz ol dəxi qapıya yürüdü,
Qalan yoldaşların taşda sanırdı.
Qapının ikisin filhal çıxdı,
İrişdi taş qapıdan taşra baxdı.
Başın göstərdi, yenə çəkmiş oldı,
Güləndam ivmək ilə anı çaldı.
Təpəsinin saçını dərisilə
Qılıc yerə buraxdı silə-silə.
Yenə qaldırdı qılıcını çaldı
Çalamadı yoğurdu taşra gəldi.
Əlindən qurtulur Əhməd Hərami
Görür yoldaşları düpdüz təmami.
Nəzər qıldı qıza, gördü ki, qızdı,
Sarayda gördüyüdür, bildi, sezdi.
Eytdi kim, e qız, etdin bənə sən,
Əgər ölməz isəm edəm sənə bən.
Həman bunu dedi və döndü getdi,
Gerü, gəldigi yola azim etdi.
Güləndam dəng oluban batdı fikrə,
Həqə yüz tutdu, məşğul oldu zikrə.
Təəccüb eylədi bu işi gördi,
Dün içində əcayib sirrə irdi.
Dedi kim, ey kərim, qüdrət sənindir,
Təalallah, qamu hikmət sənindir.
Qılıcını silib qınına qatdı,
Sarayına gəlibən girdi yatdı.
O gecə sübhə dəkin qıldı təşviş,
Əcayib hal idi der bu olan iş.
Keçib ol dün yenə çün oldu gündüz,
Nur ilə doldu aləm yüzü düpdüz.
Qaçan xurşid ki, məşriqdən göründi,
Ulu dağlar qamu nur tac urundi.
Nura batdı qamu başdan başadək

Bu cümlə nə ki, qurudan yaşadək.
Yenə cünbüşdə oldu xəlqi-aləm
Qamu vəhşü tuyurü cinnü adəm.
Xəzinədar dəxi xəznəyə vardı,
Nəzər qıldı nə adam ki, nə gördi.
Qapısı xəznənin gördü açılmış,
Gümüş altun ki, yollara saçılmış.
Doquz kişi yatır başı kəsilmiş
Qılıcları sınıb yayı yasılmış.
Çü gördi bunları ol durdı getdi,
Şahənşah həzrətinə irdi yetdi.
Dedi bir-bir: necə gördisə halı,
Şahənşah danladı işbu xəyalı.
Dedi vəzirlərə: durun varalım
Necə haldır, nə başlardır görəlim.
Alıb vəzirlərini gəldi sultan,
Buları gördü tana qaldı sultan.
Xəzinədar malı dərdi və buladı,
Geri yerli yerincə şükri qıldı.
Dürüst gəldi malım hərgiz kəmi yox,
Qamu yerli yerincə əskiki yox.
Anı gördi yenə sultan açıldı,
Yürəgi tazələndi, su saçıldı.
Buyurdu qığırın eldəvü şərdə
Bulun, istən, aran əğyarü yarda.
Mənə bunun kimi lütf işləyən kim
Bu dənli xəznəyi bağışlayan kim.
Nə kişidir gətiriniz görəyim,
Nə dənli mal dilər isə verəyim.
Açıldı xəlq içində işbu dəftər,
Oxundu xəlqi-aləm qıldı əzbər.
Bulunmadı, bilinmədi bu müşkil
Ki, hərgiz həll olunmadı bu müşkil
Güləndam kimsəyə söyləmədi heç
Bu razı xalqa faş eyləmədi heç.
İkinci məclisə ağaz edəlim,
Yenə Əhməd Həramiyə gedəlim.

Qaçan kim ol zəxmli oldı, qaçdı,
Neçə dağlar, neçə səhralar aşdı.
Düni günə ulayıban gedərdi,
Anıb yoldaşlarını ah edərdi.
Der idi: qanı sevgili yaranlar,
Nər arslan kibi ol gürbüz ərənlər.
Əlimdən qafilin çıxdı nedəyin,
Avarə oldum uş qanda gedəyin.
Bir-iki gün qərar etdi, oturdu,
Görün fikrində nə nəsnə bitirdi.
Rəvan yenə yerindən uru durdu,
Satın aldıvü on atlar gətirdi.
Malın, gəncin dükəli anda dərdi,
O atlar üstünə cümləsin urdu.
Bəzirgan şəklinə düzdü özünü,
Krıma əzm edip duttu yüzünü.
Qumaş düzdü Krımda dürlü, əlvan,
Nə dürlü hiylə edər ol nətavan.
Dəlim oğlanlar aldı ay surətli,
Gözi nərgiz, yüzi gül, bay sirətli.
Dəxi aldı qızoğlanlar, xəlayiq
Huri sanır görən bunları bayıq.
Yarağın düzdü, qoşdu ol Hərami
Krımda qalmadı ayruq ərami.
Yenə Bağdada süvar oldu rəvanə
Qulaq ur billahi bu dasitanə.
Düni günə ulayıban gedərdi,
Bülammı qızı deyü fikr edərdi.
Məgər bir gün göründü şəhri-Bağdad
Gedərdi qayğısın oldu könül şad.
Gəlincə xocalar cavın eşitdi,
Qamu atlandı ana qarşı getdi.
İraqdan baxtılar bir toz göründü,
Havanın yüzü toz ilə büründü.
Dedilər kim bu nə çoxluq kişidir.
Bəzirganlıq çərinin nə işidir?

Məgər kim bu bir iqlimin bəgidir,
Sanırmısız bunu bizim biğidir.
Atın kişnəməsi və çan avazı
Dolu olmuş idi ol ulu yazı.
Xocalar endi[lər] atlı atından
Ki, bununla görüşmək niyyətindən.
Buların xatırıyçün ol da endi,
Görüşdi tez gerü atına mindi.
Qılıb mürvət xocayı gətirdilər
Qamusu ana qulluq yetirdilər.
Keçib Əhməd bıyıq burdu oturdu,
Oxudu ulularını gətirdi.
O şəhrin kətxudası dəxi belə
Bezestan kətxudası anın ilə.
Əlini aldı anların gətirdi,
Dil açdı, söylədi pərdə götürdi.
Şəhər kətxudasına der bilirvən,
Özün yaxşı kişi dövlət olurvən.
Gətirdim ərməğanlar xanə yəxşi,
Bular padişəhindürür bəxşi.
Danışıq eyləyəlim şah ilə biz
Yamanlaman bizi bilişdirin siz.
Yedi oğlan gətirdim aydan arı,
Yüzü güldür, şəkərdir ağzı yarı.
Yedi dəxi qızoğlanlar ay üzlü,
Dişi inci kibi, gül şəhd sözlü.
Yedi hindi qılıc, yedi gözəl at,
Yügürsə eyləyə karlanqıcı mat.
Həm üç gövhər gətirmişəm dəxi uş
Qəbul etsin ki, könlümüz ola xoş.
Sabahın xana səninlə varalım,
Mübarək yüzüni xanın görəlim.
Aytdı kətxuda danla gələyin,
Tapın nə kim buyurursa qılayın.
Bişirdi xoş təamlar həm buyurdu,
Qonuqluq etdi, anları doyurdu.
İçildi şərbət anda, yendi çün xon,
Ululara geyirdi xəl'ətü don.

Çün axşam irişbən gün tolundu,
Qamu dağlar başı yaxı qılındı.
Gögün üzünə yulduzlar saçıldı,
Dana yaxın yenə bir-bir açıldı.
Sabahın kətxuda qulluq yetirdi,
Xəbər Əhməd Həramiyə gətirdi.
Dedi: xoca, yaraqlanın gedəlim,
Buyur nə qulluğun varsa edəlim.
Ata atlanıb ol iki gönüldü,
Görəlim bu nəsib kimə sunuldu.
Dükəli ərməğanın aldı vardı,
Şahənşah eşigində gəldi, durdu.
Haman dəm kətxudası girdi şaha
Dedi bir-bir bunu ol padişaha.
Dükəli vəsfi padşah qıldı mə'lum,
Oxunuz anı dedi şahi-məxtum.
Görəlim kimdürür, nə xocadır ol
Ki, bənim eşqimə çəkmiş dəlim yol.
Çıxıb o kətxuda aldıvü gəldi,
Görüb sultan Həramiyi şad oldu.
Əlin öpdü şahın Əhməd Hərami,
Dəlim lütf ilə söylədi kəlami.
Bilgilərin bütün ərz etdi şaha
İkən xoş gəldi qayət padişaha.
Dedi gərçi sizə zəhmətlər oldu,
Vəlakin bizlərə rahətlər oldu.
Dedi Əhməd Hərami şaha: mütləq
Yer etdi eşqiniz canda mühəqqəq.
Sənin ədlini, insafın eşitdim,
Gönüldə mehrini canda iş etdim.
Dilərəm ki, duram qapında bən də,
Dəlim qul qapunuzdadur bəndə.
Qatı müştəq idim irdim qapında,
Gönüldən qul yazıldım uş tapında.
Bihəmdillah bu gün qapına irdim,
Sənin dövlətli yüzün şaha, gördüm.
Çün anı gördü şah xülqiylə söylər
Səxavü lütfü ədlin şərh eylər.

Qulaq urdu qapıldı sözlərinə,
Nə bilsin şah anın bu sirləri nə?!
Şunun kibi yer etdi şaha ol ər
Keçirdi yanına edindi sərvər.
Gönüldən eşq ilə key sevdi canı
Qomaz yanından ertə keçə anı.
Kişi könlündəkin kişi nə bilə,
Nə var içində məgər fitnə qıla.
Bir-iki gün bunun üstünə getdi,
Şahənşah gör necə bir tədbir etdi.
Vəzirləri ilə bir gün danışdı,
Dedi: şu xoca eşqi bana düşdü.
Bu dənli ki kərəmlər qıldı bana
Qızımı verirəm şükranə ona.
Bana bir qol-qanad olsun otursun,
Elinə getməsin, bənimlə dursun.
Vəzirlər məsləhət gördü sözünü,
Vəli bilmədilər mə'ni yüzünü.
Dedi soltan ki: bən bilməz olayın
Ana söylən, nədir fikri biləyin.
Mübarək dügün edib başlayavuz,
Ana görə işimiz işləyəvüz.
Bunun kibi danışıq eylədilər,
Məgər bir gün vəzirlər söylədilər.
Dedilər: xoca, sordu səni sultan
Ki, səndən gördi eylik, mürvət, ehsan.
Qızın istəyəlim almaq rəvamı?
Həlalın, xatunun olmaq rəvamı?
Dedi Əhməd Hərami: qatınıza
Qul olub durayım həzrətinizə.
Nə kim şəh der isə bən anə fərman,
Neçün yox deyəvən nə kim desə xan.
Qul oldum getməzəm qatından ayruq,
Müt'iyəm bana buyurursa buyruq.
Həraminin xod istədigi oldu,
Fələkdə istədigin yerdə buldu.
Cavabını anın çün aldı bunlar,
Genə sultan qatına gəldi bunlar.

Nə kim Əhməd Hərami dedi şahə,
Qamu ərz eylədilər padişahə.
Sevindi, aydır; imdi neyləyəlim
Hələ bir qıza dəxi söyləyəlim.
Nə dürlüdür anın gönlüm görəlim,
Bəs andan bu işə bünyad uralım.
Bir-iki xas xadimlər dururlar,
Duruban şah qızına göndərirlər.
Sarayında xadimlər durmuş idi
Xadimlər həm qapuya varmış idi.
Məgər xadimləri bir dayə gördü,
Xəbər ol dəmdə Güləndamə verdi.
Dedi: yaqutü gövhər lala, ey can
Durur qapıda, istər girə fərman.
Dedi: ol dayəyə ol dəm Güləndam,
Neçün qılır eşikdə anlar aram.
Alın gəlin oları der görəyim,
Nəyə gəldi xəbərlərin sorayım.
Həzaran üzrilə anlar oturdu.
Şoluqdəm mahəzər ne'mət gətirdi.
Bular xoni yeyib şükr eylədilər
Dua qılıb bu sözü söylədilər.
Dedi: mərcan, lala ey şuxi-şəngül
Ki, sənsən cənnətin bağında bir gül.
Atan verib idi biz qullarını
Xəzandan saxlasın haqq güllərini.
Şol ulu xoca ki, gəlmişdi bunda
Qatı hörmətlidir atan qatunda,
Atanız sizi ana veribəndir
Quzum dəxi nə der, bir görəyin der.
Budurur danışığı gecə-gündüz,
Rəva gördü ümidi dəxi düpdüz.
Buyur sən dəxi nə dersən görəlim,
Xəbər ver bizə şaha dəgirəlim.
Güləndam bu sözü bir-bir eşitdi,
Özünə ağlını bir-bir iş etdi.
Atdı: nə əcəb söz söylədiniz,
Bəni bunda qatı dəng eylədiniz.

Cahanda yoxmudur bir şahzadə
Ki, verirlər bəni bir xoryadə,
Nitə rəva görür heç anı barı
Ki, bir şahin ola qarqa şikarı.
Bu nə sözdür ki, söylərsiz qatımda
Vüqarım yoxmudur qeyri qapımda.
Bular aydır: ey məhbubi-zəmanə,
Yigidə kimsə bulumaz bəhanə.
Qağan arslan kibi yaxşı yigitdir,
Gözəldir, surəti, nəqşi yigitdir.
Yüzü gökçək, yerincə ağlı kamil,
Bin artuq qul qaravaş kəndinin bil.
Güləndam dedi ki, ey lala, dinlə
Sözümə görə bir iş et ki, anla.
Xəbər ver atama kim, anı alsın,
Bənim köşkümə yaxın qarşu gəlsin.
İraqdan göstərin anı görəyim
Ki, bən andan sizə xəbər verəyim.
Bular alqış elədi ikram etdi,
Güləndamın əlini öpdü getdi.
Geri sultan qatına irdi bunlar,
Güləndam xəbərini verdi bunlar.
Gələlim biz Güləndamın sözünə,
Nədir halı, nədir fikri, sözü nə?
Həzaran dürlü əndişə edərdi,
Müdam fikri həramiyə gedərdi.
Der idi kim, buları qırmış idim,
Birin öldürməyib qurtarmış idim.
Əcəbdir bu xoca degil isə ol,
Müdam sərimdə budur açılan yol.
Bu fikr ilə yedi qüssə nigarın,
Kişinin kim bilir gönlündə varın.
Keçibən ol gecə çün sübh oldu,
Durub Əhməd Hərami şahə gəldi.
Çü gəldi padişahın həzrətinə
Rəvan sultan süvar oldu atına.
Belə Əhməd Hərami bindi ata
Qızın köşkünə yaxın gəldi ata.

Birisi gəldi xadimlərin anda,
Anı göstərdilər ol xuni-baxta.
Əgilib baxdı köşkünün taşından
Bilir anı şoluqdəm cünbüşündən.
Dedi bunu: Bənə zinhar gərəkməz,
Kişi kəndi canın oda buraxmaz.
Əgər atam bəni buna verirsə,
Həlal olsun qanın kim öldürürsə,
Bəni ana verirsə hal düşvar
Ki, bu halda əcayib dürlü iş var.
Çü lala bu sözü andan eşitdi
Dəlim üzrü ilə gör nə iş etdi.
Dönüb dedi: əya məsturi-aləm
Ki, sənsən cahan içrə xubi-aləm.
Sizə gəldigimiz eyb etməyəsiz,
Atan hökmilə gəldik qatına biz.
Bunu dedivü xadim durdu getdi,
Güləndamın sözün şahə ilətdi.
Bu gəz sultan durub gəldi qızına,
Qızı qarşu varır sultan üzünə.
Görür kim, atası gəlir yaluğuz,
Gəlir illa məlul, xatiri yavuz.
Məlul gördü atasın oldu pürğəm,
İləri evdi əlin öpdü ol dəm.
Dəlim izzətlə aldıvü gətirdi,
Keçib taxt üstünə sultan oturdu.
Şahənşah dedi: ey canım parası
Ki, sənsən gözümün ağı, qarası.
Rəvamıdur bənim sözüm sıyasan:
Gərəkməz ol əri bana deyəsən.
Əyalımsan bənim sən, həm canımsan,
Cigərimsən, damarım, həm qanımsan.
Qərəz bir boşluq isə bu zamanda
Neçün istəməyəsən anı sən də?!
İraq yerə səni verir olursam,
Bənə (bir) dərddürür sənsiz olursam.
Səni bu yigidə kəbin edəm bən,
Yüzünü görə duram dəmbədəm bən.

Sözüm yanlış olur isə utanam.
Əyalımsan, sənə yavuzmu sanam.
Atasın dinlədi ol mehribanı,
Qızardı gül kibi bənzi, utanı.
Təri dür kibi yüzündə düzüldü,
Gözü nərgizlərin ol dəm süzüldü.
Yanağı gül kibi öylə qızardı
Atasından utanır, həm qızardı.
Ədəb birlə der: ey dövlətli ata
Səxavət kanı, ey mürvətli ata.
Sizə biz qarşı söyləmək eyibdir,
Ulular bu sözü böylə deyibdir.
Bizə söz söyləmək düşməz qatında,
Həmin qulluq gərəkdir həzrətində.
Nə deyəyin, ata, fərman sənindir,
Əgər dərdli isəm dərman sənindir.
Qızından çünki sultan dinlədi söz,
Dua qıldı və dedi: ey gözəl yüz.
Həzaran dürlü ana alqış etdi,
Əsənlədi qızını durdu, getdi.
Atası gedicək artırdı dərdin,
Bu sözün sanma kim olaydı sərdin.
Məlul, qəmgin qalıban ol nigarın
Sarardı gül yüzünün növbaharın.
Driğa, gör atam bənimlə netdi,
Əlim aldı bəni yabanə atdı.
Güləndamın digərgun oldu halı,
Həramidir düni, güni xəyalı.
Yatur ol gecə qəmgin zarü tənha,
İçindən keçirir nə söz, nə qovğa.
Çü sübh oldu yerində durdu sultan,
Oxudu bəylərini dərdi ol xan.
Dügün saçısına gəldi ulular,
Əkabirlər, əmirlər, yahtulular.
Qamu bəylər gəlir anda irişir,
Dügün içün yaraq edib duruşur.
Gələn xəlqi yedirdi, toyladı xoş,
Təmam qırx gün dügünü eylədi xoş.

Əcayib dürlü-dürlü ne'mətü xun
Yedilər qurtü quş qalmadı məğbun.
Gümüş, altundu təpsilə çanaqlar,
Dolu-dolu içi ne'mət tabaqlar.
Hərisə, qəlyəvü danə tuturqan
Quş ətlərilə qoyun cümlə büryan.
Çü dügün savulub axıra irdi.
Hərami ol gecə gərdəgə girdi.
Eşid imdi bu yandan əcəblər,
Eşidənlər anı yavlak əcəblər.
Güləndamın məgər bir razdaşı
Var idi, xoş idi anınla başı.
Gözəl bir qızdurur gənduyə manənd
Seçilməz bir-birindən sözləri qənd.
Bir alma sana idin özlərini,
Görəydin mahitaban yüzlərini.
Biri-birinə bənzər idi mütləq
Yaratmış sün'i birlə anları həq.
Küçücükdən bilə ulalmış idi,
Güləndamın xuyunu almış idi.
Güləndam ana bir-bir vəsfi-halın
Oturdu dərdini dedi xəyalın.
Dedi ol qıza: get tez var donan gəl,
Bənim qayqularımı yabana sal.
Bənim şəklim oluban gərdəgə gir,
Səninlə arada olsun bu tədbir.
Saqın bu razı kimsəyə deməgil,
Bu sözü kimsəyə faş eyləməgil.
Dedi ol qız: e məhbubi-zəmanım,
Fəda olsun yolunda dadlı canım,
Başım üstünə nəkim buyurursan,
Sözündən çıxmayam gər öldürürsən.
Varıb qız donanıb gəldi oturdu,
Bular bu fikrilə nə iş bitirdi.
Qaçan kim ol döşək vaxtı olurdu,
Donanırdı ol işə qız gəlirdi.
Güləndam yerinə ol qız varırdı
Çü haşa! Cariyə varıb görürdü.

Netəkim ol gecə olurdu hacət,
Qız ilə olur idi ol hekayət.
Tamam bir yil bu rəsmə vardı bu iş
Bunun üstünə keçdi bu yazı, qış.
Görün bu çərxi-qəddarın işini,
Bu məkkarın gəl anla cünbüşini.
Qıza bir gün irişdi əmri-təqdir
Ki, bozuldu bu üzdən rə'yi-tədbir.
Güləndam qıldı şö'ylə zari-tənha
Məlamət içrə qaldı dəngi-şeyda.
Eşindən ayrılıb hal oldu düşvar
Der idi qanı ol yari-vəfakar.
Çü yaxdı hicr oduna kəndözünü,
Həqə ismarladı ol dəm özünü.
Dilini tutdu əbsəmcək oturdu
Vəfası yox cahanın çünki gördi.
Gələlim bu üçüncü məclisə biz
Xəbərimdən eşidin çün xəbər siz.

## MƏCLİS-3

Məgər Əhməd Hərami bir gün azdı,
Görün kim, xatirində ol nə düzdü.
Şahənşahə der: ey bəylər bəyi, sən
Cahan içində daim olgil əsən.
Dəlim ne'mətlərin xoş yedim, içdim,
Dəlim işrətlər etdim şadi keçdim.
Yaman gün görmədim hərgiz qatında,
Özüm yaxşı keçirdim həzrətində.
Vəli bir hacətim var söyləyəm bən
Bu gün halu sizə şərh eyləyəm bən.
Malım, mülküm bənim çoxdur Kırımda
Öküz gəncü xəzinəm var yerimdə.
İcazət bən quluna ver gedəyim,
Varıban anları həm cəm edəyim.
Şahənşah eydir kim dəstur verəyim,
Ötə nə vəqt gəlirsən biləyim.
Ayıtdı [kim] əgər diri qalırsam,
Bucuq yil əglənəm gər çox olursam.

Bucuq yil müntəzir olun bizə siz,
Tapuna altu ayda irəvüz biz.
Çü bəd fe'lü əbtər dəstur aldı,
Güləndamın qatına sürdü gəldi.
Dedi kim, ey bənim, yarım, nigarım,
Vəfadarım, həlalım, qəmgüsarım.
Atandan dəstur aldım şahi-şəngül,
Kırıma getməgə, ey yüzü gül, gül.
Qapından ayrı bənə gün gərəkməz,
Bərşarət, şadlıq, dügün gərəkməz.
Çün olduq sənü bən mə'şuqü aşiq
Bulunmaz dünyadə bir yari-sadiq.
Kərəm eylə sözümdən çıxma, ey dost,
Bəni həsrət oduna yaxma, ey dost.
Bilə gəl gedəlim bu qutlu yola
Ola kim tanrı xeyrin vermiş ola.
Güləndam eytdi: ey bənim həlalım,
Tapındır bağçavü mülk ilə malım.
Nə kim siz buyurursuz xeyr əgər şər,
Anı tutmaq yerincə bizə düşər.
Ağalar dedigin tutmaq gərəkdir,
Ağu sunar isə yudmaq gərəkdir.
İnanıb sözünə ol mah-peykər
Yidildim söziğə, – dedi, – e sərvər.
Atasıyla, anasıyla görüşdü,
Bu gəz getməgi yarağına düşdi.
Dedi gönlündən ol kafir degil bu,
Əcəbmi getsə dildən ol yavuz xu.
Necə bir kin tuta, tərk etdi ola,
İçindən kibri, kini getdi ola.
O dadlu sözlərə gönlü qapıldı
Yürəgi tazələndi, su səpildi.
Gəlir başına nə kim yazsa təqdir,
Adam dedigi olmaz cümlə tədbir.
Qılan bu işləri cümlə xudadur,
Əgər qüdrətdürür, əgər qəzadur.
Nigarı nabəkara oldu çün seyd,
Düzər Əhməd Hərami yol için qeyd.

Həmin bir qırnaq aldı və iki qul,
Görüşdü şah ilə tutdu həman yol.
Güləndamı alıb getdi işinə,
Görün nə gəlisər onun başinə.
Çü bunlar oldular yola rəvanə,
Qulaq ur billahi bu dastanə.
İrərlər İsfəhan şəhrinə bir gün,
Biləsincə Güləndam xubü mövzun.
Qodi Əhməd Hərami anda rəxti,
Ol iki qulu, qırnağı buraxdı.
Güləndamı yaluquz aldı getdi,
Eşit imdi Hərami anda netdi.
Gözətmədi sağını və solunu,
Həman ol tutdu Gürcüstan yolunu.
Güləndamın yüzünə baxmaz idi,
Gönül eşqinə hərgiz yaxmaz idi.
Anın ilə yaxınlıq etməz idi,
Zira kibr içindən getməz idi.
Hənuz bikirdi ol xubi-zəmanə
Nəsib olmadı qız ol qəltəbanə.
Sözü söyləyicək sərd söylər idi,
Fəsad etsə gönüldən eylər idi.
Anın cünbüşünü gördü Güləndam
Bu mə’ni sirrinə irdi Güləndam.
Dedi kəndözünə: ah neylədim bən,
Ağuyı göz görə nuş eylədim bən.
Nədən qorxarisəm ana sataşdım,
Səməndər kibi odlara dutaşdım.
Dəlim fikr eyləyib qəmgin gedərdi,
Anıb şəhzadəligin ah edərdi.
Hərami anda qondu bir dərəyə
Ki, insan uğramazdı ol arayə.
Güləndama dedi: dövşür ögünü
Bilirmisən bənə sən etdügünü?
Adım degülmüdür Əhməd Hərami?
Qanı yoldaşlarımın intiqami?
Ərənlərə qılıc vurmaq necədir?
Oğurlayın yigit qırmaq necədir?

Sənə göstərəyim bir-bir bu gün bən,
Əgər göstərməz isəm ər degiləm.
İş edəyim sənə aləmdə düpdüz
Ki, anın kibi iş heç görməmiş göz.
Güləndam aydır: ey şirrəti-afaq,
Əgər suçlu isəm sən tanrıya bax.
Ərənlərin işi mürvət degilmi,
Bu gün dünya, yarın axrət degilmi?!
Eşitdim bən səni bizə irincək,
Sənin hər dürlü cür'ətin görüncək.
Atama sirrini faş etmədim bən.
Xəzinə açdığın [faş] etmədim bən.
Dilərdim bənim ilə yar olaydun,
Nə bilirdim belə əğyar olaydun.
Hələ mürvətinə nə sığsa işlə
Gərək öldür, gərək canım bağışla.
Həqə saldım görəyim həq nə işlər,
Bunun kibi başa çox gəlir işlər.
Güləndamın sözini almadı heç.
Zehi zalım eyninə gəlmədi heç.
Yanından dörd dəmir qazuq çıxardı
Şahənşahın qızın çarmıxa gərdi.
Döküdü dörd qazuq dörd yana möhkəm
Zehi cövrü cəfadur, zehi sitəm.
Güləndamı əlindən, ayağından,
Sarar möhkəm çəkər bağlu bağından.
Dedi: sənə dəxi gör nedərim bən,
Hələ dağa oduna gedərim bən.
Budur qəsdim səni oda yaxam bən
İraqdan xoş tamaşana baxam bən.
Bir ata bindi, birisini yetdi,
Varıb dağdan odun almağa getdi.
Güləndam qaldı ol əfqan içində,
Fəraqü zar edib giryan içində.
Sanasan kim, xəzan yaprağı düşdi,
Və bir tər gül solub torpağa düşdi.
Nələr qılır görün bu çərxi-qəddar,
Qılır dərdə necələri giriftar.

Güləndam kəndü birlə söylənirdi,
Həqin birligini zikr eylənirdi.
Dedi: ki ey kərimi-karsaza
Xudavəndi-qədimü biniyaza.
Mədəd [dinlə] sözüm mədəd, xudaya,
İlahi, sən dəf’ ver bu qəzaya.
Yürür ikən tavus bal bağ içində
Boğuldum qaldım uş irmağ içində.
Bunu dedi, xudaya dutdu yüzün
Bu şe’ri başladı sən dinlə sözün.
İnilti ilə bir gəz eylədi ah.
Aytdı: sana sığındım, ya Allah.

# YUSİF MƏDDAH

*Ədəbiyyat tarixində hələlik yalnız "Vərqa və Gülşah" poeması müəllifi kimi daxil olmuş Yusif Məddahın həyatı barəsində əlimizdə tutarlı sənəd yoxdur. Yalnız bu məlumdur ki, "Vərqa və Gülşah" poeması hicri 770-ci ildə* (*miladi 1368/69*) *qələmə alınmışdır. Əlimizdə olan nüsxə 1770 beytdən ibarətdir. Poemanın dörd əlyazma nüsxəsi məlumdur – ikisi Azərbaycan SSR EA Respublika Əlyazmalar fondunda, digər ikisi isə Türkiyədə saxlanılır. Turkiyə nüsxələri köçürülmə tarixinə görə daha əskidir. Bakı nüsxələrinin hər ikisi XIX əsr kolleksiyaçısı Əbdül Qəni əfəndi Nuxəvi Xalisəqarızadənin kitabxanası ilə birgə fondumuza daxil olmuşdur.*

*"Vərqa və Gülşah" poemasının əlyazmasının faksimilesi 1945-ci ildə İstanbulda nəşr olunmuşdur. Faksimileni çapa hazırlayan İsmayıl Hikmət Ertaylan ona giriş yazmış və poemanı XIV əsr Azərbaycan poeziyasının görkəmli yadigarı adlandırmışdır.*

*"Vərqa v Gülşah"ın Bakı nüsxələri yarımçıq olduğundan və əski mətnə nisbətən variant xarakteri daşıdığından poemanın 1945-ci il İstanbul çapının qısaldılmış mətnini oxuculara təqdim edirik.*

## "VƏRQA VƏ GÜLŞAH" POEMASI

(*parçalar*)

### DASTANİ-VƏRQA VƏ GÜLŞAH

Ey xudavənda, kərimü karisaz,
Veribən gecəvü gündüz qıyşü yaz.
Yürüdən ayü günəş, ulduzları,
Yaradan eniş, yoquşü düzləri.
Yağmuru dürrü taşı qut eyləyən,
Yerdən, ağacdan qula qut eyləyən.
Eşqi birlə məst edən aşiqləri,
İrdirən məqsuduna sadiqləri.
Səndən artıq kimdürür qadir aşa,
Sən verirsən ləzzəti hər bir aşə.
İşbu ətmək, dürlü ne'mət, tər yemiş,
Sən verirsən aqça, bol altun, gümüş.

Verduginə çün şükr, ya rəbbinə,
Can fəda olsun rəsulun eşqinə.
Gündə bizdən hər dəm rəbbül-ənam,
Mustafanın ruhinə yüz bin səlam.
Oldurur cümlə nəbilər sərvəri,
Ümmətin şadi, yerin peyğəmbəri.
Ver salavat aydəyim bir dasitan
Kim, nə mö'ciz göstərir fəxri-cəhan.
Mustafa dövründə bir qövmin adı,
Zahiri-heyyi-Bəni-Şəyya idi.
Nə ki, elində olurdu bir yerdə,
Vermiş idi çavı bilişü yadə.
Bunların iki rə'isi var idi,
İkisi daxı qarındaşlar idi
Ki, bahadırlar idi bunlar qamu,
Ərlik içində dükəli dutu xu.
Birinin adı Hilali-namüdar.
Ol birinin adı Hümami-şəhvar.
Qüdrətilə ol Hümamın bir gecə,
Oğlu doğdu, bərq urar aydım necə.
Həm Hilalın ol gecə qızı olur,
Ol dəxi bir qiyaməti gövhər bolur.
Vərqa verdilər Hümam oğluna ad,
Qız adı Gülşah dedilər xoş nihad.
İkisi iki gövhərdən ki ari,
Dayələr əmzirdi bir yil bunları.
Çünki bunlar bir yaşına irdilər
Ayü günəş, tanrı sün'in ökdülər.
Dedilər, ey verən bizə sübhü şam,
Nitqindən qıldın günəş, bədri təmam.
Sün'ünə əhsən deyər nəqqaşi-xoş,
Qətrə sudan bunlarınla oldu şad,
Qıldılar bir-birinə namizad.
Çünki beş yaşadı ol xubi-Xütən
Yüzləri gül, tənləri bərgi-səmən,
Hər birinin zülfü bir müşkin kəmənd,
Hər kərə bin aşiqin canına bənd.

Şivə ilə könül alur gözləri,
Aşiqə canlar bağışlar sözləri.
Həddə yetdi ol iki bədri-münir,
Hüsn içində körklü idi binəzir.
Məktəbə verdilər ikisin belə
Ta bular elmü ədəb tə'lim qıla.
Məktəb içində bular biri-birin,
Can içində sevişib qıldı bərin.
Məktəbə ikisi belə varırdı,
Xocaları çün səbəq verir idi.
Evə gəlirlərdi ikisi belə,
Gecə girirlərdi döşəgə belə.
Bir döşəkdə hər gecə ol iki nur,
Qucuşuban yatır idi misli-hur.
Çün döşəkdən duri gəlirdi bular
Evdə toğmış sanasan şəmsü qəmər.
Aşiqin canını ayrı görmə sən,
Surətilə gərçi ayrudur bədən...
Vərqəvü Gülşah ol iki qənd-ləb,
Hasil etdilər bular elmü ədəb.
Yazı yazmaq, oxumaq öyrəndilər,
Çünki yeddi yaşına dəgdi bular.
Verdi oğlunu silahşurə Hümam
Ki, ərlik tə'birin ögranə tamam.
Bir-birindən bir saət ayrı düşər,
Hər birisi bir yana sayru düşər.
Dözəmmədilər bular ayruluğa,
Qayğıdan yüz urdular sayruluğa.
Görəmədi Gülşah bir dəm Vərqayi,
Vərqa ağlar, istər ol tolu ayı.
Bunların səbrü qərarı qalmadı,
Munisini Gülşah çünkim görmədi,
Çünki bildi qızının halın Hilal,
Vərqəsiz Gülşahə irişir zaval.
Bildilər Həyyi-Bəni-Şəyya qamu
Kim, sevişmişlər ol iki mahi-ru.
Bu qövm aydur, məsləhət oldur həmin,

Vərqəvü-Gülşah ola həmdəm həmin.
Alınız Gülşahı andə varasız,
Ağlamasın yalınuz bunda bu qız.
Gər ol ustadə verir isə yenə,
Vərqa ilə Gulşah andə avinə.
Kim bunları bir-birindən ayıra,
Muzlimə yüklənibən qana girə.
Anı daxi verdilər ol ustayə,
Həqqini qul etdilər aydan ayə.
Vardı Vərqə qatına ol mahivəş,
Ta ki, ögrənə silahşur, ola xoş,
On iki yaşına irdikcə tamam,
Qıldılar ol ikisin tə’lim müdam.
Varduğunca eşq odu ğalib olur,
Bir-birinə canları ğalib olur,
Ol xəlayiqlər cəm oldu bir yerə,
Qövmi ta Gülşahi Vərqəyə verə.
Dedilər ki, ey rə’islər biz qamu,
Cümləmiz ana razıyüz, ey əmu,
Məsləhətdir kim, baxasan halinə,
Verəsən Gülşahı Vərqə əlinə,
Ta muradına dəgələr bular,
Həm sizə rəhmət qıla pərvərdigar.
Məsləhətdür deyü qıldılar qəbul,
Ol rə’islər evlərinə qıldı yol.
Gəldilər evlərinə, oturdular,
Ol mübarək iş üçün od urdular.
Yeddi gün dügün olundu müdam,
Qıldılar cümlə yarağını tamam.
Gərdəgə gətürdilər Gülşahi gecə,
Eşid imdi tanrının hökmi necə.
Var idi bir yağı anlara yaxın,
Cümləsi bidin idi kibru xain.
Hər birinə ad verən əvvəl ustad,
Bunlara Həyyi-Bəni-Zeyf urdu ad.
Bəglərinin adı Küfrü Şədid,
Ol bəgin adı Bəni-Əmri-Pəlid.

Vəsfini Gulşahın eşitmiş idi,
Aşiq oldu görmədən ol bəd fə'al,
Heç qərarı qalmadı, sərp oldu hal.
Aqibət əndişə qıldı kəndözi,
Atasından diləyim, der ol qızı
İyiliklə qız verir isə alam,
Verməz isə bilirəm bən nə qılam.
Cəm' qıldı ləşgərini hər nə ki var,
Bindirib altmış bin ər oldu süvar.
Əzm qıldı ləşgərini aldı gəlir,
Eşidir yolda dügün olmuş olur.
Dedilər gəlmənüz siz, ey bəg yenə,
Bil ki, Gülşahı verirlər Vərqəyə,
Hazır ol kim, bu gecə ərə varır,
Çün eşidir, dizinə əlin urur.
Aydur, andan keçdi işim kim varım,
Varıban, gəlincə qızı diləyim.
Şöylə gərəkdir bu gecə kim, bana,
Bən şəbuxun eyləyəm varam ana.
Ol dügün içində Gülşahı qapam,
Xoş muradım varalum öpəm, qucam.
Gəldi ləşgəri ilə çünkim yaxın,
Pusuya girdi, gecə qıldı axın,
Varıban onda kim, kafirin xəşmi dəgə,
Bular Gülşahı gətirir gərdəgə.
Hər birisi işrətə məşğul idi,
Dört yanicə hurinin xod qul idi.
Nə Hümamın agahı var, nə Hilal.
Bunların işinə irişdi zəval.
Çün Bəni-Əmru şəbixun eylədi,
Ol qövimi-ol tarumar eylədi.
Qapdı Gülşahı Bəni-Əmru lə'in,
Aydurdi, həmlə qılın yer-yerin.
Həmlə qıldı cümlə ol altmış bin ər,
Neyləsin dərya qatında bir nigar.
Ğafilidi ol xəlayiq nagəhan,
Bunlara irdi qəzayi-asiman.

Çün qəza gögdən enə, göz bağlanur,
Ey neçə canü könüllər tağlanur.
Ta xəbər olunca ki, bu nə çəri,
Basdılar ğafil on iki bin əri.
Neyləsin bunlar, qamusu qaçdılar,
Can atıban yurduna qavışdılar.
Çün ki Əmru aldı buların varını,
Malını, əsbabını, tavarını,
Çün buları etdi əsir nabəkar,
Ol nigarın ağlar idi zarü zar.
İrdi ardınca Hilali-pəhləvan,
Dərpənicə irdi Vərqa nocəvan.
İrdi belə on iki bin ər ərəb.
Geymişidi cümləsi sözü sələb.
Çalınır kusü nəfirü kəranay,
Tuğü seku, səncaqi-aləm başlay.
Cümlə ləşkər tülb-tülb, çoq-çoq,
Hər biri pulad geymiş təxti-foq.
Qamusu atdan aşağa endilər,
Bunlara qarşu bərabər qondular.
Çadırın qurdu tənab əndər-tənab,
Gün yüzünə qarşı tutdular niqab,
Barigahü xeymə, çadır qurdular,
Giribən çadırlara oturdular.
Ol gün andə qıldılar idi qərar,
Ol Bəni-Əmrü lə’ini-xakisar.
Geri döndü barigahinə yenə,
Girdi Gülşahın içəri qatına.
Dedi: – ya Gülşah, gülyüzlü sənəm,
Vərqəyi tərk eylə kim, yarın bənəm.
Gəl könül ver kim, sana bu gəncimi,
Küllü verim, zaye edim rəncimi.
Lə’lü piruzə, cəvahiri-qiyməti,
On yeddi sandıq, on iki bin atı.
Qamusun verdim sana, ey yüzi gül,
Razıyam bən sana, qul olmağa, gəl.
Malımü canım fəda olsun sana,

Malıma sən hakim ol, ol da sana.
Öldürəyim Vərqəyi, gəl bənim ol.
Bən tən olayım sana sən canım ol.
Söylədi işbu rəsmə çoq ol lə’in,
Gəlmədi Gülşah ana hərgiz yaxın.
Çünki bulımadı rza xoşluğ ilə,
Gör bu gəz Gülşahə ol it nə qıla.
Dedi: – Ya Gülşahim, azdırdın bəni,
Vərqə eşqi qıldı aşüftə səni.
Ertə anı öldürəm, başın kəsəm,
Top edibən qarşına başın asam,
Səni bu xiymə dirəginə saram,
Həp yalıncaq eyləyəm, qamçı uram.
Andən iş qılam sana, ey bixəbər
Kim, çəkələr səni bu xərbəndələr.
Sən nə layiqsən kişiyə, ya bana,
Adəmilər layiq olurmu sana.
Qaqıdı, aydur: – Gətiriniz suci,
Dilər ol biçarəyə qıla güci.
Axşam oldi çün gətirdilər çaqır,
Ol yavüzü məl’un Gülhaşə qaqır.
Ol nigari sarə qodi dirəgə,
Qamçı yanında qodi, ta kim dögə.
Başdan ayağa kəmənd ilə dolar,
Ol nigarın gözi yaş ilə dolar.
Gözlərindən aqıdır dürdanəsin,
Anıb ol yigitlərin mərdanəsin.
Bağlı Gülşah andə biçarə həzin,
Gəldi ol məl’un oturdu xişmigin.
Dolduruban qadəhə suci içər,
Cür’əsin Gülşahın üstinə saçər.
Aydur dedi: – işbu dəm sərxoş olam,
Bən bilirəm kim, sana nə iş qılam.
Çünki sərxoş oldu başı ol cahilin,
Dedi: – Durun ximəyi xəlvət qılın.
Qamu tışra çıqdılar, ol qəltəban,
Yəvlaq əsrimişdi, durdu rəvan.

Dilər idi ol gecə Gülşah ilə,
Şöylə kim, demiş idi anı qıla.
Suci burdu boynunu, yüzin qoyu,
Düşdü yerində gəbərdi uyuyu.
Gördi Gülşah anı kim, düşdü yüzin,
Dutdi həq dərgahinə ol dəm yüzin.
Sən bilirsən, ya ilahi halımı,
Xodz nə hacət bən deyim əhvalımı.

ŞE'Rİ-GÜLŞAH

Bənd içində bunda qaldım bən əsir,
Bir mədəd irgil bana, ya dəstigir.
Aşiqəm, zalim əlinə düşmüşəm
Kim, yüzü çirkin, sözi zişti-əmir.
Gəlibən Vərqə xəyalı qarşıma,
Bir yana düşmən hücum alıb sürür.
Vergilən Vərqəyi bu dəmdə bana,
Lütfün ilə canıma fəryad irir.
Həsrətilə dünü gün bağrım pişir,
Eşq oduna tutuşub canım ərir.
Ey əcəb kim, hicran yolundan çıxıb,
Göstərəmi yüzi ol mahi-münir.
Gəlsə görsə kim, döşəklər yerinə,
Uş kəmənd oldu bana diba, hərir.

* * *

Bən kəmənd içində bağlı bu gecə,
Vərqə miskinin əcəb halı necə...
Dönük ikən bəxti, keçdi nagəhan,
Durdu şol dəm Vərqeyi-nopəhləvan.
Eşqi Gülşahın anı şeyda qılır,
Kəndözinə şəbrəvan tonlar keyir...
Vərqə düşmən xeyməsi yoluna gedər,
Barigahinə Bəni-Əmrin yetər.

Dün çağı xeyməyə irmiş idi,
Pasibanlar uyquya varmış idi.
Xeymənin Vərqə yüridi ardına,
İrdi dər zəman ol nigarın dərdinə...
Ol nigarin kəndu halın söylənir,
Gah ah edir, gah zarılıqlar qılır.
Gördi kim, bir kişi içəri girür,
Bildi Gulşah kim, gələn Vərqə dürür.
Diləridi ah edə ol xub nigar,
Vərqə ağzını dutdu dedi, zinhar!
Olmasın kim, ya nigar, ah edəsən,
Gər dilərsən sağ-səlamət gedəsən...
Vərqə Gülşahı götürdi yağidən,
Ol Bəni-Əmrü lə'inü tağidən...
Vərqəyə ol qövmi qıldı afərin,
Cümləsi şad olub sevindi bərin.
Urdular təblü asayişi-səbah,
Şadü kam oldu qamu əhli-səbah.
Çün səbah oldu Bəni-Əmrin gözi,
Qan ilə doldi qaqıdı kəndözi.
Dedi: – Atlansın çəri işbu dəm
Kim, qılayın Vərqanin ömrünü kəm.
Bindi şol saət altmış bin ər,
Götürübən tiğü ələm, səncaqilər.
Bu yana bindi Hilal ilə Hümam,
Vərqəvü Gülşah bədr ol iki təmam.
İki ləşkər çün nəğarə urdular,
Bir-birinə çün muqabil durdular.
Sürdü meydanə Bəni-Əmr atını,
Nə'rə urdu, dedi ki, Vərqə qanı.
Bu gecə şöylə kim oğurluq qıla,
İlətünüz Gülşahı ərlik ilə.
Sağ-səlamət canını bundan ilət,
Xəsminə qarşu uram bən sana lət.
Vərqa dilədi kim, meydanə girə,
Necədir ərligi anə göstərə.
Qoymadı Gülşahı mən' etdi anı,

Dedi kim, bən öldürürəm bu canı.
Hiylə ilə bu bəni qıldı əsir,
Bən göstərim işin ana binəzir.
Zərb uram, yıqam atdan yüzün qoyu,
Şöylə gətürəm qatuna sürüyü.
Vərqə aydur: – Ya nigarın, bu sözi
Söyləmə, nagah oda yaxma bizi,
Bən varım meydanə, sən asayiş ol,
Qılmadı Gülşah anın sözin qəbul.
Kənduyə sazü silahın bağladı,
Vərqanın leykin yürəgin dağladı.
Qıldı yatın sürdi meydanə atın,
Hərbə əlində bəzəmiş surətin.
İrdi şol dəm həmlə qıldı, həmləsin
Söylədi şol dəm ol Bəni-Əmrü lə'in.
Ol xod gər pur pəhləvan idi bənam,
Eylədi üç həmlə ol bədri-təmam.
Çün bu gəz növbət Bəni-Əmrə dəgir,
Qıldı bir zərbilə Gülşahı əsir.
Qullarına verdi, ilətürlər anı,
Ahi qıldı Vərqənin yandı canı.
Vərqə atası yetilmiş pir idi,
Qüvvəti yoq, taqəti təqsir idi...
Sürdü atın ol Hümamın qəsdinə,
İrdi, tiğ urdu kəndu üstinə.
Ol qolu qanlı Bəni-Əmrü pəlid,
Vərqanın atasını qıldı şəhid.
Vərqə çün gördi atası halını,
Zari qıldı dutubani belini.
Dedi: – Bəni yalunuz qodun ata,
Zari qılıb qamçıyı urdi ata.
Andə Vərqa atından endi yerə,
Kişi kəndu atasın qıcan yerə.
Urdu kəndu yüzin anın yüzinə,
Qəsd qıldı kim, qıya kəndözinə.
Qomadı, qullar götürdü atəsin,
Nə'rə urdu ol Bəni-Əmrü lə'in.

Dedi: – Ya Vərqə, yürəgin tağlama,
Atana qavuşdurayım, ağlama.
Vərqə oldu atına ol dəm süvar.
Sürdü atın ilərü ol namüdar.
Dedi: – Ya məl'un ögünmə, aç gözün,
Kəndu həddincə degil hər bir sözün.
Bənim atəm yaşını sürmiş idi,
Ömri anın axirə irmiş idi.
Gərçi kəndü sali-hürmə pir idi,
Ol yigitlikdə cəhanda bir idi.
Uş bənəm Vərqə hərifin, həmlə qıl,
Hey utamaz hayənü gəbrü xəcil.
Göstərim ərlik sənə lə'bü hünər.
Kuhi-Qafisən qılam zirü zəbər.
Çün eşidər bunu bağrı qan olur,
Qamçı urur atına, həmlə qılur...
Gerü döndü gürzü urdu Vərqəyə,
Gər qəbayə uğradı, düşdü qıyə.
Mən'i qıldı gürzünü daxi anun,
Olmadı bənzi təğəyyür Vərqanun.
Həmlə qıldı ol lə'in dartdı qılıc,
Mən'i qıldı Vərqə qayurmadı hiç.
Vərqə daxı hiylə qıldı şur ilə,
Rədd qıldı yüz bəlavü zur ilə.
Qıldı bu üç həmləvü üç həmlə ol,
Vərqədən könül təğəyyür, həm məlul.
Çünki axşam vəqt irişdi nagəhan,
Təblü asayiş uruldu ol zəman.
Ləşgərinə döndi ol kafir geri,
Heybətindən Vərqənün bənzi sarı.
Vərqə gerü döndi kəndü xeyminə
İrdi şol saət ki, ta atdan enə.
Qarşu gəldi cümlə qövmilə Hilal,
Ulu, kiçi, ərü-övrət, qız, əyal...
Şöylə kim, rəsmidi Vərqə atasın,
Qıldılar tə'ziyə, dutdilar yasın.
Bunda bunlar tə'ziyə qıldı həzin,

Sən eşit imdi Bəni-Əmrin sözün.
Dedi ol kafir ki: – Gülşahım qanı,
Tez gətirin bunda görəyim anı.
Vardılar, Gülşahı alıb gəlidilər,
Hökm qıldı bəndini götürdülər.
Dedi: – Ya Gülşah, razı olğıl bəna
Kim, verim cümlə xəzinəmi sana.
Cövhərü altun-gümüş, malü tavar,
Sənin olsun cümləsi, ey xoş nigar...
Bən bunun ilə müdara qılayım,
Bu işə məkr ilə çarə qılayım.
Ol nigarin aydur anə: – Ya əmir,
Olmadı səndən ulu bəglərdə bir.
Bən bilirəm sən ulusan qamudan,
Həm əsilzadə mihən, həm pəhlivan.
Cövhərü altun, gümüş, rəxtü qumaş,
Cümlə sənin, bən sana bir qaravaş.
Xod nə hacət, bunca bu lütfü kərəm,
Razıyam bən sana, səni sevərəm.
İlla qorxum Vərqədəndir, gər anı,
Öldürəsən qəbul edəm bir səni.
Gər anın başın gətirəsən bana,
Qalmaya ayruq dəxi üzrüm sana.
Bən səninəm, sən bənim olğıl müdam,
Səndən artuq xod bəna kimdir həram.
Çünki eşitdi bu sözi ol lə'in,
Saçdı Gülşah üstünə dürri-səmin.
Ertə anı öldürəyim zarü zar,
Aydur, axır şöylə degil ey nigar.
Gər dilərsən şöylə diri gətirəm,
Hər nə iş kim, sən deyəsən bitirəm...
Çün səbah oldu iki ləşgər yenə,
Yetdilər qarşu yenə, bir-birinə.
Ol bəni-Əmrü lə'inü pürsitəm,
Sürdü meydana atını ol qədəm.
Dedi: – Ya Vərqə, ər isən gəl bəri,
Dünciləyin cəng edəlim gəl bəri...

Qamçı urdi ol Bəni-Əmr atına.
Həmlə qıldı irdi Vərqə qatına...
Bir-birin üstinə atdılar kəmənd,
Bağladılar Aərqənin boynuna bənd.
Gördü Gülşah ol yigitlər şahını
Gətirirlər sürüyüb, yandı canı.
Tonu altında dəmir geydi nigar,
Bir qətir üzərinə oldu süvar.
Çün yaxın irdi nigarın ol zəman,
Dedi: – Qüvvət qoluna, ey pəhləvan.
Çünki bu ğəddarı sən qıldın əsir,
Gətir imdi əlimə sən bunu ver.
Bir əzab ilə qılam buna cəza,
Bu bilirmi kim, nələr qıldı bizə.
Vərqə eylə sandı kim, gerçək durur,
Dirligi ümmidinin tərkin urur.
Dedi yavuz övrətə həqdən bəla,
Ey diriğa, bu gəz oldum mubtəla...
Ol lə'in uzadı bir az irəli,
Vərqanın Gülşah əlin şaşdı geri
Döndü ol kafir geri qıldı nəzər,
Vərqanın əlin şaşuk gördi məgər.
Ol lə'in aydır: – Ey nigarüm, neylədin,
Vərqanın əlin niçün şaşı qodun.
Şaşmagil der düşmənimin əlini,
Dedi kim, qo bildirəyim halini.
Çün bunu verdin bana sən sakin ol,
Bunu yoq tut, ğüssəsindən əmin ol...
Öylə sandı kim, Bəni-Əmrün özü,
Gerçək aydur, sandı Gülşahın sözü.
Əmin oldu ol dəxi, döndü gedər,
Sən eşit imdi gör Gülşah nə edər...
Qaqar ol Gülşah ana, tez yürü der,
Qula aydur, şol sekuyi bəri ver.
Yürüməzsə bən anı yürüdəyim,
Öldürüb yüzin quyu sürüdəyim.
Verdi əlinə sekuyi ol ğulam,

Əlinə aldı anı ol bədr-təmam.
Ol sekü xod hərbə idi ki, iyi,
Urdi bağırından Gülşah od iyi.
Keçdi bağrındanü köksindən yara,
Düşdü endi çün qatı oldi yara.
Vərqəyə, ol kafirin verdi atın,
Dedi bin, xoş sağə-sola ox atın.
Vərqa çün gögə irgüridi topun,
Aydur, imdi bu çəriyə bir yapun.
Həmlə qılalım gəl ikimiz belə,
Biz yetərüz bunlara bu gün belə...
Rəxtü büngahi yerində qodilər,
Nə var isə qamudan əl yudular.
Gəldilər qamu Bəni-Şeyba, Hilal,
Qıldılar düşmənlərini günki-lal.
Düşdü düşmənlər buların önünə,
Şimdilər geri bunlar xoş sevinə.
İşrətü zövqü səfasi dəm olur,
Vərqa xoş Gülşah ilə evə gəlür.
Eşq içində ikisi heyran idi,
Ol buna dirlik, bu ana can idi.
Biri-birin bir dəm əgər görməsə,
Dönər idi bunların eyşi yasə...
Ol qövm çün buları şöylə görür,
Dedilər kim: – Məsləhət eylədürür.
Ya Hilal, şimdi gərək Gülşahi sən,
Dügün edüb Vərqəyə dəgirəsən.
Müstəhəqdir ol iki bir-birinə,
Qomanuz bugünkü işi yarinə.
Çün Hilal etdi qəbul işbu sözü,
Şad olub gəldi evinə köndözü.
Dedi, övrət sən nə dersən bu sözə,
Xəlq şöylə məsləhət gördülər bizə.
Bən riza verdim ki, Gülşahi verəm,
Sən dəxi razi ol, ey əhli-kərəm.
Gəl sevindir ol iki biçarəni,
Həll edib qılalım bulara çarəyi,

Yoxsa nagah ol firiştə ilə hur,
Dirligindən kəndünün əlini yur.
Övrət aydur: – Vərqə olmuşdur yetim,
Şimdi Vərqə kimü ya Gülşahi kim.
Yox əlində xanüman, altun, gümüş,
Söyləmə bu sözü kim, bitməz bu iş.
Vərqənin irməz əli həm altuna,
Gülşahı bən verməzəm versin tana.
Övrətinə söylədi yenə Hilal,
Dedi: – Tanıqdır bizə ol bizəval.
Bunları bir-birinə, ey xoş nihad,
İkimiz qıldıq beşikdə namizəd.
Həm belə ögrəndilər oxumağı,
Qoğıl axı Vərqəyə qaqımağı.
Həm yenə ulladı belə məktəbə,
Belə verdi elmü ədəb məktəbə.
Bunların xod sən bilirsən halini
Kim, necə sevərlər biri-birini.
Görməz isə dünyadan bizar olur,
İkisinin daxı işi zar olur.
Qəsd edərlər kəndu tatlı canına,
Ver riza, girmə buların qanına.
Necə kim, söylər Hilal ol yüzsüzə,
Razı olmaz övrəti uşbu sözə.
Şirbəha gətirməz isə der, qızım,
Vərqəyə verməzəm, işbudur sözüm...
Vərqəyə övrət sözü mə’lum olur,
Mal içün mən’ etdigi mənşur olur.
Vərqə aydur: – Qamu malım bənim,
Yəğmalandı, işbudur sözüm bənim.
Dedilər kim Vərqəyə, bilməzmisən
Kim, sana dayun olur şahi-Yəmən.
Gətirəsən bizə andan şirbəha,
Həqqini mən’ etməyə bin əjdəha.
Vərqənin bir zəngi qulu var idi,
Vərqəyi bin can ilə sevər idi.

Yazdı namə dayısına ol təmam,
Ol qula verdi, ayıtdı: – Ya ğulam
Ərzə qıldım halımı bu namədə
Kim, necə aşiq olub düşdüm odə.
Var bu bitiyi Yəmən şahinə ver,
De ana, caninçün qurtarsun əsir.
Altı ay keçdi qul ğövlə gəlmədi,
Vərqənin səbrü qərarı qalmadı.
Dedi: – Ya Vərqə kim, gələməz qulun,
Dedi kim: – Qırx gün dəxi və’də qılun.
Yenə qırx gün və’də qıldılar təmam,
Vərqə aydur: – Qalmadı ayruq kəlam.
Gəlmədi qul, bən varayım dayıma,
Ey həmişə şad olun siz dayima.
Hər nə kim, dayım verür isə alam,
Lütf edib tanrı gətirirsə gələm.
Çünkü Gülşah eşidib zari qılır,
Pəs nə qıla, təni candan ayrılır.
Dedi: – Ya Vərqa bəni qob getməgil,
Ey canım canı, bəni tərk etməgil.
Bən necə səbr edəyim sənsiz, canım,
Ta ki, yalnız qalmaya cansız tənim.
Vərqə aydur: – Ya nigarın çarə yoq,
Varım, ayruq kimsənəm ki, varə yoq.
Ol anan zalim aman verməz bana,
Şirbəha istər kim, verəm bən sana.
Həm sana nə çarə, səbr etmək gərək,
Çarə nədir, nedəlim, netmək gərək.
Dedi kim, Gülşah ana, en qəndi-ləb,
Tez gələmisən geri sən, ey əcəb?
Dedi: – Qırx gündə gələm, ey mahiru,
Gər ömür veririsə səttari-hu.
Dedi ol sultani-xubani-cəhan;
– Dilərəm bir yadigar, ey pəhləvan.
Ta ki, əglənəm anınla ey sənəm,
Anı görmiş də səni bunda sanəm.

Verdi Vərqə barmağından yüzügün,
Aldı anın yüzügün ol mahi-Çin.
Ol yüzügünü keçirdi barmağına,
Razı oldu Vərqənin varmağına...
Bir zaman Gülşah ilə qucuşdular,
Ağlayıb fürqət şərabın içdilər.

ŞE’Rİ-VƏRQƏ BE GÜLŞAH

Vərqə aydır: – Ey gülistanım bənim,
Ey gözi məxmuri-məstanım bənim.
Ey dili bülbül, yüzi gül, kəndözi
Şəhdü şirin şəkkəristanım bənim.
Bən nedərəm busitanı, çün sənin
Görklü yüzün bağü bustanım bənim.
Qılmaya hərgiz gülüstanə nəzər,
Ey qoxusu görklü reyhanım bənim.
Ey firaqim dərdinə vəslin dəva,
Səndən artıq varmı dərmanım bənim?
Görklü yüzün ğayib olmadı hənuz,
Əridi külli ətim, canım bənim.
Tanrı bilir titrədir yeri, gögü,
Səndən ayru zarü əfğanım bənim.
Yenə görüncə əsən qal, ey nigar,
Ey gözəllər şahi-sultanım bənim.
Neydəyim, ayrıq görəmmi, ey əcəb,
Görklü yüzün çeşmi-giriyanım bənim.

* * *

Uş rəvan edibən əlvida,
Gərçi aşiqlərə ayrılmaq süda,
Aşiqə firqət günü tufan olur.
Bəlkə hicrandan ölüm asan olur.
Çün Yəmən ətrafına oldu rəvan,
Ol nigarın ussi getdi ol zəman.

Şöylə kim, bihuş olub düşdü yerə,
Vərqa eşqi qomaz kim, əqlin dərə.
Səpdilər ol tazə gül yüzə gülab,
Əqli gəldi, Vərqə şe'rinə cəvab.

### ŞE'Rİ-GÜLŞAH

Aydur ol Gülşah, sultanım bənim,
Uş yenə artırdın əfğanım bənim.
Gözümə qıldın qaranu aləmi,
Şəm'i-cəm'ü mahi-tabanım bənim.
Vay bana zülmətdə İskəndər kibi,
İrməz isə abi-heyvanım bənim.
Canım anda, tənim bunda hurü zar,
Dərdi bəndə, andə dərmanım bənim.
Çərx əlindən gördügüm cövrü cəfa,
Bu əcəb olmaz dəxi canım bənim.
Həsrət odu şöylə yaxdı canımı
Kim, damarda qalmadı qanım bənim.
Ey diriğa, ağlamaqdan dinmədi
Saəti bu çeşmi-giriyanım bənim.

* * *

Çünkü bəndən öksüzin ayrıldı yar,
Göstərə bir gün yenə pərvərdigar.
Azmış işləri gətirər hasilə.
Vərqa sözün gətirəlim bir dilə.
Çün Yəmən ətrafına yönəldi ol,
Ağlayü zari qılıb gedirdi ol...
Gördü kim, irdi Yəməndən qafilə,
Dedi bunlara sorayım bir hələ.
Sürdü atın iləri, verdi səlam,
Aldılar cümlə əleyki, xasü am.
Vərqa sordu kim, Yəməndən nə xəbər,
Bunlar aydur: – Sormağıl, ey pürhünər

Kim, nə deyəlim Yəmən hali nədir,
Ləşgəri-ənbuh anın üstündədir,
Kişşü bəhreyn ləşkərilə bil, ey yar,
Şəhri qılmışdır Məlik Əntər hisar.
Şimdi altmış bin Səlim şahi-Yəmən,
Dutulubdur ki, eşit bu sözü sən.
Şəhr içində xəlq ilə mirü vəzir,
Aciz olmuşdur hisar içrə əsir.
Ol xəlayiq bükülmüşdür varin,
Şəhri almağə durur bu gün, yarin.
Bəglərin, şahların, vəzirin halı bu,
Dedilər əzmin biləlim qancaru...
Aydur dedi: – Eü əcəb nə qılayın,
Qanğı həsrət oduna yaxılayın.
Ya ata ğüssəsi, ya Gülşah odu,
Ya dayım qüssəsi, nedəyim dedi...
Sürdü atın, irdi şəhrə, nə görür,
Ol qamu yazi dolu ləşgərdürür.
Vərqə baru yolunu dutdu gəlir,
İrdi baru dibinə, gör nə qılır.
Gecənin keçmiş idi bir uluşi,
Vərqa aydur, oyanıq varmı kişi.
Dedilər: – Kimsən, nə dilərsən yigit,
Nədir adın, nə işə gəldin, ayıt?
Dedi kim: – Ya pasiban, Vərqə bənəm,
Dostam sizə, yağiyə düşmən bənəm.
Pasiban aydur: – hələ dur, ya əmir,
Bir varayın görəyin, nə dar vəzir...
Çün vəzir eşitdi, şad oldu canı,
Gəldi baru üstünə, gördü anı.
Dedi tez tartın yuqarı Vərqəyi,
Yuxarı tartdılar ol tolu ayi...
Bəglər ilə ol dayın dutğundurur,
Ol məlik Əntər yavuz məl’undurur.
Bu hasar içində canə gəlmişiz,
Bu qövim əlindən aciz qalmışız.
Bu çəriyə verimədik biz cavab,

El, vilayət cümləsi oldu xərab.
...Baru üstündə bəşarət urdular,
Zövqü işrət xoş tamaşa qıldılar.
Ta səbah olunca cümlə xasü am,
Məşğul oldu işrətə xoş şadü kam.
Ertə oldu, ol çəri tənləşdilər,
Vərqə hökm etdi, qapuyi açdılar...
Kosü hərbivü nəğara urdilər,
Bunlara qarşu çıqub səf durdilər.
Şəhərə qarşu Məlik Əntər məgər,
Səf dutub durmuş idi səksən bin ər.
Çün nəzər qıldı Məlik Əntər ana,
Tanladı yəvlaq anı, yəvlaq dana.
Dedi bunlara nə gəldi, ey əcəb,
Kim şəhərdən çıqmağı qıldı tələb.
Bu gecə şəhrdə bəşarət urdular,
Şimdi çıxıb bizə qarşı durdular...
...Məlik Əntər buyurdu kim, çəri
Hazır olub bəklədilər yolları.
İki ləşkər biri-birinə yönü,
Dikdilər sancaq, ələm çalış günü.
Urdular kusu nəğarəvü nəfir,
Nərələrdən hayü huy dadigir.
Oldular iki yənadən intizar
Kim, girə meydanə qanğı namidar.
Sürdü atın Vərqə meydanə girir.
Bir zəman lə'bilə cövlan göstərir.
Nə'rə urdu şirüvar ol pəhləvan
Ya Məlik Əntər, ver bizə nocəvan.
Çün Məlik Əntər buyurdu bərki ər
Həmlə qıldı Vərqəyə ol pür hünər.
Urdu bir zərb, Vərqə öldürdü anı,
Dedi şaha ki, mübarizin qanı.
Həmlə qıldı bir dəxi, anı daxı,
Öldürübən canına urdu dağı...
Müxtəsər qıl, etmə qissəyi diraz,
Qırq mubariz öldürür ol sərfiraz...

Zərbü asayiş uruldu döndülər,
İki ləşkər atdən enib qondulər.
Qarşu gəldi Vərqəyə ol dəm vəzir,
Döşədi atı ayağına hərir...
Şəhrə girib qapuları yapdılar,
Vərqa önündə qamu yer öpdülər.
Çün səraya girdilər, oturdular.
Vərqə üçün bəzmi-işrət qurdular.
Bunlar anda zövq içində şadükam,
Tışrakilərdə nə nitqü, nə kəlam.
Cümləsi dəmbəstə qaldılar bixəbər,
Bilmədilər kimdürür ol şirü nər.
İki ləşkər qıldı aram ol gecə,
Ertə atlandı çəri ucdan-uca.
Yan-yana səf dutubanı durdular,
Zərb üçün kusü nəğarə urdular.
Vərqə meydanə girir ol gün dəxi,
Öldürür yetmiş bəhadır, ey əxi.
Əntər aydur: – Təblü asayiş urun,
Bu gecə bir pəhləvan istək bulun.
Ərlik ilə ol buna qarşu dura,
Endirəcək gürzü fərqinə ura.
Təblü asayiş uruldu, ol çəri
Geri döndü çadırına hər biri.
Vərqayi izzət ilə gətirdilər,
Şəhr içində giribən oturdular.
Xoş yemək, içmək, yenə zövqü səfa,
Qıldılar Əntər çərisinə cəfa.
Qayğılı oldu Məlik Əntər yenə,
Qaldı heyran Vərqənin ərliginə,
Ol gecə bunlar yenə qıldı qərar,
Ertə oldu, yenə oldular süvar.
Qapı açıldivü tışra gəldilər,
Vərqə ilə, ol yigirmi dört bin ər.
Durdular səf tutdular, sancaq, ələm,
Urdular kusü nəğarə ol zəman.
Bu yənadən bindilər səksən bin ər,

At ayağında cəhan zirü zəbər.
Kus ünündən toldu aləm zəlzələ,
Nə'rələrdən qıldı adəm ğülğülə.
Sürdü meydanə yenə Vərqə atın,
Rast qılmış kənduyə cəng alətin.
Dedi şaha ər veriniz cəng içün,
Can əlimdən qanda alsan bu gün.
Ol çəridə var idi bir pəhləvan,
Korbuz idi ləşkərində qamudan.
Ləşkərində pəhləvanlar çox idi,
Andan ulu pəhləvani yox idi.
Gəldi, aydur kim şəha: – Dəstur ver,
Kim girəyin meydanə bu gün bən, – der.
Ol Məlik Əntər ana: – varğıl dedi,
Gürzün anın fərqinə urğıl dedi.
Sürdü meydanə atını ol süvar,
İrdi Vərqə qatına ol namidar.
Bir-birinə çün müqabil oldular,
Ortaya dəkin bərabər gəldilər.
Qaqıdı Vərqa ana dürtdi qılıc,
Kənduyə aydur buni tez iki biç.
Vərqə endirdi qılıcı üstinə,
Ol süvari iki bölmək qəsdinə,
Pəhləvan qalqanını qarşu verir,
Qüvvətilə Vərqə tiğin endirir.
Tiği bir an əydi kəsdi qalqanı,
Fərqinə keçdi iki biçdi anı.
Düşdü atdan çün Məlik Əntər, görür,
Ləşkərə həmlə qılın, der, buyurur.
At başını saldı səksən bin çəri,
Həmlə qıldılar qamu nə kim vari.
Nə'rələrdən hayü huyü dadigir,
Göğ yüzünə çıqdı fəryadü nəfir.
Başlarının üstündə çaqqaçaq tiğ,
Enər idi göğ yüzindən pey dəriğ
Ki, ərənlər kürz əlində çaqqaçaq,
Uruşur, yəğmur kibi dökülür oq.

Vərqəvü nopəhləvan ol pur hünər,
Həmlə qıldı ləşkərə ol şirü nər.
Şöylə heybət göstərir qamusuna,
Qəsd qıldı kim çəri ol dəm sına.
Təblü asayiş uruldu ol zəman,
Bir-birindən ləşkər ayrıldı rəvan.
Vərqa döndü, ləşkəri daxı dönə,
Gör Səlim şahin vəziri nə qıla.
Qarşu gəldi Vərqəyə ol dəm vəzir,
Dedi: – Pir olğıl həmişə, ya əmir.
Vərqə aydır: – Ya vəzir, olğıl süvar,
Bir görəlim nə qılır pərvərdigar.
Çün vəzir atlandı, şəhrə gəldilər,
Qapu yapub kilidini urdular.
Vərqə ilə ləşkərü həm xasu am,
Girdilər ol dəm sərayə şadü kam.
Vərqə çünkim keçdi kürsü üstünə,
Məşğul oldu işrətə dönə-dönə,
Gör məlik Əntər ol yənadə nedər,
Döndü kəndu barigahına gedər.
Gəldi qondu könlü əndişə tolu,
Dedi: – Ey bəglər qamu kiçi, ulu.
Nə qılalım imdi ana, ya vəzir.
Bu yigid içün siz qılın bir tədbir.
Nə kişidir bilməziz, kimdir hələ,
Pəhləvandır, qamusun verdi yelə.
Ərlik ilə, cəng ilə çıqamadıq,
Bunu atından yerə yıqamadıq.
Biz bu şəxs ilə əcəb nə qılalım,
Bari siz nə dersiz, aydın biləlim.
Əntərin xod bir vəziri var idi,
Bir cuhud idi, yavuz murdar idi.
Dedi şaha olmasun könlün məlul
Kim, Yəmən sultanının xəsmidir ol.
Bu yigid bil kim, Yəmən sultanının,
Qızqarındaşının oğludur anın.
Ol bu işləri tayısiçün qılır,

Cəng içində məsti-divanə qılır.
Anın üçün ol məlul eylər səni,
Ta məgər kim, qurtara tayisini.
Hökmi qıl meydan içində bu gecə,
Dar ağacların dikələr ki, yucə.
Hazır olar zər bina dəkir varı,
Ertə atlansın bu səksən bin çəri.
Səf dütüban şöylə hazır duralar,
Ər yerində ər kibi ər olalar.
Şəhər xəlqi çün qapu aça çıqa,
Dar ağacların görə bunlar baqa.
Ol yənadən baxıban anı görə,
Sanma kim, ayruq sana qarşu dura.
Taqəti taq ola, güci qalmaya,
Ləşgərə ayruq müqabil olmaya.
Çün səbah oldu Məlik Əntər gəlir,
Ləşgərilə atlanır, qarşu durur.
Götürürlər şah ilə altmış bəgi,
Dəkmə içün dikdilər bir dirəgi.
Bu yənadən çünkim açıldı qapu,
Vərqə bilə çıqdı ərənlər qamu.
Baxdı gördü ol qövim ulu, kiçi,
Gördülər qamu dutmuş meydan içi.
Şəhrə qarşı çoq dirəklər urulur,
Dar ağacları, siyasət qurulur.
Ditrədirdi yeri təblin ğərvəşi.
Heybət alır bunları görən kişi.
Bəglər ilə ol Səlim şahi-kəşan,
Dar ağacına yetirdilər rəvan.
Vərqə ilə çün vəzir anı görür,
Vərqə aydur kim, bular kimlərdürür.
Var isə tayum ilə altmış əmir,
Bu siyasət bunlarındır ya vəzir.
Bunlara şimdi nə çarə qılayum,
Dövlətimiz günəşi sənsən, bəgüm.
Vərqə aydur vəzirə kim, nedəlim,
Bu siyasətdən necə sirr alalım.

Sən bilirsən neyləmək gərək bizə,
Biz qamumuz bəndəfərmanuz sizə.
Hər nə kim siz hökm edəsiz biz anı
Qılavuz, dedi yigitlər arslanı.
Vərqə aydur: – Allah övkarə işi,
Bu yigirmi dörd bin ərdən bəg kişi,
Seçiniz kim ki, bəhadır olalar,
Ərlik içdə qiyməti-dürr olalar.
Ahənü-pulad ola həm topları,
Bu gün üçün ola qamu günləri.
Beş yüzünün həmləsi darə ola,
Başəd ol acizlərə çarə ola.
Beş yüzü bənümilə ləşgər yolun,
Bağlayalım bunların sağın, solun.
Qurtula başəd ki, ol biçarələr,
Qamusuna irə həqdən çarələr.
Şöylə dedi kim, seçildi ol bin ər,
Vərqə aldı beş yüzin, ol pürhünər.
Beş yüzinə dedi, siz həmlə qılın,
Dar ağacın bəglər ilə siz bilin.
Həmlə qıldı Vərqə ol beş yüz ərlə
Kim, bular ol ləşgərin yolun alə.
Darə həmlə qıldı ol beş yüz kişi,
Eşit imdi ki, necə olur yigit işi.
Ol Məlik Əntər buyurur gəzdən vari.
Bu yənadən bu yigirmi dört bin ər,
Nə’rə urur, hayqırır, həmlə edər.
İki dərya taşubən aqışdılar,
Mövc urub bir-birinə qavuşdular.
Vərqə ol dəm qəlbə urdu kəndüzin,
Yırttı qəlbin çün şəha, dikdi gözin.
İrdi endirdi qılınc ol pəhləvan.
Kəndüsin sevdi Məlik Əntər rəvan.
Təxti üstündən müəlləq yıqılır,
Qarşu bəglər Vərqənin yolun alır.
Vərqənin bəglər qəfasın beş yüz ər,
Bəglərindən Əntərin, ol şirü nər.

Bir qaçın öldürdi, yetdi Əntərə,
Dutdi bərk bağladı, ilətür ləşgərə,
İlətdi anı ol vəzirin qatına,
Vərqə bunda qamçı urdi atına.
Külli-külli ləşkər önündən qaçar,
Hər kimə uğrar isə iki biçər.
Gördilər oldu Məlik Əntər əsir,
Təbli-asayiş urun, dedi vəzir.
Çünkü çıqdı təbli-asayiş ünü,
Oldu sadirdən yana xəlqin yöni.
Bir-birindən çünkim ayrıldı sipah,
Kimi xürrəm, kimisi qılırdı ah.
Qarşu gəlibən vəziri-namidar,
Vərqə üstünə qılur gövhərnisar.
Aydur idi kim, şad ol ey pəhləvan,
Yox sənin mislin kibi sahib-qiran.
Vərqə ilə şah vəzirü döndülər.
Şəhrə giribən saraya qondular.
Bular bunda tamaşa qıldılar
Eşit imdi ləşgəri-Əntər nedər.
Ol xəlayiq döndü kiçivü-ulu,
Qondular çadırlarına qayqulu.
Ol çəri bəgləri bindi atına,
Gəldilər Əntər vəzirin qatına.
Dedilər şimdi necə olur tədbir,
Ələ girdi şahımız, oldu əsir.
Ol vəzir aydur kim, ey bəglər yarın,
Məhv edəməz könlümüz qayğıların.
Ol qövm ilə müamilə qılavuz,
Şahimizi hiylə ilə alavuz.
Aydəvüz kim, şahiniz alın sizə,
Şahimizi siz dəxi verin bizə.
Olmaya daxi sizinlə cəngimiz,
Qalmaya aşib içün ahəngimiz.
Razı olalar bu qövlə çün bular,
Şahimizi veribü şahini alar.
Ol yanadən bir beş-on kişi ilə,

Şahimizi veribə yayalar belə.
Bu yənadən bir dəxi şahlarını,
On kişi ilə veribil yavuz anı.
Bunlar iricə gün orta yerə,
Kim bunları biri-birinə verə.
Pusu iki yüz kişini ki, həmin,
İkisin daxi ala duta həmin.
Bunlar etdilər bu tədbiri üçün,
Kim nə bilür kimsənin könlün için,
Ol qövim şöylə danışdı ol işi,
Pusuda qodilər iki yüz kişi,
Qıldılar ol gecə qaravul faş məgün,
Çün sabah oldu başın qaldırdı gün.
İki yanadən nağarə urdular,
İki ləşkər müqabil qondular.
Vərqə dilədi ki, meydanə girə,
Bunlara ərlik necədir göstərə.
Vərqəyə, elçi verilibdi vəzir,
Şahiniz alın geri, der, ya əmir.
Şahimizi siz dəxi verin bizə,
Qılmayavuz biz xüsumətdir sizə.
Fitnəyi götürəlim, sülh edəlim,
Barışıban elimizə gedəlim.
Vərqə aydur raziyüz biz bu işə,
Şahımız qurtula bizə qavuşa.
Razı oldular ki, şahi alalar,
Biri-biri ilə islah olalar.
Ol yənadən veribidilər ani,
Bu yənadən ilədürlər həm buni.
Belə vardi ol dəvəçilərə,
Eşit imdi Vərqə andə nə qıla.
Vərqə don dəgşirdi ol dəm kəndözin,
Sarvanlar şəkilinə urdu yüzin.
Çün bular orta yerə irişdilər,
Bir-birinə ipini sunuşdular.
İki yüz ər cümlə dəmir donları,
Həmlə qıldı kim, əylədə anları.

Həmlə qıldı Vərqəyi-çapük səvar,
Qıldı bunları şoluq dəm tarümar.
Vərqə dayısın geri aldı gəlür,
Şahlarını ol qövüm daxı alur.
Tayısin aldi bəgələrlə belə,
Şadü xürrəm, qayğusuz girdi yola.
Əlini öpdü Səlim şahın vəzir,
Urdular təblü asayiş, həm nəfir.
Şahi yenə təxtinə keçirdilər,
Şad oluban qayğısız oturdular.
Əntəri xiyməsinə gətirdilər,
Daneş-kəbir bərin oturdular.
Dedi, bunlara vəzir, nə qılalım,
Bari siz nə dersiz, aydun biləlim...
Dedi, ya vəzir bunun tədbirini,
Qıl bəyan bu müşkülün tə'birini...
Dedi: – Şaha, işbu gecə sən buyur
Kim, uyumuş olalar vəhşü tüyür.
Ta ki, meydan ortasında üzərü,
Bərgə qazsınlar xoş anı düzərü.
Xarü xaşagilə üstin örtələr,
Kimsə görmədin qətindən gedələr,
Ertə hökm eylə ki, ləşkər atlana,
Bunlara qarşu dura səf-səf yenə,
Tuğü bəndə, kusü hərbi urdular.
Cəng içün meydanə bər xoş durdular...
Çün görələr bizi kim, cəng istərüz,
Bunlara qarşu dura səf-səf yenə,
Tuğü bəndə, kusü hərbi urdular.
Cəng içün meydanə bər xoş durdular...
Çün görələr bizi kim, cəng istərüz,
Bunlara qarşu yaraqlar, düzərüz.
Lacərəm bunlar dəxi atlanalar,
Ğeyrət edib bizə qarşu duralar.
Qapu açıb qamusu tışra gələ,
Qaqıdıban ol yigid kürzin ala.
Səf dutubən ol bizə qarşu dura,

Ol giribən meydanə cövlan ura.
Kimsə girməsin necə kim ər diləyə,
Ləşgərindən nə süvarü nə yəya.
Çün görələr həmlə qılmadıq bizi,
Ol xod bizə həmlə qıla köndözi.
Qəlbimizə qəsd edə ol pəhləvan,
Gəlirikən bürgəyə düşə rəvan.
Dörd yənasindən burağalar kəmənd,
Sürüyü gətirələr bu yanda bənd.
Məkr ilə ol şəxsi çünkim, dutavuz,
Ərlik oyunun biz bulardan alavuz...
Çün səbah oldu Məlik Əntər yenə,
Hökm qıldı ləşkərə kim, atlana
Atlanıban cümlə hazır durdular,
Nagəhan kusü nəğarə urdular.
Ol çəri cümlə dəmir geydi donu,
Müttəsil oldu gögə hərbi ünü.
Çün Səlim şah eşidir, aydür: – Durun,
Atlanılım, qövli yoğ imiş bunun.
Bindi şol dəmdə Səlim şahi-Yəmən,
Beləsində Vərqəvü ləşkər kəşan.
Qəlb urub ləşkər səvaşın bağladı,
Heybəti düşmənin qəlbin dağladı.
Vərqə meydanə girər cövlan urar,
Ol dilavər at başın dartar durar...
Atdan endi Vərqə bərkitdi atın,
Bərkidəsi hər nə kim var alətin.
Kəmənd urdu ata, oturdu geri,
Qamçıladı sürdi atın iləri.
Yel kibi yetdi rəvan ol pəhləvan,
Ol araya kim, oradə bürgə var.
At əyağı keçdi oldu sərnigün,
Nagəhan irdi qəza, ol neyləsün...
Xəlq üştə gəldi kəməndlər atdılar,
Vərqəyi ol dəm giriftar etdilər...
Şadü kam oldu Məlik Əntər əzim,
Getdi könlindən ina’ü rəncü bim.

Gəldi qondu çadıra könli fərəh,
Badəyə toldi şərab, işlər qədəh.
Yürüdür saqi şərabi-lə'ligün,
Ol gün oldu bunlara ağır dügün.
Gecəyə dəkin təmaşa qıldılar,
Məclis əhli cümlə sərxoş oldular.
Çünkü keçdi gecənin bir ülüşü,
Əntər aydur, qanı ol bağlı kişi.
Bir varın anı gətirin tez bana,
Ta ki, bən verəm cəzasını ana.
Vərqəyi gətirdilər bağlı durur,
Çün Məlik Əntər baqır anı görür.
Dedi, yə'ni sən bilirmisən bizə
Kim, nələr qıldın, nədir sana cəza?
Vərqə aydur, bən əlimdən gələni,
Ləşgərinə, sana qıldım bən ani.
Sən dəxi nə kim, dilərsən anı qıl,
Uş sözün doğrusu budur bəllü bil.
Çünki eşitdi sözin ol sərvərin,
Bir silahdarı var idi Əntərin.
Qaniçici, qabqara rəngli idi,
Dedi, ilət tez bunu öldür, dedi.
Aldı ol zəngi ğulam anı gedər,
Vərqə ahü naləvü fəryad edər...
Vərqə mə'şuqi içün ağlar idi,
Eşq oduna canını tağlar idi.
Zənginin özü göynədi ahinə,
Şe'r aydur ağlayu Gülşahinə.

ŞE'R

Aydur, ey aşiqi-zibam bənim,
Eşqinə olsun fəda canım bənim.
Ol qamu xubi-Xütən, mahruyi-Çin,
Cümlə hüsnün xərmənində danə çin.
Görkünə heyran olur insan qamu,

Ey bulardan sən lətifü nazənin
Ya nigarin, işbu çərxü işbu dün,
Bağladı bən miskin-aşiqinə kin.
Ömrumun əkini yaş ikən hənuz,
Uş silsilə olmadın vəqti-əncin.
Çərx zalimdir, kimə verdi aman,
Dövri fanidir, kimə oldu əmin.
Ey diriğa, həsrətü dərdü fəraq,
Bən qəribəmi oldu həmin ağrın.
Sən içində dəgmə ahim həmişə,
Zar ilə həm toldurum sinim için.
Gözlərimdən yaş yerinə qan axıb,
Aydərəm, va həsrata, ya yövmi-din.
Ölülər qamu sinindən duricəq;
Turam aydim, ya ilahül-aləmin.
Öldügüm içün dəgül ahim bənim,
Ey diriğa, qanı Gülşahim bənim.

* * *

...Zəngi heyran oldu bunun dərdinə,
Xod nə məcnun edə eşqi, gərdinə.
Döndi qul aydur ana: – Ey pəhləvan,
İşbu qamu qıldığın zarü fəğan,
Nə içündür, dərdini söylə bana,
Çarə ola başəd ki, bəndən sana,
Halını yəvlaq əcəb gördüm hələ,
Sözünü söylə əyan, gətir dilə.
Vərqə aydur: – Ya ğulam, ayıt bana,
Eşq hərgiz vaqe’ oldumu sana.
Ol ğulam aydur: – Bəli, bən aşiqəm,
Eşqim əsildir, yolumda sadiqəm.
Xacəm oğlunu sevərəm can ilə,
Yaxılıram dərd ilə, dərman ilə.
Çərxi-ğəddar andan ayırdı bəni,
Göynürəm eşq oduna dünü-güni.
Vərqə aydur anə kim, – məktəbdaşız,

Eşq içində ikimiz məzhəbdaşız.
Aşiqəm, zarəm, muradə irmədim,
Geri varıb şahimi bir görmədim.
Eşq əlindən yürəgimi tağlaram,
Sanma kim, öldügim içün ağlaram.
Ol ğulam aydur ki: – Eşit, ey yigit,
Nə kişiyə aşiq olmuşsan, ayit.
Vərqə aydur: – Sən sənin işini qıl,
Bu bənim eşqimi, mə’şuqim qoğıl.
Döndü aydur, ol qul geri ana: –
– Sən kimə aşiqsən, ayıt bir bana?
Vərqə aydur: – Məkkə elidir elim,
Seyr edirkən bunda uğradı yolum.
Vərqə aydur, adım Hümam oğlu bənim,
Aşiqəm Gülşahə, oldur mə’şuqim.
Haliya, zəngi eşitdi bu sözü,
Ahi qıldı yaş ilə toldu gözü.
Ol qılıc əlindən düşdü bir yana,
Vərqə sənmisən, deyü sordu ana.
Dedi: – Ya Vərqə, bəni bəllü bilin,
Bənəm axir ol sənin zəngi qulun
Kim, biti verdin bana, ey pəhləvan,
Gətirəyim tayına bən, nagəhan...
Bundə gəldim, uş Məlik Əntər bəni,
Qıldı cəllad ta ki, uş buldum səni.
Yüz Məlik Əntər kimiyə verməyim,
Bir qılıncı qəsd edibən üzməyim.
Vərqənin ol qul ayağına düşər,
Əl uruban əli bəndini şaşər.
Qul qılıcı verdi Vərqə əlinə,
Dedi: – Bunda dur sən, uş gəldim yenə.
Atü ton gətirəlim, sazü sələb,
Tez gedəlim, ya fütuhü bül-əcəb.
Vərqə anda qıldı bir ləhzə qərar,
Qul gətirdi iki at ki, üstüvar.
At ilə sazü silah ilə təmam,
Bağlanıb bindi ata Vərqə, qulam...

Vərqə keçdi barigahın ardına,
Cümlə uyur, bir kişi yoq kim dinə,
Girdi gördü kim, Məlik Əntər yatır,
Kənduyə aydur ki, tez işin bitir.
Dürtdi xəncər, kəsdi başın Əntərin,
Qoydu başın at torbasına anın...
İrdilər bir dəmdə baru dibinə,
Dedi, açın qapuyi, gəldim yenə...
Vərqəyə çünki qapuyi açdılar,
Vərqə tayisilə həm qucuşdular.
Dedi, ya Vərqə necə qıldın, dedi
Kim, ədüdən qurtulu bildin, dedi,
Vərqə aydur, tanrı qurtardı yenə,
Torbayı silkədi Səlim şah önünə.
Gördü tayısı Məlik Əntər başı,
Dövlət anın başına urdu taşı...
Vərqəyə qıldı Səlim şah afərin,
Dedi kim, ancaq ola ərlik həmin...
Şah buyurdu kim, bəşarətlər urun,
İşrətü zövqü təmaşalar qılun...
...Vərqə aydur kim: – Bana dəstur ver
Kim, varım qövmimə, elimə, der.
Ol dayısı aydur: – Ey arı gövhər,
Bir ləhzə dinləmədün, ey şirünər...
Vəqtidir kim, zövqü işrət sürəvüz,
Bir neçə gündür ki, səni görəvüz,
Bir beş-on gün dinlənüb nuş edəsən,
Son uci xoş göndürəyim, gedəsən.
Sözünü sındırmadı, ol neyləsün,
Qaldı bir qaç gün dayısı könliçün.
Vərqə anda qaldı kim, işrət edə,
Sən eşit imdi sultani-Şam nedə.
Şam elində var dəxi bir padişah,
Adı Möhsün, kəndözi zərrin külah.
Təxt önündə otururdu şadü kam,
Söylə idi mahrulardan kəlam.
Hər biri bir dilbərin vəsfin qılır,

Məclis əhli eşidib təhsin qılır,
Xub Bulğarü Buxaravü Əsbay,
Çinü Maçinü Səmərqəndü Səray.
Hindü Xarəzmü Xorasanü İraq,
Rumü Şamın görklüləri ittifaq...
Var idi bir taciri Şah Möhsünün,
Elində malın işlədirdi anun,
Ol dəxi həm bu yana gəlmiş idi.
Padşahına töhfələr almış idi.
Gəldi gördü görklülərdən hər biri,
Qıldılar təqrir edib bir dilbəri.
Tacir aydur ki, – Ya Məlik, agah ol,
Xubların gərçi aləm içində bol.
İlla şaha, Məkkə elində Yədi,
Bir qövim vardır Bəni-Şeyba adı.
Bunların iki rə'isi var dürür,
İkisi daxı qarındaşlar dürür.
Biri bəg, adı Hümamü namidar,
Ol birinin Hilali-şahsüvar.
Ol Hilalın ki, arı sahib cəmal.
Qız yerinə huri vermiş zülcəlal.
Adı Gülşahi nigari gülşənin,
Şahi-aləm layiğindir ol sənin.
İncə ögdi tacir onun görkini
Görmədin sevdi Məlik-Möhsün ani.
Dedi: Ya tacir, əgər sən ol qızı,
Gər dilərsən rədd edərlərmi bizi.
Dedi: Şaha, bilməzəm rəddi, qəbul,
Hüsn içində bəlkə bin incidir ol.
Qıldı əndişə Məlik-Möhsün ki, bən,
Tacir olubən diləyim qızı bən.
Qıldı tacirlik fərağın kənduyə,
Taciranə donlarını həm geyə.
Bin qul aldı, bin qaravaş, bin qatır,
Bin at aldı, bin dəvə, qoyun, sığır.
Şah buyurdu ol aradə düşdülər,
Ol dəvələr çökdi yükin şeşdilər.

Bir-iki gün anda qıldılar qərar,
Ol aradan keçdi, dartıldı qatar.
İrdilər andan iləri bir bəgə,
Gör ana daxi nə lətifi dəgə.
Ol bəgi daxi qılır şöylə ğəni,
Duşda görmüşdi məgər ol bəg ani...
Şah genə bir-iki gün anda qalır,
Həm ana daxi telim bəxşiş verir.
Necə verdi ana daxi simü-zər
Kim, yayıldı Bəryə xəlqinə xəbər...
Keçdi andan, müxtəsər qıldıq sözü,
Hər əmirə kim, irişdi kəndözü.
Qul, qaravaş, aqça, pul, altun, gümüş,
Kim uğrar isə verdi yadü biliş.
Çün Məlik-Möhsün çıqdı qəvi,
Bəryə bəglərinə yayıldı çavı.
Bildilər Heyyi-bəni-Şeyba qamu
Kim, gəlir bir ali bazirgan ulu.
Lütfü əxlaqi səxavət kanidir,
Xatiri, cudi-kərəm ümmanidir.
Bəryə bəgləri anın ehsaninə,
Afərin qıldı qamusu caninə.
Bu comərdliki kim, Möhsün edər,
Aldılar Heyyi-bəni-Şeyba xəbər.
Kim irişdi bir dəm ol ər bigüman,
Ol mübarək tacir uş gəldi əyan.
Çün Hilal anı eşidir ki, gəlir,
Atlanır qarşu durur, izzət qılır...
Lə’lü yaqutü zümürrüd həp-göhər,
Qiyməti taşlar, zəbarcəd, simü-zər.
Qul, qaravaş, at, qatır, qoyun, dəvə,
Beş kişini Hilal ilətdi evə.
Ancə verdi kim, ğəni oldu Hilal,
Qul, qaravaş, qiyməti daş, dürrü mal...
Geri döndü, evinə gəldi Hilal,
Övrətinə söylədi kim, ya cəlal
Gördüm ol tacir zəhi xoş adəmi,

Söhbətinin canə dəgər bir dəmi.
Bu nə lütf olur, nə əxlaqü kərəm
Kim, qatında pulca yoqdur dərdi-rəm...
Ərü övrət cudinə heyran olur,
Tanlaşırlar kim, bu nə ehsan olur,
Qıldılar bunlar qonaqlığa yaraq.
Tutdular Möhsün içün bir xoş odaq,
Oxudular anda Xoca Möhsüni,
Dedilər bir dəm görəlim biz səni.
Aldılar anı otağa gəldilər,
Ana üç gün xoş qonaqlıq qıldılar.
Çünki bunlar hörmətini bitirir,
Gəldi geri çadırına oturur.
Hər kim anı görməgə gəlir idi,
Gümüş, altun çox ana verir idi.
Ol qövümdən qalmadı ərkək, dişi
Kim, buları qılmadı şah bəxşişi.
Bir neçə qövmi məgər kim bir gün ol,
Gülşahçün verib idi andə rəsul.
Ta ki, Gülşahı diləyə şah içün,
Gəldilər söyləməgə ol mah içün...
Dedi: – Varın aydınız ol tacirə
Kim, bu sözün tərkini külli ura,
Bən qızımı namizəd eyləmişəm
Kim qardaşım oğliçün söyləmişəm.
Çün bu sözü Möhsünə yetirdilər,
Gəldilər san kim, cana od urdular.
Aşiqü heyranidir Gülşahə şah
Kim, canı oda düşübən qıldı ah...
Dedi: – Aydınız Hilalə, ol yigid,
Binəvalıqdan qoyub getmiş qəsid.
Nəsnə yoğimiş ki, anıt verə,
Ol xəcalətdən gəliməz bu yerə...
Bən yalunuzam, kimsənəm yoqdurur.
Malım, əsbabım, xəzinəm çoqdurur.
Nə atam, nə anam var, nə qövüm,
Nə qəbiləm, nə xəsimüm, qardaşım.

Lütf edib bəni oğulluğa qəbul,
Gər qılalar, oluvən ölüncə qul.
Dünü gün xidmətlərində oluvən,
Ömrüm olduğunca bunda bilüvən.
Gər qəbul olur isə bu hacətim,
Bunların fərmanı ola taqətim.
Ol cəvahir taşları ol qövm alır,
Barigahindən Hilal evə gəlir.
Dedi: – Ya övrət, bu gün ol tacir ər.
Sən nə aydurəsən Gülşahı dilər.
Övrət aydur: – Qismət olsa görəlim.
Xoş yigitdir, dilər isə verəlim.
Hilal aydur övrətinə kim, bu söz,
Olmaz, anı Vərqəyə biz vermişiz.
Övrət aydur ərinə kim, ya Hilal.
Biz işindən Vərqənin olduq həlal.
Əvvəl ol kim, Vərqənin yoq bir yolu,
Həm ikinci, getdi gəlməz ol qulu,
Kəndü qırq gündə gələm dedi bizə,
Uş iki ay keçdi gəlməz, bu sözə,
Vermədi dayısı hiç nəsnə ana,
Gəlməz ol bunda, bən ayıtdım sana.
Gəl bu bazirganə verəlim bunu,
Söyləmə qo, Vərqənin kəs sözünü.
Olmadı razı Hilal, ol övrəti,
Bu sözi yəvlaq becid tutdi qəti.
Söyləşir idi ki, bu sözü bular,
Ol təbəqli cövhəri gətirdilər.
Dedilər, dəsturi varmı bir görək,
Verdilər dəsturi, dedilər gərək.
Girdilər bunlar içəri çadıra,
Bir təbəq var əllərində nadirə,
Övrətlə çün Hilali kim, gördülər,
Qodilər ol tası önündə bular,
Dedilər, Xoca sizə veribidi,
Dedilər, ta kim, Məlik-Möhsün dedi.
Dedilər, tacir duaçındır, sənin,

Açıdı içindəkin gördi təbəqin.
Qiyməti taşlar tolu, dürrü yətim,
Cövhər, altun duşlu, anın içi sim.
Nəsnə gördü ol təbəq içrə Hilal,
Duşda görməgin anı hənuz Hilal.
Çünki gördi övrət ol cəvahiri,
Könül oldu Vərqədən külli bəri.
Qız atası aydur ol dəm bunlara,
Bən qızımı verməzəm iki ərə.
Ol qövim kim, bu sözü eşitdilər,
Cövhəri andə qodilər getdilər.
Gəldilər Möhsün qətinə, sözlərin
Söylədilər qamusunu bir-birin.
Dedilər, ya Məlik qaqır bizə,
Qız atası razı olmaz bu sözə.
Çünki eşitdi Məlik-Möhsün anı,
Biqərar oldu bu gəz yandı canı.
Nə dünin aram edər, nə gündüzin,
Eşq oduna saldı külli kəndözin.
Əqli, ussi ki, gəlir heyran olur,
Ol arayə bir qarı övrət gəlir
Kim, anun evi Hilalın evinə,
Qonşi idi ol qarı övrət yenə...
Oxudu xəlvət Məlik-Möhsün anı.
Ancə ehsan qıldı kim, oldu ğəni,
Aydur ana, ya ana səndən ola,
Gətirəsən işbu işi səhilə.
Aydur, oğlum, bir ulu buğdan gərək,
Küpə altunü bəzəklər dürr gərək.
Ənbərinə doqquz zərrin qolbağı.
Anun ilə çoq biləziklər daxı.
Yağlığa toldurdu cəvahir ki, arı
Kim, görə Gülşah atası anları.
Meyl edər qızını ana verməgə,
Vərqənin qəsd edə tərkin urməgə...
Ol qarı anları alır gətirir,
Gülşah anası baqır anı görür.

Vərqədən küllü döndərədi yüzün,
Meyli oldu kim, verə anə qızın.
Dedi: – Var bəndəm salam ayıt tacirə,
Atasına deyəyin qızın verə...
Övrət aydur ərinə kim: – Ya Hilal,
Ver qızını tacirə sözümü al,
Gəl verəlim bu Gülşahı buna,
Tanrıdan qorq, der Hilal, aydur ana.
Namizad oldu beşikdə uşbu qız,
Vərqəyə verdik hələ Gülşahi biz.
Həm bilirisən sən bu biçarələr,
Bir-birini necəsi sevdi bular...
Ya dəxi bunda gəlicək Vərqənin,
Yüzinə necə baqavüz biz anın.
Qismətin təqdir içində bu imiş,
Ağlamağı kəndözünə qılma iş...
Qıldılar Gülşah içün üç gün dügün,
Çarəsi yoq ol nigarın, neyləsin.
Aciz oldu, deyəsi yoq kim, dinə
Verdilər Gülşahı Məlik-Möhsünə.
Bunlara ayıdur ki, Məlik-Möhsün siz,
Sanmanuz sizdən ki, tacir aldı qız.
Ya Bəni-Şeyba, bənəm sultani-Şam,
Urulur növbət qapımda sübhü şam.
Tacü təxt issi Məlik-Möhsün bənəm,
Andadır ləşgər qamu xəyalü xəşəm.
Bən icazət dilərəm sizdən bu gün,
Səltənət təxtində kim dünü gün.
Dedi bunlar, ya Məlik xatir sənin,
Al rəvan ol qanda dilərsə canın.
Şah buyurur yüklədirlər rəxtini,
İşi bitdi, aldı tacü təxtini.
Gördi Gülşahi nigarin Vərqədən,
Ayrılur, məhrum olur candan bədən.
Bir qızoğlan razidari var idi,
Kim anı Gülşah ikən savər idi.

Hərgiz andan gizləməzdi razini,
Ol qıza aydur gizli sözini.
Dedi Gülşah, aydur – Ey gül yüzli nigar,
Saqlağıl uşbu yüzügü ki, zinhar.
Vərqənindir bu yüzük dinlə xəbər,
Vərqə bunda gəlicək görgil nedər.
Şöylə kim, bir qaçi gün zari qıla,
Son ucu eşqi odu sakin ola.
Söyləməgil, nəsnə deməgil ana,
Yoxsa şöylə kim, bəni dayim ana,
Eşq olduna yanə dünü gündüzin,
Qoma anı kim, yanura kəndözin.
Eşqə məğlubə olursa görəsən,
Ğalib olursa yüzügü verəsən.
Bunların ol hiyləsin bildir ana,
Xayin olmasun, amanətdir sana.
Ol qız aydur kim, sana qurban olam,
Hər nə dedin isə anı bən qılam.
Ol qızı Gülşah qucadı ağladı,
Vərqənin eşqi canını dağladı.
Şe’r ağaz etdi kəndu halinə,
Ol fəraqın həsrətin əhvalinə.

# MARAĞALI ƏVHƏDİ

*Zəngin və çoxcəhətli yaradıcılığı ilə klassik dövr ədəbiyyatımızda görkəmli yer tutan Marağalı Əvhəddin Əvhədi 1274-cü ildə Azərbaycanın mühüm mədəniyyət mərkəzlərindən biri olan Marağa şəhərində anadan olmuşdur. Burada mükəmməl təhsil alıb, hərtərəfli elmi bilik əldə etmişdir. Şərqin bir çox ölkələrinə səyahət etmiş, 20 ildən artıq İsfahanda yaşamışdır. 1332-ci ildə Marağa şəhərinə qayıtmış 1338-ci ildə 64 yaşında ikən burada vəfat etmişdir. Şairin xəlqilik və humanizm ideyaları ilə seçilən ədəbi irsi "Dəhnamə" və "Cami-Cəm" poemalarından, lirik şeirlər divanından ibarətdir.*

## "CAMİ-CƏM"

(*parçalar*)

### MƏĞRURLUĞUN, YÜNGÜLLÜYÜN VƏ LOVĞALIĞIN PİSLƏNMƏSİ

Ey oğul, bu yolu asta get görək,
Qoy iti gedərək qızmasın ürək...
Nəfsin şuxluq etsə, cəza ver ona,
O, cəhl qılıncıdır, qoy onu qına.
Kef çəkmək, mey içmək zamanı deyil.
Dünyanın abırı boynundadır, bil,
Bu işlə dostunu verərsən yelə,
Qoyma şad olmağa düşməni belə.
Yüngül adamlardan uzaq ol, uzaq!
Tez başı aşağı yuvarlanacaq.
Heç eşitmədim ki, toxtaq bir insan,
Olsun əməlindən bir gün peşiman.
Tapılmaz şəhərdə elə bir xətər,
Olsun yüngüllükdən daha da betər.
Çox ata hünərə sahib olsa da,
Pis övlad ömrünü tez verir bada...
Yüksək bir ad üçün çalış hər zaman,
Hamıya xoş gələn bir sifət qazan.
Çalışma etməyə onu, bunu sən,
Sən ki, başqasından artıq deyilsən?!.

Rütbəsi, mənsəbi yüksək adamlar
Ürəkdən olarlar çox təvazökar.
Kəndli hesabına yaşarsa sərhəng,
Onun bu halına ağlamaq gərək.
Kəndli hey çalışır çəkərək zəhmət,
Sənsə xərac alıb edirsən işrət.
Sonra qoruyucu adlanırsan, ah!
Sənincə, insanlıq budursa, eyvah!
Bu kefdən ötəri bir anda, yetər,
Onillik ruzini xərc etmə hədər.
Qarı ip əyirmiş ay işığında,
Rahatlıq bilməmiş o bircə an da,
Yumurta yığmışdır dözüm, səbr ilə,
Ta əmir aparsın onu cəbr ilə,
Sonra da otursun qürrələnərək.
Ah! Niyə başını üzməyir fələk?!
Zülmə ürək vermə, birdən güc gələr!
Bir sınan bir daha hardan düzələr?!
Ağacına balta vurursan neyçün?
Onu kəsəndə də barı bir düşün.
Nə qədər elm, hikmət bilirsə cahan,
Bu div zəhərinə onlardır dərman.
Əgər ağlın, ruhun kamilsə, əlbət,
Sənin qulun olar qəzəblə şəhvət.
Qovmaqçün bu iki divi dünyadan,
Nə qədər peyğəmbər məhv oldu, aman.
Sən ayaq altına alsan bunları,
Adın uca olar, başın yuxarı.
Nadanlıq camından məst olma gəl sən,
Yoxsa, birdəfəlik əldən gedərsən.

## EVİN VƏ EV ƏŞYALARININ NİZAMA SALINMASI

Xəzinə sahibi olan hökmüdar,
Adətən çox kəndlər, şəhərlər salar,
Ümumi binalar tikməklə haman,
Həm savab qazanar, həm də ki, ad-san.

Düzdür, var-dövləti bir az əskilər,
Ancaq çoxlarının işi düzələr.
Kimin fikri varsa şəhər tikdirmək,
Əvvəlcə bu işə pul qoysun gərək.
Gözəl bir yer seçib bəyənər sonra,
Böyük bir hasar da çəkdirər ora.
Əgər açıq olsa şərqi, şimalı,
Cənubu tutmağa xərcləmə malı.
Gərək mümkün olsun kəhriz, arx qazmaq,
Yaylağı, qışlağı olmasın uzaq.
Duzu, kəci, gili, odunu bol-bol,
At-eşşək üçün də olsun yaxşı yol.
Yaxında çay olsun, həm yaxşı ovlaq,
Çölündə vəhşilər eyləsin yığnaq.
Kənd salmaq fikrinə düşərsə əgər,
Ağıllı adamlar belə eyləyər.
Elə yer olsun ki, suyu olsun car,
Qaçıb sığınmağa həm uca dağlar,
Suyu şirin olsun, yeri məhsuldar,
Yaxşı əkin yeri, işlək adamlar.
Şəhər yaxın olsun, şeyxi savadlı,
Gölməli, hovuzlu, bağlı-bağatlı,
Meydan, xəndək olsun ox atanlara,
Bulaq yaxın olsun qocalanlara.
Yeri hündür olsun, yoxsa sel basar,
Pislərin yolundan həm olsun kənar.
Ev tikmək istəsən, bir himinə bax!
Hündür bir yer olsun, möhkəm də torpaq.
Çalış yaxın olsun tarlaya, bağa,
Yer olsun kürüyüb qarı yığmağa.
Torpaq yeri olsun, buğda anbarı,
Mal üçün tövləsi, samanlıqları.
Məscid də, hamam da, su da, bazar da
Mərkəzdən olmasın gərək kənarda.
Qızılın yoxdursa ev tikmək üçün,
Qoy xaslar yanında yurd salsın köçün.

## EV TİKMƏYİN ŞƏRTLƏRİ

Qonşun bilməsən ki, kim olacaqdır,
Ev üçün pul tökmək, bil ki, nahaqdır.
Bir mərd və sınanmış qonşu tap ki, sən
Ona qonşu olub ev tikdirəsən.
Yanında ev tikdir bəxtiyarların,
Dostluq et, biri ol sən də onların.
Qonşu haqq-sayını daim əziz tut,
Pis bir iş görsələr, atartma, unut.
Qohumdan-qardaşdan çox düşmə uzaq,
Özünü, onları incitmə nahaq.
Hörmət et bir qohum olsa da yaman,
O, ev düşməninidir, mütləq qorx ondan.
Qohumu-qardaşı alçaltma bir an,
Özün alçalarsan bununla, inan.
Pullusan, qohuma öymə özünü,
Səxavət etsən də, anla düzünü,
Camaat möhtacdır, gözlər pərişan,
Xalqa kömək eylə olduqca imkan.
Xəstə yoxlamaqdan darılma əsla,
Biri borc istəsə, yox demə pula.
Yetimlər üstündən çəkmə gözünü,
Dullara qəzəblə demə sözünü,
Bağ, meyvə, odunun vardırsa əgər,
Dulun, yoxsulun da payını göndər.
Kimsədən əşyanı cizləmə nahaq,
Bir susuz görəndə bulud kimi yağ.
Əgər bir dost tutsan, gəl vermə əldən,
Çalış bağladığın əhdi qırma sən.
Oxşa qəribləri, hörmətlər elə,
Qabaqla onları salamda belə.
Oxşa qəribləri qəribsən əgər.
Şəhərli isənsə evdə yer göstər.
Sən çalış şükr elə haqqa hər zaman,
Ta haqqı tanıyan, bilən olasan.
Bir və’də verdinsə yubanma, zinhar,

Bir borc eyləyəndə tez geri qaytar,
Özündən güclüylə alver etmə sən,
Yoxsa qızılını bada verərsən.
Özündən kiçiklə sən ol qardaş tək,
Özüqü qabıq say, dostu iç, özək.
Aslanlar məskəni olan bir mənzil
Namaz qılınmasa, viranədir, bil.
Taətlə, xeyirlə ev olar abad,
Xeyir olmayan ev olacaq bərbad.
Evi məscid elə, yaşa bəndə tək,
Doldur camaatı ver orda çörək.
Qoy dostlar evinə bassınlar qədəm,
Çalış düşməni də incitmə bir dəm.
Kim edə bilməsə düşməni dost tək,
Onun düşməniylə dost olar fələk.
Məqsədim budur ki, şəhər əhlindən
Yoxsullar pay, bəhrə görsünlər səndən.
Kişi etməlidir xeyiri peşə.
Ta ki, adı, evi olsun həmişə.
Evi ədalətlə, dinlə tik ancaq
Yoxsa bünövrəsi suda olacaq.

## DOSTLUQ VƏ VƏFANIN ŞƏRTLƏRİ

Dostluqda dost ilə bir ol, səmimi!
Bir qavıq içində cüt ləpə kimi.
Bir fərq görünərsə dost arasında,
İkiüzlülük var arada onda.
Bu işdə yar olmaq, dost olmaq gərək!
Yarsız iş aşmayır dünyada, gerçək.
Nə qədər bir qəsdin, bir təmannan var,
İnanma yar olsun onda sənə yar.
Nə qədər öz arzun dalınca getsən,
Qeyrə yox, özünə yar olarsan sən.
Dosta öyüdlər ver, öyüd al ondan,

Ona irad tutma, ancaq heç zaman.
Şəhərin şöhrəti olan bu dostlar,
Məhəbbət ylundan düşmüşlər kənar.
Onlar qırxmaq üçün dostluq edirlər,
Çörəkçün, aş üçün əldən gedirlər.
Dar gündə səninlə gec dost olarlar,
Dost olar, tezcə də doyarlar, aşkar.
Onlar var dostudur, alsalar əgər,
Səni məhv edərlər, qəm də çəkməzlər.
Dirəmin olarsa, dostun olacaq,
Bu yolla dirəmi səndən alacaq.
Yem versən, gözləri olacaq səndə,
Hirslənib coşacaq yem verməyəndə.
Dostluq, e'tibar olmasa əgər?!
Bu məcazi dostlar sənə, aşikar,
Həqiqi sirlərin üzünü açar.
Bu dostluqda möhkəm olmasa hər kəs,
O, dostluq yolunda bir yana getməz.
Zahirin, batinin düz olsun gərək,
Əhdi pozmayasan ta axıradək.
Əhdinə sən vəfa etməsən, düzü,
Səfa qibləsinə çevirmə üzü.
"Ey insan vəfa et əhdə" dedi haqq,
İnsan eşitmədi bu sözü ancaq.
Vəfada it ondan yaranmış üstün,
Atdan şöhrətlidir o, bax bununçün.
Vəfaya cüt olan təmiz adamlar
Vəfanı ismətdən üstün tutarlar.

HEKAYƏT

Deyirlər, ağıllı bir ustad varmış,
Nacins bir şagirdə dərs oxudarmış.
İllərlə qatlaşıb hər əziyyətə,
Dözdü çox əzaba, çox müsibətə.
Axır elm öyrənib, o, alim oldu,
Natiq və qüdrətli bir həkim oldu.

Ucaldı mənsəbi, artdı dövləti,
Şaha yaxın oldu, qalxdı şöhrəti.
Əsil mayasında yox idi vəfa,
Odur ki, ustadı salmadı yada.
Ustadın zəhməti lap tələf oldu,
Çünki öyrətdiyi naxələf oldu.
Təmizlər vəfada olarlar tamam,
Bədgövhər yaramaz, çiy olar müdam.
Kim vəfa yoluna mərdana gəldi,
Ordan comərdliyə qalxıb yüksəldi.

## COMƏRDLİK, KİŞİLİK VƏ İNSANLIQ HAQQINDA

Öyrən insanlarda kişilik nədir,
Comərdlik insanı şərəfli edir.
İnsanlıq insana şüar olmalı
Adamda kişilik vüqar olmalı.
Özgəyə baxmasın xəyanət ilə,
Baxmasın təmahla ya şəhvət ilə.
O, diksin başını yerə həyadan,
Qovsun həyasızı qapıdan haman.
Ondan eşitməsin artıq söz bir kəs,
Heç vaxt öyünməsin xəlq içrə əbəs.
Yatmışa keşikçi olsun gecələr,
Xalqa kömək etsin qüvvəsi qədər.
Dilinin əzbəri bu olsun gərək:
Dara düşənlərə kömək eyləmək!
Hər vaxt pay ayırmaq yetimə, aca,
Hər vaxt arxa olmaq dula, möhtaca.
Özgənin eybinə göz yummaq ancaq!
Başqa kəs sirrinə yol axtarmamaq!
Pislik yol tapmasın onun halına,
Pis şeylər gəlməsin heç xəyalına.
Təmizlik, toxluqdur dostu, sirdaşı,
Ancaq insanlıqdır onun yoldaşı.
Odur seçilmişi zamanın ancaq,

Onunla mümkündür amanda olmaq.
Dostuna çevirər ürək üzünü,
Nəfsindən qoruyar hər vaxt özünü.
Dönməz qılınc ilə vursan də əgər,
"Şəkər" cəvab verər, desən də zəhər.
O, eyib örtəndir, azad, həyalı,
Xeyirxah, sevəndir elmi, kamalı,
İş görər, işinə o, muzd istəməz,
Öyünməz, nə də ki, alçalmaz əbəs.
O, hər vaxt nəfsini sındırmaq üçün,
Əgər nə lazımsa eyləyər bütün.
Yüz əzab çəksə də, heç dönməz üzü,
Verər çörəyini dadmamış özü.
Budur, xoşbəxtliyə dünyadan nişan!
Budur, ürəklilik, igidlik haman.
Kimdə tapa bilsən bu sifəti sən,
Çalış ki, ondan üz döndərməyəsən.

## ELM ÖYRƏNMƏK VƏ ALİMLƏRİN ŞƏRƏFİ HAQQINDA

Əgər sən istəsən bir elm öyrənmək,
Bütün ləzzətlərdən əllərini çək.
Gecələr udmasan çıraq tüstüsü,
Hardan öyrənərsən sən elmi, düzü.
Elm, din dalınca lazımsa getmək,
Lap Çinə qədər də gedəsən gərək.
Elm oxu, dünyada kamaldan ötrü,
Oxuma dövlətdən, ya maldan ötrü.
Elmi kamillikçün öyrənməsən sən,
Yaxşı ad gətirməz o, sənə əslən.
Elmi öyrənirsə kim zərdən ötrü,
Biliyi xegirdən, zərərdən ötrü,
Bir kəndin biliksiz xatibi olar,
Əhli naəhldən seçməz, aşikar.
Elmini kimsədən gizləmə nahaq,
Susuz ürəklərə bulud kimi yağ.

Kamal sorağında olanlara sən,
Çalış ki, varından bir pay verəsən.
Alim ədalətə meyl etsə özü,
Baxmaz var-dövlətə heç zaman gözü.

## ELM ÖYRƏNMƏK HAQQINDA

Keçmiş elmlərdən qalan bir varaq
Qızıldır onunçün sanki bir tabaq.
Düzlüyü sevəndir, hiyləgər olmaz,
Hamısı dəryada, batmaz, boğulmaz.
Qanedir bir parça quru çörəyə,
Bənzər nəfəsləri müşklü nafəyə.
Süfrədə çörək yox, qazanda xörək,
Kişilik kisəsi doludur, gerçək.
Elm ağla yoldaşdır, sirdaşdır cana,
Hər yerdə hasardır sənin ruhuna.
Yuxlasan başında o, oyaq durar,
Ölsən varlığına odur yadigar.
Sən yemək istəsən olar dəyirman,
Yol göstərən olar yol getsən hər an,
Cövhəri sularda çürüyən deyil,
Odların içində əriyən deyil.
Yol getsən, qəlbinlə o, yoldaş olar.
Otursan ruhundan olar xəbərdar
Heç kəs torpaqlarda gizlədə bilməz,
Onu tufanlar da məhv edə bilməz.
Şah, sərhəng də kəsməz onun yolunu,
Oğru da bacarmaz aparsın onu.

## DÜZLÜK HAQQINDA

Düzlük et ki, düzlər nicat taparlar,
Hamıdan güclüdür düzlər, aşikar.
Yaxşı ad qazanar düz iş görənlər,
Bişməmiş, çiy olar əyri gedənlər.

Yusif düxlüyilə taxta çatdı düz,
Düzlük et, bəxt özü tutsun sənə üz.
Tutsa ətəyini pis, yox qorxusu,
Pis əl düz ətəyə neylər, doğrusu?
Düz danışan adam düz yuxu görər,
Yusif düz görmədi yuxunu məgər?!
Düzlük olduğuyçün onda, doğrusu,
Oyaqlıq açarı oldu yuxusu.
Cırıldı köynəyi yaxşılıq üçün,
Odur, mülkü oldu Misir büsbütün.
Belə bir məqama çatan bir köynək,
Gözlərə nur verər mö'cüzlə, gerçək.
Kimin ki, bu sayaq köynəyi olar.
Qurdun dərisini soyar parçalar.
Bir ətək əl çəksə hava-həvəsdən,
Bu sayaq tə'sirlər göstərər, hökmən.
Mə'ruz qalmayınca çətinliklərə
O, əziz olmadı heç də boş yerə.
Etmədi dostuna əsla xəyanət,
Odur, diləkləri oldu həqiqət.
Əgər düz olmasa sözünlə işin,
Boş bir köpükcükdür etdiyin sənin.
Kor, kar deyilsənsə qorxma quyudan,
Düz ol, əmir, şahdan qorxma heç zaman.
Möhkəm ol, igid ol, şücaətli ol,
Şəriət işində şir tinətli ol.
Ruhunda sədaqət olarsa möhkəm,
Zənnində tərəddüd etməzsən bir dəm.
Olmasa batinlə zahir düz əgər,
Sədaqət ətiri hardan törənər?!
Yara sədaqətin versə də kədər,
Sən səbirli olsan, o da düzələr.
Tanrı sadiqlərə ad verdi insan,
Xoşbəxt o kəsdir ki, sidqə verdi can.
Sədaqət güzgüdür əks edir səni,
Sənin kamalını, sənin nəfsini.
Dönmə sədaqətdən var olduqca sən,
Çıxma doğruların dairəsindən.

## HİKMƏT HAQQINDA

Düz görən fikirdən yaranar hikmət,
Dini gözləməkdən güc alar hikmət.
Haqqın sifətinə saldırar nəzər,
Qəlb haqqın zatını isbat eyləyər.
Sənin öz qəlbinə yatmayan sözü,
Yaxşı hesab etmir hikmətin özü.
Lap yunan elmini bilsə alçaqlar,
Ona həkim demə heç zaman, zinhar!
Həkimin əvvəlcə əməlinə bax,
Sonra dediyinə onun as qulaq.
Həkim danışmayıb sussa da əgər,
Ağıldır hər işi onun sərbəsər...
Kitabdan, qaydadan gen düşsə hikmət,
Onda nə nur olar, nə də kəramət.
Kimin ki, yükündə belə matah var,
Nitqi əməlinin dilində olar.
Onun baxışları hikmətdir bütün,
Sözü bir sevincdir xas, avam üçün.
Həkim söhbətindən tanınar özü,
Düz, ölçülü olar onun hər sözü.
Həvəsdən, xəyaldan söz açmaz bir dəm,
Arzu arxasınca o, basmaz qədəm.
Havavü-həvəsi ağla tapşırar,
Ağıl da alçaldar onu aşikar.
Hiylənin, riyanın yolunu bağlar,
O öz namusunu şərəflə saxlar.
O, hər nə bilirsə tullamaq olmaz.
O, hər nə deyirsə, qələm götür yaz!
Özünü aparar getmişlər kimi,
Ancaq sədaqətdir onun həmdəmi.
Xəyalla ünsiyyət bağlamaz bir an.
Gözü önündədir əcəl hər zaman.
Boş işə sərf etməz o, bircə dəmi,
Yəqin olmayanı yazmaz qələmi.
O, keçən günlərin çəkər qəmini,

Dirəmdən ötəri sıxmaz qəlbini.
Qocaya, cavana göstərər şəfqət.
Varlıya, yoxsula rəhm edər fəqət.
Kimsənin ürəyi inciməz ondan,
İncisə, tez ələ gətirər haman.
Yarımçıq bilikdən çox arı gələr,
Çalışar, hər şeyi mükəmməl bilər.
Çox yeyib-yatmağa eyləməz həvəs,
Qürrəylə kimsəyə o, baxmaz əbəs.
Hikmət sahibinin sirəti budur,
Həkim olanların sifəti budur!
Zənn edilən kimi olmasa əgər,
Kim hər yaramaza həkim söyləyər?!
Hikmət öyrənərək nur əldə elə,
Könlünü sən nura qovuşdur belə.

## BİR NEÇƏ VACİB HAQQI-SAYIN YERİNƏ YETİRİLMƏSİ HAQQINDA

Çoxmu baxacaqsan ona-buna sən?!
Barı bir ibrət al bu ölənlərdən.
Sənə bir öyüddür öldükcə dostlar,
Bu hicran ustaddır sənə aşikar.
Olsa ürəyində ölüm fikri, sən
Bu vardan-dövlətdən heç sevinməzsən.
Əgər vermisənsə fürsəti əldən,
Özünçün fatihə oxu onda sən.
Ölümü-itimi unutma belə,
Məzarı, əlhədi düşün, yad elə.
İstər bir fəqir ol, istər əmir ol,
Ölümdən qaçmağa yoxdur əsla yol.
Ağıla gəlmədin, atan verdi can,
Gözün açılmadı öləndə anan.
Gördün övlad dağı, dost hicranı çox,
Yenə gözlərində bir damcı yaş yox.
Bu dəmir ürəklə, can ki səndə var,

Onu ancaq odla düzəltmək olar.
Bir ölüm qurtarar səni bu qəmdən,
O, səni ayıldar, oyadar həmən.
Sən ona çalış ki, torpaq olasan,
Bəlkə bu suçlardan iraq olasan.
Sən ki, atan kimi gedə bilmirsən,
Atanın adıyla nə fəxr edirsən?!
Atan düzəltdisə bağ-bağça, gülşən,
Sən çalış, onları yeyə biləsən.
Tutaq üzürlüsən, bağ düzəltməsən,
Barı bu calalı viran etmə sən!
Əkmirsən, səpmirsən, öz kefinə bax!
Atanın adını korlama ancaq.
Sən ki, axşam sərxoş, səhər xumarsan,
Atanın evinə haçan baxarsan?!
Ondan qalan irsi neyləyirsən sən,
O, iki gecəlik xərcindir həmən.
Qalx onun yerinə bir iş gör bu gün,
Özü görməyibsə, sən gör onunçün.
Yemədi, qoymazdı yoxsa bu qədər,
Bir belə əkməzdi, yesəydi əgər.
O səninçün qoydu, xərcləmə belə,
Əsil övladsansa, ona da xərclə.
Məgər o, deyilmi səni böyüdən?!
Belə baxarıqlı, diribaş edən?!
Gəl yandır ruhuna onun bir çıraq!
Onun əməyini olmaz unutmaq.
Altı borc vacibdir hər bir insana,
Əvvəlcə borcludur o, yaradana.
Sonra da borcludur ata-anaya.
Şaha, müəllimə, həm ənbiyaya.
Əgər bu borcları ödəsən, inan,
Sən gedib Allaha yaxın olarsan.
Onların haqqını unutma bir an!
Xoşbəxtlər bu işi dərk edər haman.
Onları sevməklə başlar ucalar,
Əgər kin bəsləsə, insan alçalar.

# İMADƏDDİN NƏSİMİ

*Dahi Azərbaycan şairi və mütəfəkkiri İmadəddin Nəsimi 1369-cu ildə Şamaxı şəhərində anadan olmuş, 1417-ci ildə Suriyanın Hələb şəhərində işgəncəli şəkildə edam edilmişdir. Əsl adı Seyid Əlidir. Nəsimi əsası Fəzlullah Nəimi tərəfindən qoyulan Hürufilik təriqətinə mənsub idi və poeziyası vasitəsilə bu təriqəti yaymaq üçün Şərqin bir çox ölkələrini gəzmişdi. Nəsiminin türkcə divanı lirik və fəlsəfi qəzəllərdən, məsnəvilərdən, müstəzadlardan, müləmmə, rübai, tuyuq və qitələrdən ibarətdir. Əsasən əruz vəznində yazan Nəsiminin heca vəznində şeirləri də var. X əsrdə Bağdadda dara çəkilmiş Həllac Mənsur Hüseyninin şərəfinə ilk şeirlərini Hüseyni təxəllüsü ilə yazan Nəsimi əsərlərində vəhdəti-vücud* (*panteizm*) *fəlsəfəsini təbliğ edir,* "*Ənəlhəq*" – "*Mənəm Allah*" *düsturunu təkrar edirdi. Nəsiminin Azərbaycan, Türkiyə və Türkmən şerinə böyük təsiri olmuşdur. Fars və ərəb dillərində də qiymətli əsərlər yaratmışdır.*

## QƏZƏLLƏR

Mərhəba, xoş gəldin, ey ruhi-rəvanım, mərhəba!
Ey şəkərləb yari-şirin, laməkanım, mərhəba!

Çün ləbin cami-Cəm oldu nəfxeyi-Ruhülqüdüs,
Ey cəmilim, ey cəmalim, bəhrü kanım, mərhəba!

Könlümə heç səndən özgə nəsnə layiq görmədim,
Surətim, əqlim, üqulim, cismü canım, mərhəba!

Ey mələk surətli dilbər, can fədadır yoluna,
Çün dedin ləhmikə ləhmi, qanə qanım, mərhəba!

Gəldi yarım naz ilə, sordu, Nəsimi, necəsən?
Mərhəba, xoş gəldin, ey xırdadəhanım, mərhəba!

* * *

Başını top eyləgil, gir vəhdətin meydanına,
Ey könül, müştaq isən gər zülfünün çövkanına.

Aşiqin qanilə oynar dilbərin simin əli,
Ey yalançı aşiq, əbsəm, girmə canın qanına.

Çəkməyən eşqin bəlasın, görməyən hicrin qəmin,
Dərdi dərmansızdır anın, çarə yox dərmanına.

Canını qurban edəndir yar içün gerçək şəhid,
Səd həzaran rəhmət olsun ol şəhidin canına.

Zülfünün sirrin nə bilsin zahid, anı sor mana,
Gər əsir olmaq dilərsən zülfi-canəfşanına.

Gəl niqabın tərfini gülgün yanağından götür,
Ta gülüstan gülməsin ayruq güli-xəndanına.

Xubların bağında çoxdur fitnəli nərgis, vəli
Fitnəlik xətm oldu anın nərgisi-fəttanına.

Lə'lü mərcandır dodağın, lö'löi-dürdür dişin,
Afərin şol bəhri-kanın lö'löi-mərcanına.

Kirpiyin navək oxudur, qaşların çaçi kəman,
Uğramaz aşiqdən özgə şol oxun peykanına.

Ey Nəsimi, gər sözün mə'nisi bipayan deyil,
Neçin irməz kimsənin fikri onun payanına.

* * *

Dünya duracaq yer deyil, ey can, səfər eylə!
Aldanma anın alına, andan həzər eylə!

Bir halə qərar eyləməz əyyam, keçər ömr,
Ey əhli-nəzər, baxma bu halə, nəzər eylə!

Payəndə degil dövləti, ey xacə, cahanın,
Əsbabinə aldanma, gəl andan güzər eylə!

Gər aşiq isən sidq ilə şol dilbər üçün, gəl
Can ilə cahan ortaya qoy, tərki-sər eylə!

Düşdü saçının zülmətinə könlüm, ilahi,
Şol hali pərişanə bu şami səhər eylə!

Çün hüsnünə xətm oldu bu gün dövri-məlahət,
Ey fitnələrin xatəmi, şəqqül-qəmər eylə!

Gər Musiyi-İmran kimi şol narə sataşdı,
Gəl, tabişini göstərü şərhi-şəcər eylə!

Dünya evinin səltənəti beş gün imiş çün,
Bünyadını yıx, ər kimi, zirü zəbər eylə!

Şol püstədəhanın xəbərin bildi Nəsimi,
Şirinlərə şol tüngi-şəkərdən xəbər eylə!

* * *

Düşdü yenə dəli könül gözlərinin xəyalinə,
Kim nə bilir bu könlümün fikri nədir, xəyali nə?

Al ilə ala gözlərin aldadı aldı könlümü,
Alını gör nə al edər, kimsə irişməz alinə.

Qiymətini dodağının dəgmə xəsisə sorma kim,
Mən bilirəm ki, can ilə susamışam zülalinə.

Gözlərinə əsir olan halımı, oldur anlayan,
Kim ki, bu halə düşmədi qoy vara kəndü halinə.

Sirrini şol qara bənin çünki yanağı şərh edər,
Can, nə ola nisar edəm yanağınavü xalinə?

Dadlı sözündən utanır abi-həyat, məhv olur,
Gülbəşəkər nə nəsnədir kim, irişə məqalinə?

Hüsnü cəmalü surətin məclisi bərkəmaldır,
Şərhü bəyanü vəsfinə əql irəməz kəmalinə.

Üzünü, qaşını görən qarşubəqarşu, gözbəgöz,
Sanma ki, baxa ol gögün bədrinə ya hilalinə.

Aşiqi-sadiqin qanı yarə həlal imiş, vəli,
Girsə əgər rəva degil dilbər anın vəbalinə.

Ay ilə gün sücud edər surətini göricəgiz,
Bu nə cəmalü hüsn olur, səlli-əla cəmalinə.

Buldu Nəsimi çün səni, keçdi qamudan, ey sənəm,
Qoydu həririü ətləsi, girdi əbavü şalinə.

* * *

Düşdü könül ala gözün ağınavü qərasinə,
Ayrıq anınla kimsənin ağı nədir, qərasi nə?

Gəldi fəğanə can yenə ney kimi, suzü dərd ilə,
Kim nə bilir bu xəstənin dərdi nədir, dəvasi nə?

Türrəsinin cəfalərin sorsa bu mübtəlayə kim,
Eyləmişəm fəda anın canımı hər bəlasinə.

Çünki cəfasız, ey könül, kimsə murada irmədi,
Cövrə təhəmmül eylə, dur şol sənəmin cəfasinə.

Nurü səfa içindəyəm qərğə, vəli, bu haləti
Ol nə bilir ki, düşmədi mehri-rüxün həvasinə.

Yekcəhət olğıl, ey könül, canü cəhanə ur qəfa,
Yüzünü doğru dut həqə, ur qamunun qəfasinə.

Hüsnü cəmalə baxmağa ari səfa nəzər gərək,
Düşməsin arisiz nəzər ayinənin səfasinə.

Dilbər əlində aşiqin qətli nədən həram ola,
Aşiqə çün həlal edər vəslini qan bəhasinə?

Çün bu yalançı dünyanın aqibəti fəna imiş,
Keç qamudan Nəsimitək, baxma anın bəqasinə.

* * *

Dilbəra, dil səndən özgə bir dəxi yar istəməz,
Çün müyəssər oldu vəslin, qeyri didar istəməz.

Könlümə eşqini qismət çün əzəldən qıldı həq,
Ta əbəd eşqindən özgə nəsnə, zinhar, istəməz.

Könlümün Mənsuri çünkim, zülfünü edindi dar,
Yə'ni ki, Mənsur olan zülfündə bərdar istəməz.

Mən kəsildim masivallahdan bu gün, ey müddəi,
Vahid oldum yar ilən, aşiq olan var istəməz.

Bu dili-biçarədən sordum nədir dərdinə əm,
Dilbərin lə'lindən ayrı hiç timar istəməz.

Bu könül şəhrini çünki, hicr viran eylədi,
Gəl ki, səndən özgə bir mə'murü me'mar istəməz.

Çün ləbin abi-həyatidir həyati-ömrümün,
Bu Nəsimi səndən ayrı leysə-fiddar istəməz.

* * *

Mana sənsiz cahanü can gərəkməz,
Vüsalın var ikən hicran gərəkməz.

Ləbi-lə'lin zülal abindən ayru
Şərabi-çeşmeyi-heyvan gərəkməz.

Qəmindir könlümün təxtində sultan,
Bir iqlimə iki sultan gərəkməz.

Yetər dərdin dəva müştaqə, niçün
Ki, dərdin bilənə dərman gərəkməz.

Gülüstanın gülü sənsiz tikandır,
Mana sənsiz gülü reyhan gərəkməz.

Gəl, ey aşiqlərin rizvanı – hüsnün
Ki, sənsiz aşiqə rizvan gərəkməz.

İki aləmdə didarından özgə,
Mana, ey surəti-rəhman, gərəkməz.

Vüsalın şərbətin içən mühibbə
Fərağın ağusu çəndan gərəkməz.

Mana səbr eyləmək sənsiz, nigara,
Əgər müşkil, əgər asan – gərəkməz.

Əzəldə qılmışam eşqinlə peyman,
Bütün peyman, sınıq peyman gərəkməz.

Kəsilməz gərçi vəslindən Nəsimi,
Gözündən olduğun pünhan gərəkməz.

* * *

Kə'bə üzündür, ey sənəm, üzünədir sücudumuz,
Ta ki, görə bu səcdəyi narə yana həsudumuz.

Şəm'i-rüxün hərarəti yandırır, ey qəmər, bizi,
Uşbu cəhətdən oldu kim, göylərə çıxdı dudumuz.

Canımızı buraxmışız atəşi-eşqə ud kimi,
Ta ki, səfavü zövq ilə eşqinə yana udumuz.

Zülfü qaşınla kirpigin müshəfimizdir, oxuruz,
Ey dilimizdə cümlə sən, göftümüzü şənudumuz.

Zülfü rüxün hesabinə düşmüşüz üştə sayıruz,
Kim nə bilir bu üqdəyi kim, necədir üqudumuz.

Möhbətimiz sifati çün zati-qədimi-fərd imiş,
Vahidi-bizəvalədir mərcə ilə süudumuz.

Qaziyə nəsnə verməriz rüşvət içün bu də’vidə,
Qaziyi-həq qatında çün adil imiş şühudumuz.

Kafilə nun əzəldə çün illətimizdir, ey bəşər,
Gövhəri-laməkan biziz, kim bilisər hüdudumuz.

Surəti-xəttü xalinə sacidü abid olmayan,
Millətimizdə oldurur müşrikimiz, yəhudumuz.

Maü məindən, ey fəqih, əsrəyübən iki demə,
Çünki yeganədəndürür varid ilə vürudumuz.

Düşmən üçün Nəsimiya, olma məlul, qəm yemə,
Oldu əzəl günündə çün Fəzli-əbəd vüdudumuz.

* * *

Mərhəba, xoş gəldin, ey dildar, xoş gördük səni,
Xoşmusan, ey bərgüzidə yar, xoş gördük səni.

Doğrusu, müştaq idik, cana, bəsi didarına,
Ey gözü nərgis, üzü gülnar, xoş gördük səni.

Gəlməyə çün afitabü getməyə çün mahitab,
Haliya, ey kövkəbi-səyyar, xoş gördük səni.

Müddəilər tə’n urarlar irqətindən halıma,
Bir dəxi bər kuriyi-əğyar, xoş gördük səni.

Dərdimənd olmuş idi miskin Nəsimi sənsizin,
Ey vüsalın dərdimə timar, xoş gördük səni.

* * *

Ayrılıqdan yar mənim bağrımı büryan eylədi,
Özünü bir yana saldı, məni bir yan eylədi.

Zə'fərana bənzimi göndərdi ol birəhm yar,
Düşməni xəndan edib, dostunu giryan eylədi.

Aldı könlüm, qılmadı ol bivəfa bir gəz vəfa,
Yıxdı mə'mur şəhrini, gör necə viran eylədi.

Canımın zəxmindən, ey can, xab gəlməz eynimə,
Cigərimdə zəxmi-peykan, tiri-müjgan eylədi.

Eşidərsə daş ərir həsrətdə ahü zarımı,
Ol güləndam yarı gör, könlümü zindan eylədi.

Cəhd qıldım çox, vüsalə yetmədim, çəkdim fəraq,
Tədbir ana neyləsin, təqdiri-yəzdan eylədi.

Ey Nəsimi, sübhdəm var, ərz qıl dildarə sən,
Qəmzəyə versin nəsihət, yoxsa çox qan eylədi.

* * *

Apardı könlümü məndən bu gün ol cənnətin huri,
Götür pərdə camalından ki, sənsən eynimin nuri.

Bu gün yövmilhesab oldu üzün dövründə, ey məhru,
Məgər qopdu qiyamətlər, görə bilmən bu məzmuri.

Minacat eylərəm dünü gün sənin dövlətli kuyində,
Üzün nuri-təcəllidir, dəxi mən neylərəm Turi.

Saçın həblül-mətinindən, nə qəmdir boynuma taxsan,
Vəli me'raci-zülfündə asıldı, gör bu Mənsuri.

Fəraqü mövnəti-hicrin yıxıbdır könlümün şəhrin,
Nola bir gəz vüsalınla yapasan Beyti-mə’muri.

Şəha, lə’lin şərabından Nəsimi şoylə sərxoşdur,
Olubdur valehü heyran, diləməz abi-ənguri.

* * *

Sənəma, üzün gülündən gülə-gülə gül utandı,
Xəcil eylədi dodağın şəkəri, nabatı, qəndi.

Qara qaşların yayından mana kirpik oxun atar,
Ala gözlərin məgər kim, yenə qanıma susandı.

Sitəm etmək ilə haşa ki, könül usana səndən,
Kimə aydayım ki, anın sitəmində can usandı.

Gözünü düzüb süzərsən, dilü cana qəsd edərsən,
Bu nədir ki, sən qılırsan, çələbim, bəgim, əfəndi?

Nə bahaya qiymət etsəm səni, ey şikari-dövlət
Ki, cahan mətahi dəyməz qılına saçın kəməndi.

Dünü gün iki gözümdən axıdır ənar danə,
Cigərim qanilə gör kim, bu yüzüm nə xoş boyandı.

Qara sünbülün niqabı ki, hicabı düşmüş aya,
Götür, ey sənəm, üzündən ki, Nəsimi oda yandı.

* * *

Üzünü məndən nihan etmək dilərsən, etməgil!
Gözlərim yaşın rəvan etmək dilərsən, etməgil!

Bərgi-nəsrin üzrə mişkin zülfünü sən dağıdıb,
Aşiqi bixaniman etmək dilərsən, etməgil!

Qaşların qövsündə müjganın xədəngin gizləyib,
Ey gözü məstanə, qan etmək dilərsən, etməgil!

Canımı vəslin şərabından ayırdın, ey gözüm,
Eynimi gövhərfəşan etmək dilərsən, etməgil!

Qoymuşam eşqində mən kövnü məkanın varını,
Can nədir kim, qəsdi-can etmək dilərsən, etməgil!

Bürqəi üzündən açarsan məgər naməhrəmə,
Gizli əsrarı əyan etmək dilərsən, etməgil!

Yandırırsan könlümü eşqində, mə'lum oldu kim,
Anı risvayi-cahan etmək dilərsən, etməgil!

Doğruyam eşqində oxtək, kirpigin tanıqdurur,
Qəddimi neyçün kaman etmək dilərsən, etməgil!

Çünki eşqin məskənidir könlümün viranəsi,
Həsrətə anı məkan etmək dilərsən, etməgil!

Çün yəqin bildi Nəsimi ağzının var olduğun,
Ol yəqini sən güman etmək dilərsən, etməgil!

* * *

Allahü əkbər, ey sənəm, hüsnündə heyran olmuşam,
Qövsi-qüzehdir qaşların, yayına qurban olmuşam.

Üzündür ol cənnət gülü, boyun həqiqət sərvidir,
Eşqində mən bülbül kimi aləmdə dəstan olmuşam.

Kövnü məkandan keçmişəm, mə'ni şərabın içmişəm,
Canana, üzün görmüşəm, başdan ayaq can olmuşam.

Də'vi mənəm, qazi mənəm, münkir mənəm, razi mənəm,
Dağı mənəm, yazı mənəm, mən külli-dövran olmuşam.

Sufi mənəm, safi mənəm, kafi mənəm, şafi mənəm,
Ərni mənəm, heyran mənəm, dərd ilə dərman olmuşam.

Zahid mənəm, abid mənəm, asi mənəm, fasiq mənəm,
Mö'min mənəm, kafir mənəm, mən külli-insan olmuşam.

Uçmaq ilə rizvan mənəm, damu ilə niran mənəm,
Dana ilə nadan mənəm, həm inü həm an olmuşam.

Gəh çıxmışam İsa kimi, çərx üstünə oturmuşam,
Gəh varmışam Yusif kimi, Misirdə sultan olmuşam.

Sərrafi-bəhri-qüdrətəm, yaquti-kani-vəhdətəm,
Şimdi Nəsimiyəm, bu gün xak ilə yeksan olmuşam.

* * *

Dilbəra, mən səndən ayru ömrü canı neylərəm?
Tacü təxtü mülkü malü xanimanı neylərəm?

İstərəm vəsli-camalın ta qılam dərdə dəva,
Mən sənin bimarınam, özgə dəvanı neylərəm?

Ey müsəlmanlar, bilin kim, yar ilə xoşdur cahan,
Çünki yardan ayru düşdüm, bu cahanı neylərəm?

Çox dualar qılmışam mən xaliqin dərgahına,
Çün muradım hasil olmaz, mən duanı neylərəm?

Dilbər aydır, ey Nəsimi, sabir ol, qılma fəğan,
Mən bu gün səbr eyləsəm, danla fəğanı neylərəm?

* * *

Sən mana, dilbər, yetərsən, özgələr yar olmasın,
Bir olur yar iki olmaz, iki zinhar olmasın.

Bağrımı doğrar fəraqın xarı, ey cənnət gülü,
Növbahar olsun, gül olsun, arada xar olmasın.

Doğrudur yarın yolu, doğru qayırma yarədən,
Kim ki, doğru yol verər, anın yeri dar olmasın.

Ey səkiz cənnati-ədnin bağü bostanı üzün,
Güldən anın gülşəni bibərgü bibar olmasın!

Kim ki, didarından özgə nəsnə istər, ya dilər,
Yetməsin həqdən nəsibi, əhli-didar olmasın!

Firqətin dərdi məni bixabü giryan eylədi,
Düşmənin ömrü tükənsin, bəxti bidar olmasın!

Tutmuşam eşqinlə peyman, qılmışam hüsnünlə əhd,
Andan özgə əhdü peyman, qövlü iqrar olmasın.

Zülfünün dərdində, şaha, asılan Mənsur idi,
Hər ki, Mənsur olmadı, zülfündə bər-dar olmasın.

İmdi ki, eynindən ayru kimsə xoş bimar ikən,
Yarəb, ol nərgisdən özgə kimsə bimar olmasın.

Ey Nəsimi, qılma yarın sirrini əğyara faş
Ta ki, yar olsun bu sirrə məhrəm, əğyar olmasın.

* * *

Dünya çün mürdardır, igrən könül, mürdardan!
Gül degil dünya, tikandir, nə umarsan xardan?

Dünyada bir yar vəfalı kimsənə görmüş degil,
Fariğ ol barı, nə hasil şol vəfasız yardan?

Axirət darından istə hər nə məqsudun ki, var,
Dünyanın miqdarı yoxdur, keç bu bimiqdardan!

Müddəi cövrü cəfasın həddən aşırdı, vəli
Yar əgər yari qılarsa, qəm degil, əğyardan.

Çün Nəsimi zahidin halını bildi kim, nədir,
Meydən ikrah eyləməz, qafil degil xummardan.

* * *

Surətin nəqşində könlüm, ey sənəm, heyran olur,
Bir nəzər görsəm, camalın dərdimə dərman olur.

Kənzi-məxfidir sənin eşqin, yeri viran könül,
Şol cəhətdəndir, şəha, gəncin yeri viran olur.

Leylətül-qədr üştə zülfün, həq kitabıdır üzün,
Qibləsi aşiqlərin bil, surəti-rəhman olur.

Cövrünü hər kimsə çəkdi, lütf anındır bigüman,
Dilbərin cövrü cəfası aşiqə ehsan olur.

Mah-rüxsarın qatında kim ki, səcdə qılmadı,
Divi-məl'undur yəqin, anın adı şeytan olur.

Nəfsini hər kimsə bildi, həqqi bildi bigüman,
Zərxəridə qul isə, aləmlərə sultan olur.

Yar ilə bir ol, Nəsimitək, cahanda fariğ ol,
Kim ki, aldanmaz cahanda, müşkülü asan olur.

* * *

Məndən üzün yaşırma kim, səcdəgahım oldur,
Seyr edərəm bu çərxi, xurşidü mahım oldur.

Hüsnün çırağın, ey can, pərvanə kimi keçdim,
Tarik içində rövşən göründü, rahım oldur.

Pərhiz edərmi aşiq, ey eşqə münkir olan,
Dersəm ki, tərkini ur, mənim çü şahım oldur.

Kirpiklərinlə qaşın olmuşdur ismi-ə'zəm,
Divdən dəxi nə qorxu, çünkim, pənahım oldur.

Həq də'vidən şəhadət istərlər isə məndən,
Mən onu bulmuşam kim, yenə güvahım oldur.

Ey dünyanın rəisi, mənə həqir baxma,
Mən necə müflis olum, çün izzü cahım oldur.

Sən məndən olma qafil, istə ki, ta biləsən,
Anı ki, tanımışsan, fəzli-ilahım oldur.

Nəsimiyəm ki, düşdüm üzün gülündən ayrı,
Bülbül kimi çəməndə fəryadü ahım oldur.

* * *

Ey müsəlmanlar, mədəd, ol yar pünhan ayrılır,
Ağlamayım neyləyim, çün gövdədən can ayrılır.

Ey sənəm, hicran əlində naleyi-zar eylərəm,
Gözlərimdən sanasan dəryayi-ümman ayrılır.

Ol səbəbdəndir ki, mən bimarü rəncur olmuşam,
Xəstə könlüm mərhəmi, şol dərdə dərman ayrılır.

Rəngi-çöhrəm zərd olubdur, qamətim həm çün hilal,
Ol günəş üzlü həbibim, lə'li-xəndan ayrılır.

Taqətim, səbrim tükəndi, yarsız mən neylərəm?
Əqlimi şeyda qılan ol çeşmi fəttan ayrılır.

Məhşəri-yövmül-hesab, qopdu qiyamət başıma,
Ey Yusuf surətli, məndən piri-Kən'an ayrılır.

Ey cigərsuz nari-firqətdən Nəsimi çarə nə?
Hər kimə nəhnü qəsəmna çün əzəldən ayrılır.

* * *

Dodağın qəndinə şəkər dedilər,
Cani-şirinə gör nələr dedilər?

Dedilər kim, dəhanı yoxdur anın,
Bixəbərlər əcəb xəbər dedilər.

Can demişlər dodağına, hey-hey,
Bu sözü gör nə müxtəsər dedilər.

Şama bənzətdilər qara saçını,
Arizin nuruna səhər dedilər.

Əhli-mə’ni xücəstə surətinə
Mə’niyi-vahidüssüvər dedilər.

Ənbərəfşan saçınla arizinə
Yasəmin üzrə müşki-tər dedilər.

Şəbi-yeldadurur saçın gecəsi,
Surətin bədrinə qəmər dedilər.

Kirpigin oxuna, qaşın yayına
Aşiqin sinəsin sipər dedilər.

Bax anın üzünə, Allahını gör,
Əhli-mə’ni budur nəzər dedilər.

Həqdən olmuş irağ anlar kim,
Səni, ey nuri-həq, bəşər dedilər.

Ey Nəsimi, mühiti-ə’zəmsən,
Gərçi əlfazına göhər dedilər.

* * *

Məndə sığar iki cahan, mən bu cahana sığmazam,
Gövhəri-laməkan mənəm, kövnü məkana sığmazam.

Ərşlə fərşü kafü nun məndə bulundu cümlə çün,
Kəs sözünüvü əbsəm ol, şərhi-bəyana sığmazam.

Kövni-məkandır ayətim, zatidürür bidayətim,
Sən bu nişanla bil məni, bil ki, nişana sığmazam.

Kimsə gümanü zənn ilə olmadı həqq ilə biliş,
Həqqi bilən bilir ki, mən zənnü gümana sığmazam.

Surətə baxü mə’nini surət içində tanı kim,
Cism ilə can mənəm, vəli cism ilə cana sığmazam.

Həm sədəfəm, həm inciyəm, həşrü sirat əsinciyəm,
Bunca qumaşü rəxt ilə mən bu dükana sığmazam.

Gənci-nihan mənəm mən uş, eyni-əyan mənəm, mən uş,
Gövhəri-kan mənəm, mən uş, bəhrəvü kana sığmazam.

Gərçi mühiti-ə’zəməm, adəm adımdır, adəməm,
Tur ilə künfəkan mənəm, mən bu məkana sığmazam.

Can ilə həm cahan mənəm, dəhrilə həm zaman mənəm,
Gör bu lətifəyi ki, mən dəhrü zamanə sığmazam.

Zərrə mənəm, günəş mənəm, çar ilə pəncü şeş mənəm,
Surəti gör bəyan ilə, çünki bəyana sığmazam.

Zat iləyəm, sifat ilə, gülşəkərəm nabat ilə,
Qədr iləyəm bərat ilə, bəstə dəhana sığmazam.

Nara yanan şəcər mənəm, çərxə çıxan həcər mənəm,
Gör bu odun zəbanəsin, mən bu zəbana sığmazam.

Şəhd ilə həm şəkər mənəm, şəms mənəm, qəmər mənəm,
Ruhi-rəvan bağışlaram, ruhi-rəvana sığmazam.

Tir mənəm, kaman mənəm, pir mənəm, cavan mənəm,
Dövləti-cavidan mənəm, ayinədana sığmazam.

Gərçi bu gün Nəsimiyəm, haşimiyəm, qureyşiyəm,
Məndən uludur ayətim, ayətə, şana sığmazam.

* * *

Dinləgil bu sözü ki, candır söz,
Aliyü asimanməkandır söz.

Şeş cəhətdən münəzzəh anlavü bax,
Şöylə kim, xaliqi-cahandır söz.

Nazilü münzil anla kim, birdir,
Kəndi kənduyə tərcümandır söz.

Tulü ərz ilə ümqü bulunmaz
Yə’ni bihəddü binişandır söz.

Bu hədisə nəzər qıl, ey aqil,
Anlayasan ki, bigümandır söz.

Ərşi-rəhman dedi nəbi könülə,
Çünki gördü, könüldə kandır söz.

Dedi ya kafüha, əyzə-bikə,
Çün Əli bildi, müstəandır söz.

Qeyri-məxluqdur, nə demək olur,
Anla kim, imdi rayigandır söz.

Əqli-küll ərşü kürsü, lövhü qələm,
Çar ünsür, nöh asimandır söz.

Zahirü batin, əvvəlü axir,
Aşikaravü həm nihandır söz.

Ey üqulu nəsəb edən isbat,
Qamuya söz de kim, hamandır söz.

Kafü nundan vücuda gəldi cahan,
Əgər anlar isən, əyandır söz.

İsiyi-pak, Adəmü Əhməd,
Mehdiyi-sahibəz-zəmandır söz.

Bu bəyanı dilərsən anlayasan
Kim, necəsi filan-filandır söz.

“Cavidannamə”yi gətirgil ələ,
Ta biləsən ki, nəsnə candır söz.

Sözə bu izzü cah yetməzmi,
K’aydalar Fəzli-qeybdandır söz.

Aqil isən sözünü müxtəsər et,
Ey Nəsimi, çü bigirandır söz.

* * *

Daldım yenə bir bəhrə ki, ümman dəxi bilməz,
Küfrün sözünü dünyada iman dəxi bilməz.

Buldum vücudun sübhi-əzəl vəhy ilə münzil,
Vəchin sözünü dünyada bürhan dəxi bilməz.

İblis əzəli lə’nət olub lə’nətə qaldı,
Lə’nət sözünü dünyada şeytan dəxi bilməz.

Musa əzəli qıldı vücudimi əsa çün,
Musa sözünü dünyada İmran dəxi bilməz.

Muşkil oluban çün bu sözü bilmədi kimsə,
Müşkil sözünü dünyada asan dəxi bilməz.

İnsan oluban camə geyib dünyaya gəldim,
İnsan sözünü dünyada ehsan dəxi bilməz.

Lö’löi-əzəl şöylə könül dopdolu oldu,
Lö’lə sözünü dünyada mərcan dəxi bilməz.

Düxan əzəli kim, sözünü vermədi yarə,
Düxan sözünü dünyada düxan dəxi bilməz.

Gənci-əzəli şöylə könül daşdı töküldü
Gəncüm sözünü dünyada viran dəxi bilməz.

Ey badi-səba, var, xəbəri yarə ilət kim,
Hüdhüd dilidir bunu Süleyman dəxi bilməz.

Zülfünə başın top edibən qoydu Nəsimi,
Zülfün sözünü dünyada çövkan dəxi bilməz.

* * *

Ey əzəli can ilə cananımız!
Eşqi-rüxündür əbədi şanımız.

Kə’bə üzündə bizə, ey Fəzli-həq,
Zülfü rüxün qibləvü imanımız.

Vəchinə yazdı otuz iki hüruf,
Hikmət ilə münşiyi-ərkanımız.

Surəti çün əhsəni-təqvim imiş,
Səndə zühur eylədi sübhanımız.

“Səvvərəkəllahü əla şəklihi”
Üştə nəbinin sözü bürhanımız.

Mö’minə həq dünyanı zindan dedi,
Möminə çox qalmaya zindanımız.

Uymadı arif sözünə vaizin,
Divə müti’ olmadı insanımız.

Əvvəlü axırda üzündür, üzün,
Sün’i-xuda, qüdrəti-yəzdanımız.

Kim ki, sücud eyləmədi hüsnünə,
Divi-lə’in olduvü şeytanımız.

Can necə tərk eyləsin, ey can, səni,
Çünki canın canısan, ey canımız!

Pərdə üzündən götür, ey surətin
Fəzli-ilahi ilə rəhmanımız.

Eynimə sənsiz tikan oldu cahan,
Qandasan, ey tazə gülüstanımız?

Ta biləsən kim, necədir, ey fəqih,
Adəmi-xaki ilə ehsanımız.

Hüdhüdü Bilqeysə rəsul eylədi,
Naməni göndərdi Süleymanımız.

Cövr ilə yandırdı Nəsimiyi dust,
Həm bu idi dust ilə peymanımız.

* * *

Var bu cahandan özgə bizim bir cahanımız,
Surət bu aləm oldu bizə, ol məkanımız.

Zatına həyyü baqi demişlər bu cövhərin,
Şol kim, bizim-cahanımız olmuş bu canımız.

Ey də'vət eyləyən bizi firdövsə, eylə bil,
Cənnətdən özgə vardurur ə'la məkanımız.

Cövhər ki, dutdu aləmi rövşən günəş kimi,
Andandır aşikara bu gənci-nihanımız.

Cövhərləri zühura gətirdi çü nitqi-həq,
Gör kim, nə feyzə gəldi yenə bəhrü kanımız.

Ol kim, bizim həqiqətimizdir xəyalımız,
Yoxdur nişanı qılca, nə bilsin nişanımız.

Sən bu Nəsiminin dilini anla, bil sözün
Kim, var bu dildən özgə bizim bir lisanımız.

* * *

Sirri-ənəlhəq söylərəm aləmdə, pünhan gəlmişəm,
Həm həq derəm, həq məndədir, həm xətmi-insan gəlmişəm.

Həm Lövhü Tovratü Zəbur, İncilü Qur'anü Sühəf,
Həm mən kəlami-natiqəm, həm cəm'i-Qur'an gəlmişəm.

Həm ayəti-rəhman mənəm, həm rəhməti-rəhman mənəm,
Həm vəhyi-mütləq söylərəm, həm nuri-yəzdən gəlmişəm.

Musa kimi didarına müştaqsan, gəl üştə gör,
Anəstünaram, həm şəcər, Musi-bin-İmran gəlmişəm.

Sevdan ilə məst olmuşam, həm içmişəm qəmdən müdam,
Məsti-ələstin camıyam niçün ki, tüğyan gəlmişəm.

Həm mən qələndərsurətəm, fərdəm, mücərrəd təcridəm,
Oldum fəqirü həm gəda, həm mülkə sultan gəlmişəm.

La-reybə-illa vəchəhu gəldi anın vəchində uş,
Aləmdə hüsnün vəchinə mən vəchi-bürhan gəlmişəm.

Hüsnü camalın nəqşini gördü əzəldə gözlərim,
Bu hüsnə heyran olmuşam, mən nəqşə heyran gəlmişəm.

Mişkin saçın zülmatına yol bulmaq istər, Xızrı gör,
Lə'lin şərabın içmişəm, mən abi-heyvan gəlmişəm.

Gəlmiş cahana şərh edər şimdi Nəsimi həq sözün,
Ani kim idrak eyləsin, mən sirri-pünhan gəlmişəm?!

* * *

Mən xərabati-əzəldən məstü heyran gəlmişəm,
Eşq ilə yekrəng olub şadanü xəndan gəlmişəm.

Saqiyi-inni-ənəllah cür'əsindən ta əbəd
Məstü məstan, xəlvətindən məstü məstan gəlmişəm.

Həqdürür qövli-ənəlhəq də'visi həqqa ki, mən
Şahi-sultan məclisindən şahi-sultan gəlmişəm.

Yaxmışam, yandırmışam, kül qılmışam zərratımı,
Lacərəm külli kül olub məhrəmi-can gəlmişəm.

Mövc ilə, eşq ilə canım dürlü-dürlü dür saçar,
Bu giransız eşq ilə dəryayi-ümman gəlmişəm.

Tahiri qüdsi deyən ruhül-əmindir məntiqim,
On səkiz min aləmin sirrinə pünhan gəlmişəm.

Məqsədi-kövnü məkan sənsən, Nəsimi, çün bu gün
Nə əcəb gər derisəm mən sirri-sübhan gəlmişəm.

* * *

Mən mülki-cahan, cahan mənəm mən!
Mən həqqə məkan, məkan mənəm mən!

Mən ərş ilə fərşü kafü nunam,
Mən şərhü bəyan, bəyan mənəm mən!

Mən kövnü məkanü kün-fəkanam,
Bilgil ki, nişan, nişan mənəm mən!

Mən surəti-mə’nidə həqəm həq,
Mən həqqi-əyan, əyan mənəm mən!

Bir gövhərəmü qədim əzəldən,
Ey gövhəri-kan, kan mənəm mən!

Mən atəşi-nuri-eşqi-həqqəm,
Musaya zəban, zəban mənəm mən!

Mən cümlə cahanü kainatam,
Mən dəhrü zaman, zaman mənəm mən!

Mən ayəti-müshəfü kitabam,
Ey nöqtədəhan, dəhan mənəm mən!

Mən qövs ilə həm kamanü tirəm,
Ey tirü kaman, kaman mənəm mən!

Cəmşidi-zamani-aləm oldum,
Cəmşidi-zaman, zaman mənəm mən!

Mən nəqşü xəyalü xəttü xalam,
Mən hərfü lisan, lisan mənəm mən!

Mən gənci-nihani, küntə kənzəm,
Mən gənci-nihan, nihan mənəm mən!

Mən zatü sifati-kün-fəkanam,
Mən ruh ilə can, can mənəm mən!

Mən kafirə mövt, müsibət oldum,
Mö'minə iman, iman mənəm mən!

Mən cənnətü abi-kövsər oldum,
Ey səhni-cinan, cinan mənəm mən!

Mən bəhri-mühitü həm giranam,
Ey bəhri-giran, giran mənəm mən!

Mən sirrəmü tövhidəm, hədisəm,
Həm qeybü güman, güman mənəm mən!

İnsanü bəşərsən, ey Nəsimi,
Həq der ki, haman, haman mənəm mən!

* * *

Surətin nəqşində hər kim görmədi nəqqaşını,
Vahibi-surət anın gözsüz yaratmış başını.

Qabü-qövseynin rümuzun sanma kim, fəhm eyləyə
Kim ki, zahir görmədi şol mahi-bədrin qaşını.

Ləbləri şirin nigarın firqətü hicranıdır,
Axıdar yanınca şəm'in gözlərindən yaşını.

Düşmədi batil xəyala, olmadı sevdası xam,
Hər kimin kim, eşq oduyla həq bişirdi aşını.

Gərçi fərraşi-məlikdir ənbərəfşan sünbülün,
Çünki mən sultanı buldum, neylərəm fərraşını?

Həqqə vasil rindü həqdən ayrıdır zahid, görün
Xanəqahın şeyxini, meyxanənin övbaşını.

Dəmbədəm sufi məlamət daşın atar aşiqə,
Daşı qiymətsizdir anın, içini gör, daşını.

Hasilin məscid bucağında gör axır kim, nədir,
Ey məlamət eyləyən meyxanənin qəllaşını.

Yaşını yandırdı eşqin, həm qurusun könlümün,
Kim ki, eşqə düşdü, yandırdı quruvü yaşını.

Könlümün şəhrində eşqin bir imarət yapdı kim,
Ta əbəd qoparmaz andan nöh fələk bir daşını.

Canımı eşqin əzəldə yoldaş etmiş özünə,
Qoymaya yoldaşlığın həqqin bilən yoldaşını.

Ey Nəsimi, halını gər kimsə bilməz, qəm degil,
Həq bilir xəlqi-cahanın sirrini, həm faşını.

* * *

Mərhəba, insani-kamil, canımın cananəsi,
Aləmin cismi sədəfdir, sənmisən dürdanəsi?

Vəchini səb'ül-məsani oxuyan gündən bəri,
Gör ki, nə divana düşmüş aşiqin divanəsi.

Ta səqahüm şərbətindən içdi bu xəstə könül,
Seyri-öv ədnayı buldu, qaynadı xümxanəsi.

Çün bizə mə'lum olubdur mə'niyi-ümmül-kitab,
Arifəm, səm'imə sığmaz zahidin əfsanəsi.

Şol Xızır biçarə içmiş abi-heyvan dedilər,
Ta ləbin eyninə irməz, yoxdur onun xanəsi.

Əhsəni-təqvim bilən nəçük ənəlhəq deməsin?
Bəs nədən bərdar olubdur Mənsurun divanəsi?

Kafirin bütxanəsi var, mö'minin – Beytülhəram,
Aşiqin yar eşigidir Kə'bəvü bütxanəsi.

Şəm'i-vəhdətdir camalın, söhbəti rövşən qılır,
Qarşıda xoş-xoş yanadır Seyyidin pərvanəsi.

* * *

Sən sana gər yar isən var, ey könül, yar istəmə!
Yarü dildar ol sana, sən yarü dildar istəmə!

Bivəfadar çün bu aləm, kimdən istərsən vəfa?
Bivəfa aləmdə sən yari-vəfadar istəmə!

Gül bulunmaz bu dikənli dünyanın bağında çün,
Əbsəm ol, bihudə gülsüz yerdə gülzar istəmə!

Mə'rifətdir xalis altun, sikkəsi fəzlü hünər,
Altunu tanı, zəğəldən ari dinar istəmə!

Həqqə münkirdir fəqih, inanma ol şeytana kim,
Yoxdur ol cinxilqətin zatında iqrar, istəmə!

Ari göftar, ey könül, gerçəklərin nitqidürür,
Hər diliəgridə yoxdur ari göftar, istəmə!

Cifədir dünya, anın talibləri adı kilab,
Olma kəlb anın kim, oldu adı murdar, istəmə!

Şərbəti ağuludur fani cahanın, sən anın
Şərbətindən nuşudaru umma, zinhar istəmə!

Dünyanın sevgisi ağır yük imiş, məndən eşit,
Nəfsini yük etmə ana, ey səbükbar, istəmə!

Bir əmin məhrəm bulunmaz, ey Nəsimi, çün bu gün,
Xəlqə faş etmə bu rəmzi, kəşfi-əsrar istəmə!

* * *

Gəlmişəm həqdən ənəlhəq, gör nə Mənsur olmuşam,
Ruhi-qüdsün nitqiyəm, sər ta qədəm nur olmuşam.

Lövhi-məhfuzu mənəm, ruhül-əminin həmdəmi,
Həşr üçün mizanü İsrafilü həm sur olmuşam.

Bavücudam vəhdəti kəsrətdə isbat eyləyim,
Musayam anəstünara, nur ilə Tur olmuşam.

Gərçi qaibdir vücudum hər nəzərdən daima,
Gör nə nazir, gör nə mənzər, gör nə mənzur olmuşam.

Laməkanın gənciyəm, gərçi yerim viranədir,
Eylərəm mə’mur anı, gör kim, nə mə’mur olmuşam.

Surətü mə’ni mənəm, həm ism ilə, həm cismü can,
Gör necə mə’ni ilən surətdə məstur olmuşam.

Şöhrət afətdir, usandım şöhrətindən aləmin,
Gərçi həm ə’ladavü əfsəldə məşhur olmuşam.

Atəşi-mehri-rüxün canımda tə’sir eylədi,
Mən bu oddan yanıram, yə’ni ki, məhrur olmuşam.

Misr came'dir vücudum, anda qıldım cüm'əyi,
Gör nə şəhrəm, gör nə möhkəm qəl'əvü sur olmuşam.

Zakirəm, zikr eylərəm, yə'ni ki, şeyxəm, sufiyəm,
Gör nə göyçək ad ilə aləmdə məzkur olmuşam.

Ey Nəsimi, cənnətü hur ol nigarın vəslidir,
Çün mən ol məhbubu buldum, cənnətü hur olmuşam.

* * *

Daim ənəlhəq söylərəm, həqdən çü Mənsur olmuşam,
Kimdir məni bər-dar edən, bu şəhrə məşhur olmuşam.

Qibləsiyəm sadiqlərin, mə'şuquyam aşiqlərin,
Məqsuduyam layiqlərin, çün beyti-mə'mur olmuşam.

Musa mənəm kim, həqq ilə daim münacat eylərəm,
Könlüm təcəlli nurudur, anın üçün Tur olmuşam.

İrdim qaşın me'racına kim, qabü-qövseyin oldurur,
Vüslət şəbindən gör məni, sər ta qədəm nur olmuşam.

Bəzmi-əzəldə içmişəm vəhdət meyinin cür'əsin,
Şol cür'ədən kim, ta əbəd sərməstü məxmur olmuşam.

Ey ay üzündür vəzzüha, vəlleyl imiş saçın qara,
Lə'lin mana darüş-şəfa, oldur ki, rəncur olmuşam.

Hər yana kim, dönər üzüm, yarı görə anda gözüm,
Çün bu qəmindən qəm yedim, şadanü məsrur olmuşam.

Ol şahidi-qeybi mənəm kim, kainatın eyniyəm,
Ol nitqi-rəbbani mənəm kim, dildə məzkur olmuşam.

Çün on səkkiz min aləmə oldu vücudum ayinə,
Ol surəti-rəhman mənəm kim, xəlqə məstur olmuşam.

Ol gizli gəncin sirriyəm kim, zahir oldu gövhərim,
Ol gövhərəm kim, gün kimi aləmdə məşhur olmuşam.

Çün mən, Nəsimi, gövhərəm, gəncim sizə faş eylərəm,
Mən bir dəli divanəyəm, gör kim, nə mə’mur olmuşam.

* * *

Dəryayi-mühit cuşə gəldi,
Kövn ilə məkan xüruşə gəldi.

Sirri-əzəl oldu aşikara,
Arif necə eyləsin müdara?

Hər zərrədə günəş oldu zahir,
Torpağa sücud qıldı tahir.

Nəqqaş bilindi nəqş içində,
Lə’l oldu əyan Bədəxş içində.

Acı su şərabi-kövsər oldu,
Hər zəhr nəbatü şəkkər oldu.

Tiryak mizacı tutdu ağu,
Lö’löi-müdəvvər oldu daru.

Külli yerü gög həq oldu mütləq,
Söylər dəfü çəngü ney ənəlhəq.

Məscud ilə sacid oldu vahid,
Məscudi-həqiqi oldu sacid.

Hər qətrə mühiti-ə’zəm oldu,
Hər zərrə Məsihü Məryəm oldu.

Daşü kəsək oldu vərdi-nəsrin,
Fərhad ilə Xosrov oldu Şirin.

Mə’şuq ilə aşiq oldu bir zat,
Məhv oldu vücudi-nəfyü isbat.

İman ilə küfr bir şey oldu,
Dadlu ilə acı bir mey oldu.

Şirkət aradan götürdü vəhdət,
Vəhdətdən açıldı babi-rəhmət.

Can ilə tən oldu bir həqiqət,
Birikdi şəriətü təriqət.

Əşya ikilkdən oldu xali,
Baqi əhəd oldu layəzali.

Ey talib, əgər deyilsən ə’ma,
Gör və’deyi-külli mən əleyha!

Rəf oldu hicab masivəllah,
Əlqüdrəti-vəl bəqa’i-lillah.

Qeyr odlu həlakü vəch qaldı,
Bəhr oldu şu kim, bu bəhrə daldı.

Gər açuq isə bəsirətin bax,
Gör səndə həqi vü getmə irax.

Gör sən səni kim, nə cismü cansan,
Məqsudi-vücudi-kün-fəkansan.

Çün mö’minə mö’min oldu mir’at,
Mir’atına baxü anda gör zat.

Hər kimsə ki, əsridi bu meydən,
Həyyi-əbəd oldu zati-heydən.

Nəfsini tanıdı, bildi rəbbi,
Tövhid yolunda əkdi hübbi.

Ey həqdən irağ olan əzazil,
Gər div degilsən, adəmi bil!

Adəmdə təcəlli qıldı Allah,
Qıl adəmə səcdə, olma gümrah!

Şeytani-ləinə uyma zinhar,
Anın sözünə inanma, ey yar!

Həqdən sana latətə'ə gəldi,
Həm vəscüdü əqtərib denildi.

Çalındı qiyamətin nəfiri,
Ey sağır, eşitmədin səfiri.

Həşrin günü gəldi, uyxudan dur,
İnanmaz isən gözünü aç gör.

Uyxudan oyan ki, məhşər oldu,
Gör necə zəmanə pürşər oldu,

Sur ünün eşitmədi qulağın,
Dayındı bu köprüdən ayağın.

Nəşr oldu, oyan, quruldu mizan,
Həşr oldu, inan, bilindi yəzdan.

Çün məhrəmi – qul-kəfa degilsən,
Biganəsən, aşina degilsən.

Hər kimsə ki, tanıdı bu canı,
Bir zərrəyə saymadı cahanı.

Yerdən çıxa gəldi dabətül-ərz,
Uş sirrini eylərəm sana ərz.

Həm xatəm ola əlində fərman,
Yə'ni ki, mənəm bu gün Süleyman.

Musa mənəm, uş əsa əlimdə,
Həqdən əzəli qılınc belimdə.

Müşrikdən edər müvəhhidi fərq,
Eyvah ana kim, işi ola zərq.

Xəlqin alına basar əsayı,
Yə'ni ki, bilin bu istivayı.

Neçün ki, bu istivadadır həq,
Ol maliki-mülkü həyyi-mütləq.

Həqdən bu sirati-müstəqimi
Bilgil ki, budur həqin nəimi.

Çün sən keçəsən bu istivadan.
Azad olasan qamu bəladan.

Həm cənnətü hurü həm liqadır,
Rəhman ilə ərşi-istivadır.

Üzün bu cəhətdən ola beyza,
Min fəzli-ilahəna təala.

Adəm degil, həqq oldu bilgil,
Məscudi-həqiqə səcdə qılgil.

Fəzl istər isən həqiqətə var,
Sə'y ilə dürüş və qılma zinhar.

Əlfazi-Nəsimi gör nə candır,
Dəryayi-mühitü kövnü kandır.

# QASİM ƏNVAR

*Seyyid Əli bin Harun bin Əbülqasim Hüseyni Təbrizi "Qasim", "Qasimi", "Qasimi-Ənvar" təxəllüslərilə şeir yazan, dahi Nəsiminin mahir davamçısı məşhur Azərbaycan şairidir. O, 1356-cı ildə Təbriz şəhərinin yaxınlığında olan Sərab məhəlləsində anadan olmuş, təhsilini Təbriz şəhərində almış və cavanlığını da bu şəhərdə keçirmişdir. Şair yaradıcılığa başladığı ilk illərdən dövrünün məşhur Sufi mürşüdü, Səfəvi xanədanının banisi Şeyx Səfi Bərdəbilinin nəvəsi, Şeyx Sədrəddin ərdəbilinin müridi olaraq panteizm sufi təriqətinə meyl etmək və ömrünün sonuna qədər öz məsləkindən üz döndərməmişdir.*

*Qasim Ənvar XIV-XV əsr Azərbaycan şairləri içərisində özünün irfani əsərlərilə son dərəcə böyük şöhrət qazanmışdır. Demək olar ömrü boyu Yaxın və Orta Şərq ölkələrini gəzmiş və bir mürşidi-kamil kimi özünə çoxlu müridlər toplamışdır. O, Gilan, Qəzvin, Xorasan, Herat, Bəlx, Səmərqənd şəhərlərində olmuş, hər yerdə böyük hörmətlə qarşılanmışdır. Heratda olarkən Teymurləng və onun oğlu Şahrux tərəfindən alqışlansa da, yerli din xadimlərinin, şeyxlərin həsədinə məruz qalmış və Şahruxun oğlu Baysunqurun xahişilə Heratı tərk edib Səmərqəndə getmiş, bir müddət məşhur dövlət xadimi, alim Uluğ bəyin himayəsində yaşamışdır. Bir il sonra yenə də Xorasana qayıdıb Əbdürrəhman Caminin anadan olduğu Xərcüd kəndində məskən salmışdı. Bu yerin ürəkaçan abi-havası onu vətəni Təbrizə qayıtmaq fikrindən ayırmışdı. Burada ona bir bağ düzəltdilər və ömrünün sonuna qədər bu kənddə yaşayıb öz sufi təriqətinin təbliği ilə məşğul oldu. Qasim Ənvar 1433-cü ildə bu kənddə vəfat etdi və həmin yerdə dəfn edildi.*

*Böyük hörmət əlaməti olaraq Uluğ bəy onun qəbri üstündə əzəmətli bir türbə tikdirdi və bu məqbərə elm-irfan adamlarının ziyarətgahına çevrildi.*

*Qasim Ənvarın Azərbaycan və fars dilində yazdığı şerlər divanından başqa, "Ənisül-aşiqin", "Ənisül-arifin", "Təvəccahnamə", "Risaleyi-vücud", "Sual-cəvab", "Risalətül-Əmanə" adlı əsərləri də məlumdur.*

## QƏZƏLLƏR

Zülfünlə, cəmalınla sənin sərxoşluq hər an,
Ayüzlü vəfalım mənim, ey qəlbimə soltan!

Ey şanlı gözəl indi bu vadidə zühur et,
Göstər üzünü nurilə dolsun bu biyaban.

Ol gün ki, sənin eşqin ilə badələr içdik,
Olduq əbədi məst o gülrəngli şərabdan.

Cırdıq bu həya pərdəsini yüz para etdik,
Get sən də riya pərdə tik, ey zahidi-nadan!

Bu gün ki, mənim mehmanım olmuş o nigarım,
Ey çəng səsi saz elə, ey ud bir az yan!

Bağlandı könül öz yarımın eşqinə indi,
Min çak edərəm xirqəmi eşqində a canan!

Allaha şükür keçdi qışın şiddəti, bax gör
Açdı baharın gülləri çöl oldu gülüstan.

Zahid diləyir tövbə edim sevgidən, amma
Bilmir ki, mənə tə'sir edəmməz belə hədyan.

Eşq oldu mənim qəlbimə hakim, bu yəqindir,
Qasim yaşadıqca olacaqdır üzü xəndan.

* * *

Çəkir hər gün o nazlı fərzanə
Gözünə sürmə, zülfünə şanə.

Canının mülkünə qəza vermiş
Sirri-həqdən kəlamı dövranə.

Öylə sərməst nazənindir ki,
Hər kəsi gördü verdi peymanə.

Kim alıb içdi badəsini,
Çəkdi bir nə'rə məstü-məstanə.

Zahidə verdi təsbihi möhrü
Aşiqə verdi nəş'ə, meyxanə.

Sənin eşqində bu dəli könlüm,
Gah şam oldu, o gah pərvanə.

Hər kəsin ne'məti düşər payına
Uşağa süd və quşlara danə.

Yarı mədh eylə ey könül daim,
Başqa hər şeyə, rəvayət, əfsanə.

Aç niqabı ki hüsnünə Qasim,
Qurban etsin özünü şükranə.

* * *

Yarıma deyin a dostlar, nədir indi onda fərman,
Nə əlac edim bu dərdə, nə dəva edim, nə dərman?

Yandırıb yaxır oduyla, külə döndərir bu canı
Məni məhv edir qəmi-eşq, halımı edir pərişan.

Ürək ovlayan dil ilə ona şərh edin bu halı,
Deyiniz ki, min işarə yaradır bu küfrü iyman.

Biri zülmət ilə nurdur, birisi dolu fərəhlə,
Bədənim təlaş içində, ürəyim ümidlə xəndan.

Göstərib camalı, hüsnü aləmi digərgun etdin,
Yayılıb cəhanə indi necə ahü nalə, əfqan.

Qasimi açıq göz ilə baxıb aləmə nə gördü:
Hər tərəf cəmali-mə'ni, hər tərəf kəmali-irfan.

* * *

Məst idik, nəğmələrinlə belə hüşyar olduq,
Yatmış idik səsinə, sevgili bidar olduq.

Eşqinin meykədəsindən cana min şur düşüb,
Ataraq zünnarı səccadəni pərkar olduq.

Dedilər ki, o gedib dəmsaz olub rindlərilə,
Əl çalıb rəqs edərək nəş'əli xummar olduq.

Anlayan dəmdə ki, olmur bizə vəslin qismət,
Qəm, kədər basdı bizi hər şeyə bizar olduq.

Hər zaman ki, səri-kuyindən əsir badi-səba,
Tikan olsaq da o dəm ətirli gülzar olduq.

Üzünün nuru düşən dəmdə saralmış üzümə,
Bu səfadən gözəlim, Qasimi-Ənvar olduq.

* * *

Gözüm qanla dolu, halım pərişan
Bədən üryan, xəzinəylə dolu can.

Yar ilə aşina olsan görərsən,
Firidun gəncidir o nazlı ceyran.

Bu aləmdə qopar min fitnə, qovğa
Əgər salsa üzə zülfü o canan.

Olur cari gözümdən qanlı yaşlar,
Gönül aşüftədir bil, əql heyran.

Muradı aşiqin-yarın cəmalı
Ki, artır günbəgün hüsnü firavan.

Nigarın vəslidir Qasim duası,
Nolaydı, kaş biteydi tez bu hicran.

* * *

Dənizlər dərk edər könlüm görəndə bircə dürdanə,
Cəsamətli ağac görrəm tutanda əldə bir danə.

Cahanın pərdəsin yırtdım bütün əsrarə yol açdım,
Bəsarətlə baxıb gördüm bütün təqlidi əfsanə.

Yarın hüsnü cəmalını günəş tək aşikar gördüm,
Mənimçin olmadı fərqi bu Kə'bə, deyrü bütxanə.

Bu dünyada keçən dəmdə məlamət dağlarından mən,
Bütün aşiqləri gördüm mənim tək mərd, fərzanə.

Olub meyxanələr küncü məqamı şurü sovdanın,
Onunçün mənzilim oldu mənim də künci-meyxanə.

Baxanda aləmə Qasım açıq gözlə, yə'qin etdi
Nəzərdə bircə şam vardır hamı bu şamə pərvanə.

* * *

Könlüm, əgər sövdalisən aşiqlərə həmxanə ol!
Aşiqlər içrə hər zaman eşqində sən mərdanə ol!

Kim ovcuna qoysa qədəh, versə qulaq avazına,
Sən badəni nuş eyləyib, bəhrində bir dürdanə ol!

Nakəslərdən üz döndərib, əhli-riyanı rədd elə,
Oldunsa xəznə sahibi, öz xəznənə kaşanə ol!

Könlüm, əgər aşiq isən sidqilə sev öz yarını,
Sevda meyi içdikdə sən, dürlə dolu peymanə ol!

Yüz yol dedim aşiqlikdən dəm vurursan həmişə sən
Yarın hüsnü camalının şəm'inə bir pərvanə ol!

Daim Allah dərgahından belə xitab gəlir sənə:
Aşiq olsan kuyimizdə çalış daim divanə ol!

Qasim, sən nə təkəbbürlə öz eşqini mədh edirsən,
Hünərin var yara bağlan, özünəsə biganə ol!

* * *

Dust məhmildə, yə'ni canda can.
Bəs cərəs neyçün edir böylə fəğan?!

Saqiya, dur mey gətir, başə çəkim
Məst olub sirlər açım mən an bə an.

Bircə güpdən olsa da bu al şərab
Onda vardır eşqdən min cür nişan.

Eşqdir daim bizə yol göstərən
Ki, odur insanın əsli hər zaman.

Ver yenə saqi iki-üç cam mey,
Gəlmişəm canə xumardan, əl'-əman!

Qoy verim sirri-məlayikdən xəbər
Söyləyim ta ki nədir kövnü məkan.

Həqqi nahəqdən ayırmaz hər səfeh,
Hər gələn bilməz nədir bu dastan.

Bir-iki gün gözlə, ta mən şərh edim
Kim necə tərtib tapmış, kəhkəşan.

Qasima, sən sus daha açma dili
Çünki yoxdur quş dilini anlayan.

* * *

Gəl gözəl, badə içək, bəsdi kədər,
Kim şərab içmədisə gördü zərər.

Çatdırır eşq bizi həqqə bu gün,
Görməmişdir belə bir eşqi bəşər.

Daha yar vəsli üçün qəm çəkmə,
Elə et ki, olasan əhli-nəzər.

Könlümü aldın, ayaqdan düşdüm,
Sən məni heyrətə saldın dilbər!

Mən belə hüsnü camal görməmişəm,
Nə gözəldir yanağın, tazə vü tər.

Kim səni gördü fərəhnak oldu
Daha bir şey diləməz zərrə qədər.

Eşq gəldi canına Qasiminin,
Edəcək sonda onu zirü zəbər.

* * *

Məscid ilə meyxanə, ya Kə'bə və bütxanə.
Məqsud məhəbbətdir, biqi bütün əfsanə.

Göstər üzünü cana, ta şərh eləyim mən də,
Xəlq oldu neçin dünya, varlıqdakı mə'na nə?!

Hər kəsdə olan surət xəlq oldu əzəl gündən,
Sən hüsnünə aşiqsən, mən də sənə divanə.

Ey qibləm əziz yarım, ey canü cəhanım bil,
Didarını əks eylər Kə'bəylə bu meyxanə.

Dildar mənə söylər: bax gör nə təfavüt var
Mən nur ilə şəm'əm, sən zülmat ilə pərvanə.

Sən nurə yaxınlaşsan aydın görəcəksən ki,
Ölməz əbədi varlıq, qalmaz belə viranə.

Ey Qasimi, noqsanın bil hökmi xüdidəndir
O, bildi əzəl gündən gəldin necə dövranə.

## RÜBAİLƏR

Qəlbimdə bir yarın məhəbbəti var,
Eşqinin meyilə olmuşam xumar.
Hüsnünü, zülfünü görəndən bəri,
Dolanır başıma bütün ruzigar.

Qoca bir filosof etdi nəsihət:
Amandır sevgilə bağlama ülfət.
Sözünə baxmadım, hicran dağını –
Başıma endirdi, sevgi, məhəbbət.

Belə bir xahişim var nigarımdan:
Məst etsin məni bir şərabla haman,
O qədər məst olub xəbər tutmayım
Özümdən, varlıqdan, qoca dünyadan.

Ey gözəl, eşqindən olmuşam rüsva,
Nurinlə gözlərim tapıbdır ziya.
Hara baxıramsa səni görürəm
Olmuşam yolunda valehü şeyda.

Bu canla bu cahan, bu aləm bizik.
Dünyanın rövnəqi o adəm bizik.
Dirilən zamanda nəfəsimizlə
Bilərsən dirildən nəfəs dəm bizik.

Ey gözəl, biz sənə olduq tələbkar,
Sənsən nur mənbəi, səmimi dildar.
Ey sadiq məsləkdaş səni istərik,
Sənsən bu aləmdə vaqifi-əsrar.

Rütbədə qarınca olsaq da bu an,
Yenə də çox işdə bizik hökmran.
Bir ləhzə gədayıq, bir ləhzə şahıq,
Biz öz halımıza olmuşuq heyran.

Yarını itirən zavallı mənəm,
Zəhər içirmişdir mənə dərdü qəm.
Onunçün edirəm ahü nalə ki,
Murada çatmayan dünyada mənəm.

# MİRZƏ CAHANŞAH HƏQİQİ

*XV əsr Azərbaycan tarixinə görkəmli şair, vətənpərvər və müstəqil siyasi görüşlərə malik bir dövlət xadimi kimi daxil olan Həqiqi (1397-1467) Cənubi Azərbaycanın Xoy şəhəri yaxınlığındakı kənddə anadan olmuşdur. O, Qaraqoyunlular dövlətinin banisi Qara Yusifin üçüncü oğludur.*

*Həqiqi gənc yaşlarından şerə, musiqiyə, xüsusən xalq ədəbiyyatına böyük həvəs göstərmiş, elmə və maarifə dərin rəğbət bəsləmişdir.*

*Cahanşah Həqiqi hakimiyyət başına gəldikdən sonra qanlı müharibələrə son qoymuş, Qaraqoyunlu dövlətini möhkəmləndirməyə nail olmuşdur. O, bir sıra köçəri-tərəkəmə adət və ənənələrinə qarşı çıxaraq, köçərilərin oturaq həyata keçmələrinə çalışmışdır.*

*Cahanşah Həqiqinin mütərəqqi fəaliyyəti və müstəqil siyasəti ruhanilər və bir sıra qonşu dövlətlər tərəfindən düşmənçilik hissi ilə qarşılanmış, nəticədə o, 1467-ci ildə Ağqoyunlular dövlətinin başçısı Uzun Həsənlə vuruşmalı olmuş, lakin mühasirəyə alınaraq öldürülmüşdür.*

*Cahanşah Həqiqi Azərbaycan və fars dillərində qəzəl, məsnəvi və rübailər yazmış, onların hamısını bir divana toplamışdır. O, dövrünün mütərəqqi ideyalarının təbliğatçısı, həqiqi eşqi və gözəlliyi tərənnüm edən bir şair kimi şöhrətlənmişdir.*

## QƏZƏLLƏR

Yarın gərək ki, mehri-ruxu dilpəzir ola,
Ta hüsnü xülq içində cahanda əmir ola.
Hər kim ki, qılmaya nəzər ol hüsnü surətə,
Yoxdur bəsirət anda gər əhli-bəsir ola.
Hüsn ilə çun nəzər bulunmaz cəmalına,
Aləmdə ol yeganə məgər binəzir ola.
Biçarə, eşqə neyləyə tədbirü çarəsin,
Mə’şuqə şahi-aləmü aşiq fəqir ola.
Tovhid içində nükteyi-əsrarı bilmişəm,
Sahib-nəzər gərək ki, bu hala xəbir ola.
Mənsuri-eşq olanda Həqiqi ze fəzli-həq,
Anın müini ayəti-ne’mən nəsir ola.

* * *

Hər aşiqin ki, naləvü dərdi ze can ola,
Canan yolunda aqibət ol canfəşan ola,
Yarın qəmində tərki-cahan etməyən könül,
Ol can deyil ki, xilqət ana cavidan ola.
Biminnəti-fəraq vüsalın tələb qılan,
Vacibdir ol fəqirə kim, ol tərki-can ola.
Dərdü fəraqü möhnətü ənduhi hicrü qəm,
Yarın yolunda cümləsi bir gülsitan ola.
Hər kim ki, başını sala dər asitani-dust,
Təxti səriri səltənət ola, asitan ola.
Əsrari-eşq içində Həqiqi, to dəm məzan,
Hər kimsənin məratibi əz xod əyan ola.

* * *

Ey məni dami-saçın çəkdi səri-darına,
Canımı yaxdı qəmin atəşi-ruxsarına.
Məskəni-ə’raf imiş, ayinəsi saf imiş,
Kim ki, qul oldu bu gün sən büti-əyyarına.
Ey əzəlin rovzəsi vəsli-ruxun aşiqə,
Bülbüli-məst olmayan irmədi gülzarına.
Sünbüli-pürtabının damına düşdü könül.
Canımı qıldı əsir, çeşmi-diləfkarına
Ol büti-əyyarənin dərdü qəmü həsrəti,
Bağrımı qan eylədi, yaxdı məni narına,
İçdi Həqiqi əzəl xəmrəni əz cami-eşq,
Ta kim, irişdi ləbin badeyi-gülnarına.

* * *

Yarəb, nə nur imiş ki, məni yaxdı narına,
Yarəb, nə zat imiş ki, məni çəkdi darına.
Sübhi-əzəldə qıldı müəttər dimağımı,
Ta əsdi dan yeli saçının mişkbarına.
Kəhli-bəsiri-didə qılan xaki-payini,
Gər bir güzər irişsəm anın kuhsarına.
Xalivü çeşmü qəmzəsi aşüftə könlümü

Çəkdi kəməndi-zülfünə, saldı şikarına.
Bağrım qanın gözümdən axıtdı qəmi-ruxi,
Simin əlini qıldı anınla nigarına.
Dövründə lə'lin meyi əsrütti ta əbəd,
Şol badədən ki, kimsə irişməz xumarına.
Bağrımın işvə birlə qılır yara qəmzəsi,
Yarəb, nə işvədir ki, qılır qəmzə yarına.
Yarından ayrı yandı Həqiqi fəraq ilə,
Gəlgil təfərrüc eylə anın ahü zarına.

* * *

Qıldı münir aləmi şahidi-mən cəmal ilə,
Müshəfi-rəbb imiş ruxi ayəti-xəttü xal ilə.
Çeşm ilə zülfü xalının dərdü qəmü fəraqını,
Gəl mənə sor ki, canımı yaxmışam ol xəyal ilə.
Cami-ləbində cür'əsi badeyi-eşq imiş məgər,
Məsti-ələst edər bizi kövsəri-zülcəlal ilə.
Hüsnünə çun zəmanədə kimsə bərabər olmadı,
Tutdu cahanı sərbəsər hüsnüləvü cəmal ilə.
Ey məni dağü həsrətə yandırıban həlak edən,
Gəl nəzər eylə halıma, qoyma məni bu hal ilə.
Təşnələbəm deyən könül gövsəri-canfəzasına,
Eyni-həyata vəsl ola səlsəbili-zülal ilə.
İşvəvü naz ilən məni gərçi yaxar cəfasına,
Rəngimi laləgun edər ləbləri xəmri-al ilə.
Al ilə ol qara gözün qəmzəsi dəldi bağrımı,
Dövri-zamanə fitnəsi yaxdı məni bu al ilə.
Eşqi-ruxunda dilbərin ol irişür murada kim,
Canü cahanı varlığın tərk edə mülkü mal ilə.
Verdi Həqiqi könlünü şahidi-laməkana çun,
Şövkəti-cavidan dilər rəhməti-layəzal ilə.

* * *

Talibi-yarəm əzəldən, yara müştaqam yenə,
Cənnətin kuyində ol dildara muştaqam yenə.
Gərçi didarında yetdi canü dil məqsuduna,
Həmdillah ki, mən ol didara muştaqam yenə.

Dünyəvü üqba həram oldu mənə bivəsli-yar,
Yar ilən yaram əzəldən, yara muştaqam yenə.
Eşqinin əsrarını faş etmişəm aləmdə mən,
Gəl bu sirri gör kim, ol əsrara muştaqam yenə.
Qılmışam "Şəhnaz" ilən "Üşşaq" şərhin dər "Əraq"[1],
Bu məqamından mən ol ədvara muştaqam yenə.
Cənnət-abadi-səri-kuyindən ayrı dilbərin,
Bülbüli-aşüftəəm gülzara muştaqam yenə.
Çun Həqiqi də'viyi-Mənsur əgər qılsam nola[2],
Nasiri-mənsura heyran, dara muştaqam yenə.

* * *

Düşmə zəmanə fikrinin dərdi-sərü xəyalinə,
Olma həris dünyənin gəncinə, mülkü malinə.
Cənnəti-vəsli-dilbəri gəl tələb et ilahidən,
Cənnətə vasil olmayan irməz anın vüsalinə.
Xülq iləvü cəmal ilə məndən apardı mənliyi,
Afərin ol cəmilənin xülqüləvü cəmalinə.
Əhsəni-hüsni-surətə səcdə gətir, ibadət et,
Ta biləsən bu surətin hüsnü nədir, cəmali nə.
Ağzınavü miyaninə hər necə kim baxım dedim,
Zərrəcə irmədi mənim əqlim anın xəyalinə.
Saçlarının kəməndilən çəkdi apardı könlümü,
Canı müğəyyəd eylədi damü bəladə xalinə.
Ləm'eyi-hüsni-surəti-tə'nə bir afitab edər,
Qüdrət əli çəkər qələm qaşlarının hilalinə.
Xilqətinin turabına arif isən sücudə gəl,
Ta yetəsən bu xilqətin mə'rifətü kəmalinə.
Lütfi-cəmali-vəslini gəl tələb et Həqiqiya,
Şaibə qılmagil anın lütfünəvü cəmalinə.
Canü cahanı tərk edib eşq ilə gəl bu ərsəyə,
Düşmə bu çərxi-kəcrovun irsinəvü məlalinə.

[1] "Şəhnaz", "Üşşaq" və "Əraq" sözlərində lütf-söz oynaqlığı vardır. Həmin sözlər eyni zamanda musiqi terminləridir və Rast muğamının məşhur guşələridir.
[2] Nə olar.

* * *

Yolunda canını tərk etməyən vəfa bilməz,
Fəraq əlində bəla çəkməyən cəfa bilməz.
Saçın səvadını vəlleyliyə qılmayan təşbih.
Yüzündə ayəti-vəşşəmsü vəzzüha bilməz.
Cahanı tutdu niyaz ilə zahidi-təqva,
Onun həqiqətini saliki-riya bilməz.
Təvafi Kə'beyi-kuyindən istəyən abid,
Becoz vüsali-ruxət Mərvəvü-Səfa bilməz.
Rəqibi sor mənə, qılma anın hekayətin,
Biganə haləti hər əhli-aşina bilməz.
İlahi olmasın ol dil ki, əz səri-ixlas,
Bu canə danəvü damında mübtəla bilməz.
Hicabi-zülmət ilən bağladı bəsirətini,
Qubari-payini hər kim ki, tutiya bilməz.
Nəvayə yetdi Həqiqi muradi-vəslindən,
Anın muradını hər əhli-binəva bilməz.

* * *

Gəlgil ki, səndən ayrı dəxi yar bilmənəm,
Bigülşəni-vüsali-to gülzar bilmənəm.
Vermən bu çərxi-kəcrovi-qəddarə könlümü,
Ol təcridəm ki, aləmi-qəddar bilmənəm.
Eşqin qədimü mehri-ruxun layəzal imiş,
Mən bundan özgə nükteyi-əsrar bilmənəm.
Xəmri-ləbindən əsrimişəm, ya ze xumari-mey,
Xəmri-ləbin kimi dəxi xummar bilmənəm.
Mənsurivar əgərçi məni darə çəksələr,
Darüş-şəfa derəm mən ani, dar bilmənəm.
Gər qoymuşam libasımı meyxanədə girov,
Sərməsti-badəəm sərü dəstar bilmənəm.
Şəm'i-ruxunda canımı pərvanə qılmışam.
Ol narə düşmüşəm dəxi mən nar bilmənəm.
Peyvəstə qaşların kimi mehraba baxmanam,
Məstanə gözlərin kimi əyyar bilmənəm.
Şərhi-ləbin çu nitqə gətirdi Həqiqini,
Mən bundan özgə nitqi-dürərbar bilmənəm.

* * *

Çəməndə sərvi-qədin tək çinar görməmişəm,
Ruxun kimi səməni-gülüzar görməmişəm.
Əzəl günündə sənin eşqin ilə ta be əbəd,
Mənim kimi dəxi bir biqərar görməmişəm.
Fəraqü dərdü qəmindən nə fikrim ola mənim,
Çu sən təki sənəmi qəmküsar görməmişəm.
Kənarə qılmamışam eşq ilə ze ruzi-əzəl,
Miyani-eşqə düşəndən kənar görməmişəm.
Cəmali-hüsnünə ayinədir zəmiri-münir,
Cəmalın ayinəsində qubar görməmişəm.
Saçın səlasili dami-bəlayə saldı məni,
Bu dami-hicri-bəladan güzar görməmişəm.
Saçın kimi Xotəni-müşkübara baxmamışam,
Ruxun kimi çəmənü mürğüzar görməmişəm.
Apardı səbrü qərarımı ol qara gözlər,
Özümdə mən dəxi səbrü qərar görməmişəm.
Həqiqiyəm ki, bu dövrü mədar içində bu gün,
Bu hüsn ilə sənəmi-ruzigar görməmişəm.

* * *

Ol ruxun şəm'inə çun canımı pərvanə dedim,
Yaxdı yandırdı məni atəşi-hicranə dedim.
Neçə zahidləri pabəndi-bəla qıldı saçı,
Neçə aşüftələri çəkdi o zindanə dedim.
Yüzünün ayətinin əvvəli çün fatihədir,
Yaz onun hərfini sərnameyi-Qur'anə dedim.
Qılmışam qamətini sidreyi-rizvanə misal,
Aşiqəm can ilə ol sidreyi-rizvanə dedim.
Qədəmi-xaki-dərdindən yüzümü etmən iraq,
İşveyi-qəmzələri qarəti-din eylər iman
Ki, mən ol eynə neçün kafəri-türkanə dedim.
Ey Həqiqi, bu məlahət ki, ruxi-yaridədir,
Yaxdı həsrət qəmilən bağrımı büryanə dedim.

* * *

Ta əzəldən düşdü ol yar ilə bazarım mənim
Firqətindən ərşə çıxdı naleyi-zarım mənim.
Razi-eşqin canımın içində saxlardım, vəli
Aqibət faş oldu gizli gənci-əsrarım mənim.
Dilbərin yolunda qurban olmağa ey müttəqi,
Olmagil naseh ki, vardır anda iqrarım mənim.
Şol mükərrəm pakizə gövhər ki, yoxdur qiyməti,
Kimdürür aləmdə ol yari-vəfadarım mənim.
Rovzeyi-rizvan müəttər oldu əz buyi-ləbəş,
Ta güli-xəndanın görsətdi gülzarım mənim.
Səndən ayrı olmasın yarəb, bu çərxi-ruzigar,
Gəl ki, sənsən dünyəvü üqbada dildarım mənim.
Çun Həqiqi gördü ol mə’şuqənin ruxsarını,
Dövlətü iqbalə yetdi bəxti-bidarım mənim.

* * *

Zülfundən ayrı dami-bəlayə bəla demən,
Ol damə mən mənim kimi bir mübtəla demən.
Zahid beğeyri-zöhd çu bilməz təriqi-eşq,
Yoxdur səfası mən anə əhli-səfa demən.
Ey xosrovi-zəmanədə hüsnilə xublərin,
Şahi-cahanı həzrətnə bir gəda demən.
Səbr etməyən vəfadə nigarın cəfasına,
Ol bivəfayə bil ki, mən əhli-vəfa demən.
Ey dərdimin davası ləbin eyni-kövsəri,
Vəslindən ayrı cənnətə darüş-şəfa demən.
Məhfuzi-ləmyəzəl xətü xalındır aşiqə,
Arif bilir ki, mən bu sözümdə xəta demən.
Çəkdi Həqiqi səri-zülfün kəməndinə,
Dami-bəlayə saldıvü dami-bəla demən.

* * *

Gəlgil ki, sevmişəm səni cananələrdə mən,
Can oynaram yolunda bu divanələrdə mən.

Viranə könlümü qəmi-eşq etdi çun məkan,
Bəs gənc bulmuşam dili-viranələrdə mən.
Hər təşnənin ki, canı müsəffa ləbin deyil,
İçmən həyat abın ol peymanələrdə mən.
Çun xanəqahü mədrəsəvü zahidəstü şeyx,
Həqdən murad istərəm ol xanələrdə mən.
Biganə kimdürür kim ana aşina deyəm,
Ya olam aşina dili-biganələrdə mən.
Yaxdı Həqiqi canını şəm'i-ruxunda çun,
Yandım bu ahü suz ilə pərvanələrdə mən.

* * *

Ol hüsn ilə xəti xalə təhsin,
Ol müshəfi-layəzalə təhsin.
Ol abi-həyati-canfəzayə,
Ol çeşmeyi-zülcəlalə təhsin.
Arif deyil ol ki, qıldı daim,
Bu dünyavü mülkü malə təhsin.
Al eylədi fitnə qıldı eynin,
Ol fitnəli eynü alə təhsin.
Ol qaməti-sidrətül-cinanə,
Ol nun ilə mimü dalə təhsin.
Şol qürseyi-aftab içində.
Kim qılmaya ol hilalə təhsin.
Hər kim ki, Həqiqi oldu, qıldı
Ol zülf ilə xətü xalə təhsin.

* * *

Gəlgil ki, nuri-didə cəmalındadır sənin,
Dövri-qəmərdə fitnə hilalındadır sənin.
Ağzın çu mimü zülfü qaşın nunü dal imiş,
Könlüm həmişə ol mimü dalındadır sənin.
Zulmat içində çeşmimə heyvan imiş ləbin,
Xızrın həyatı abi-zülalındadır sənin.
Afaqı tutdu işvəvü eynin məlahəti,

Ol fitnədən ki, mərdümi-alındadır sənin.
Ta ruzi həşr nuri-hidayətdir, ey sənəm,
Misbahi-ləmyəzəl ki, cəmalındadır sənin.
Xətün hesabını bilən əhli-xəbirə sor,
Ol ayəti ki, nöqtəsi xalındadır sənin.
İstər Həqiqi vəslini həqdən bekami-dil,
Anın muradı kami-vüsalındadır sənin.

* * *

Ey saçın zülmət, ruxun mehr ilə mahı könlümün,
Xaki-dərgahındadır iqbalü cahı könlümün.
Vacib olmuşdur mənə qılmaq müsəxxər aləmi,
Çun iki aləmdə sənsən padşahı könlümün.
Ey xətin şə’nində münzəl ayəti-ümmül-kitab,
Lövhi-məhfuzindədir həqdən kəvahı könlümün.
Həsrətin dərdi məni yaxdı fəraqın narına,
Cənnəti-vəslindən oldu üzrxahı könlümün.
Taci-xosrovdur sənin fəzlindən ey sultani-hüsn,
Fərqi-iqbalü səadətdən külahı könlümün.
Aftabi-surətin zülfi-pərişanındadır,
Şol cəhətdən rovşən olmuşdur siyahı könlümün.
Qəmzeyi-xunriz ilən qıldın müsəxxər aləmi,
Çün xətü xalındadır ləşkər sipahi könlümün.
Vəhdətin kuyində məhv oldu Həqiqi ta əbəd,
Turi-eşqindir əzəldən təkyəgahı könlümün.

* * *

Yarın cəfayi-qəmzəsi canımda yarədir,
Ahu fəraq əlində cigər parə-parədir.
Yarın qəmində ağrıma ey dil, cəfasına,
Qılgil vəfa ki, cövri anın bişümarədir.
Məhşər günündə məskən darül-xülud imiş,
Ol abidin ki, qibləsi ruxsari-yarədir.
Qanımdan əsrüdi çün anın fitnə gözləri,
Canın həmişə meyli ol çeşmi-xumarədir.

Yarəb, nədir ki, könlüm irişməz vüsalinə,
Peyvəstə daqi-həsrəti bağrımda yarədir.
Kim ki, bu yolda eşqə mürid oldu ey rəfiq,
Səm'ində arifin nəfəsi güşvarədir.
Çun zərrədir Həqiqi, anın hüsnü aftab,
Məhtab çevrəsində nəçük kim sitarədir.

* * *

Eşqi-canan hər kimin canında ki, tə'sir edər,
Canını canana qurban qılmasa təqsir edər.
Hər müfəssir kim anın vəchində gördü ayətin,
Həm sücud eylər ana, həm aləmə təfsir edər.
Cavidanı dövləti-mənsur bulmaz yardan,
Eşq meydanında hər kim yarilən tözvir edər.
Ayəti-ruxsarını mə'şuqənin hərfən behərf,
Katibi-qüdrət belövhi-canü del təhrir edər.
Xab içində görmüşəm bir yari-gülruxsarı kim,
Yusifi-Misri anı yüz vəch ilən tə'bir edər.
Çun Həqiqinin iki aləmdə sənsən dilbəri,
Canını yolunda qurban qılmasa, təqsir edər.

* * *

Həşrin hesabını nə bilir cəhli-bixəbər,
Gəl həşrə qail ol ki, bu hikmətdədir nəzər.
Ey tacü təxtə, mülki-cahana həris olan,
Arif qatında tapmadı miqdar simü zər.
Zahid eşitdi nəfxeyi-surun sədasını,
Yovmül-qiyamə oldu, nə yatırsan ey bəşər?
Düşdü cahana fitnəvü aşibü qülqülə,
Ta sünbülün götürdü cəmalından ol qəmər.
Aşüftə zülfü xalü ruxi, çeşmü qəmzəsi,
Qıldı məni itab ilə "əz xiş bixəbər".
İdrakü fəhm irişmədi ovsafi-zatına,
Qıldım hədisi-lə'lin anın şərhi-müxtəsər.
Əndişənin gümanını tərk eylə, fariq ol,
Peymanə dolmayınca tökülməz xun əz cigər.

Ey cənnətin şərabi ləbi-yardır deyən,
Canım həyati-ləmyəzəl ol yaridən dilər.
Fəzli-ilahidən iki aləmdə şah imiş,
Ol əhli-dil ki, yar ilə ömrünü sərf edər.

* * *

Ləblərindir abi-heyvan, gözlərin meyxanələr,
Mürği-canı seydi-eşq etdi şu damü danələr.
Cənnəti-vəslindən ayrı ey dilaramım mənim,
Aşiqa, halın nə bilsin qafilü biganələr.
Çun bu viran könlümün me'marı eşqindir şəha,
Zan səbəb mə'muri-eşq oldu dili-viranələr.
Daneyi-xalın giriftari-əbəd qıldı məni,
Şəm'i-ruxsarında yandı ta əbəd pərvanələr.
Susadı lə'lin şərabından bu cani-təşnə dil,
Ta ləbin dövründə cuş etdi şəha, peymanələr.
Eşqiniz yolunda can qurban qılandır payidar,
Hər dili əyridə yoxdur də'viyi-mərdanələr.
Ey Həqiqi, canını canana qurban qılmağa,
Qılmağıl təqsirə, qılğıl üzri-dərvişanələr.
Vaiza, əfsanəyi tərk et ki, yoxdur hasili,
Dərdi-canan çəkməyən cahildədir əfsanələr.

* * *

Əhli-eşqin ahını gəl aşiqi-canana sor,
Xosrovi-hüsnün məqamın rovzeyi-rizvana sor.
Zikrü təsbihin niyazın istə şeycü şabidən,
Vəhdətin cami-şərabın məsti-cavidana sor.
Salikin əsrarını zahiddən eylə müntəşir,
Sən bu razın halını var arifi-rəbbana sor.
Bülbüli-aşüftənin peyvəstə ahü naləsin,
Ol xəti səbzə, ruxü gül sidreyi-rizvana sor.
Daği-həsrət çünki ol yarın qəmidir aşiqə,
Gəl bu həsrət dağını bu cani-sərkərdana sor.
Olmagil şeytani-nəfsin illətindən bixəbər,
Gər ze ürfansan bu razı sacidi-rəhmana sor.

Ey deyən ki, təşneəm mən ol nigarın lə'linə,
Xızri-eşqin badəsin ol çeşmeyi-heyvana sor.
Çün Həqiqi suz dər şəm'i ruxəş pərvanəvar,
Atəşi-eşqin qəmin gəl bu dili-giryana sor.

* * *

Bu nə hüsni-canfəzadır kim, ana nəzir yoxdur
Kim, anın kimi cahanda dəxi dilpəzir yoxdur.
Bu cəmalü xəttü xalə necə baxsın ol nəzərsiz
Kim, anın bəsirətində nəzəri-bəsir yoxdur.
Bu kəmanü qövsə qarşı hədəf eylərəm bu canı,
Nişə kim xədəngi-qəmzən kimi canə tir yoxdur.
Səni bu cahan içində kimə eyləyim təşəbbeh
Ki, sənin kimi cahanda dəxi binəzir yoxdur.
Bu sirati-müstəqimdən gözünü fəqih bağlar,
Çün anın məşiyyətində becoz əz zərir yoxdur.
Sənin ol kəməndi-zülfündəki damü xalə qarşı,
Məni-dərdiməndi-xəstə kimi bir əsir yoxdur.
Həqiqi kəlami-həqdən nə bəyan ki, qılsa həqdir,
Kimə şərh edim bu halı kim, ana xəbir yoxdur.

* * *

Əzəldə şövqə gətirdi məni hidayəti-eşq,
Səadəti mənə kəşf eylədi sirayəti-eşq.
Ayağına başımı saldı ol pərizadın,
Yetirdi daməni-vəslə məni hidayəti-eşq.
Hər an ki, bilmədi yarın qəmini eyni-səfa,
Müyəssər olmadı ol cahilə kifayəti-eşq.
Mühibbə nöqteyi-tovhidi kəşf edər fail,
Götürdü pərdeyi-əsrarı çun rəvayəti-eşq.
Bəyani-şərhinə müstəğrəq oldu canü könül,
Mühitə saldı məni gənci-binəhayəti-eşq.
Münəvvər eylədi viranə könlümü eşqin,
Həmin budur nəzər ey şahi-mən, rəvayəti-eşq.
Cəfavü cövrü vəfadır Həqiqiyə yarın,
Bir oldu məşrəbi-tovhid ilən hekayəti-eşq.

* * *

Ağzını qönçeyi-xəndan dedilər, gerçəkmiş,
Xəti-ruxsarını reyhan dedilər, gerçəkmiş.
Lövhi-məhfuzuni ta gördü kəlam əhli sənin,
Ayəti-vəchini Qur'an dedilər, gerçəkmiş.
Ənbərəfşan saçını küfrə münasib qılıban,
Dürci-yaqutuna mərcan dedilər, gerçəkmiş.
Əhli-təqva ki, sücud eylədi vəchində sənin,
Sacidi-surəti-rəhman dedilər, gerçəkmiş.
Ey Həqiqi, çu sənə nəqli-kəlam oldu müin,
Nəfsinin şərhini bürhan dedilər, gerçəkmiş.

## RÜBAİLƏR

Ey mələk mülkündə vəchin afitab,
Vey boyun sidrə, xətin ümmül-kitab,
Canımı yaxdı qəmi-hicrində tab,
Şövqi-eşqin bağrımı qıldı kəbab.

Vəhdətin nuru yüzün mehtabıdır,
Leylətül-əsra saçın itnabıdır,
Kövsərin xəmri ləbin qəndabıdır,
Məsti-eşq ol badənin ğərqabıdır.

Ey ruxun əmsai-məqsudati-ğeyb,
Vey sifatın zati-mövcudati-ğeyb,
Şahidi-məşhud mislin zati-ğeyb,
Vacib olmuşdur sənə isbati-ğeyb.

Ey vüsalın rovzeyi-rizvanımız,
Vey dodağın çeşmeyi-həyvanımız,
Çun iki aləmdə sənsən canımız,
Küfri-zülfün şərhidir imanımız.

Düşmənin dəf'inə çarə cəng olur,
Qeyr olan ərlik yolunda ləng olur,
Yar ilən gerçək olan həmrəng olur,
Cahilin əqli bu fəhmə dəng olur.

Ey iki aləmdə hüsnün aftab,
Müshəfi-vəchindədir ümmül-kitab,
Düşdü canə atəşi-hicrində tab,
Şövqi-eşqin bağrımı qıldı kəbab.

Əvvəlü axırda çun bir zat imiş,
Vahidiyyət şə'ninə isbat imiş.
Müshəfi-xətti-ruxu ayat imiş,
Qeyri-vəchəş cümləki əmvat imiş.

Kövsərin abı ləbin eynində saf,
Vəchinə əhli-sücud eylər təvaf,
Zərqü təzvir oldu mə'nidə xilaf,
Mö'minə həqdən irişdi latəxaf.

Nükteyi-tovhid kənzüllah imiş,
Vəhdətin kuyində vahid şah imiş.
Eşqə ikrah eyləyən gumrah imiş,
Mö'minin qəlbi ana agah imiş.

Ey yüzün mehtabı tabı könlümün,
Vey cəmalın aftabı könlümün,
Ey xətin ümmül-kitabı könlümün,
Surətin yovmül-hesabı könlümün.

Yari-dəlir ol büti-əyyar imiş,
Türrəsi ənbər, ruxu gülnar imiş,
Aşiqin rəsmi qəmində zar imiş,
Baği-vəsli rovzeyi-gülzar imiş.

Ey yüzün beytül-həramı könlümün,
Qəmzeyi-eynin imamı könlümün,
Kövsərin yühyilizamı könlümün,
Ləblərin səhbavü camı könlümün.

Ey xətin məcmueyi-xeyrül-kəlam,
Arizin dövründədir mahi-siyam,
Ey dodağın kövsəri-yühyilizam,
Kə'beyi-həqdir cəmalın vəssalam.

Vəhdətin mehtabı tabidir yüzün,
Zülmətin kəşfi-hicabıdır yüzün,
Əhli-tovhidin kitabıdır yüzün,
Arifin yövmül-hesabıdır yüzün.

Ey cəmalın aftabi-layəzal,
Vey yüzün dövri-qəmər, qaşın hilal,
Çeşmeyi-lə’lindədir abi-zülal,
Ayəti-həqdir ruxunda xəttü-xal.

Ey ləbin mai-təhuri könlümün,
Vey saçın zillində nuri könlümün,
Eşqinə yoxdur qüsuri könlümün,
Şol cəhətdəndir hüzuri könlümün.

Ey vüsalın cənnətabadi-könül,
Ey səri-kuyində bünyadi-könül,
Mehri-eşqin oldu ustadi-könül,
Aləmi tutdu fərəhşadi-könül.

Ey hədisin nükteyi-xeyrül-kalam,
Şövqi-lə’lindən cahanı tutdu cam,
Arizin dövründədir beytül-həram,
Qaşların mehrabına eynin imam.

Məsnədi-iqbalü dövlət bulmuşam,
Ta səri-kuyində qoydum yüz yerə,
Şərhi-ovsafi-cəmalı söyləsəm,
Görsədər bir dəmdə mə’na yüz yerə.

Eşq odu ilə düşmənəm bir yanə mən,
Mən haçan bu eşq odundan yanəmən,
Yanmazam eşq odundan ta əbəd,
Gər bu həsrət atəşindən yanə mən.

Ey geyən eşqin qəbavü dər’ini,
Əslini bilməz, nə bilsin fər’ini,
Dilbərin yolunda ey dil sabit ol,
Gəl bəyan eylə bu eşqin şər’ini.

Ey hədisin məzhəri-kovni-məkan,
Vəzzüha, vəlleyli, vəşşəmsü düxan,
Ey sifatından kəlami-həq bəyan,
Lövhi-məhfuzində kəşf oldu əyan.

Ey saçın zilli-ilahın sayəsi,
Vey hədisin aləmin sərmayəsi,
Piri-əqlin çun sən oldun sayəsi,
Səndədir ürfani eşqin vayəsi.

Ver könül ol gül'üzara ta əbəd,
Qoy başını payi-dara ta əbəd,
Dünyəvü üqba həram olsun, həram.
Olmayan heyran nigara ta əbəd.

Ey xətü xalında xalın fitnəsi,
Qabi-qovseynin hilalın fitnəsi,
Nərgisi-məstində alın fitnəsi,
Aləmi tutdu cəmalın fitnəsi.

Sirri-hikmət künti-kənzin razıdır,
Arifi-vəhdət anın dəmsazıdır,
Eşqbazi beh ze şərtrəncbazıdır,
Nəfsini qət' eyləyənlər qazıdır.

Kim ki, bilmir öz həqqinin zatını,
Sormagil ondan anın isbatını,
Oynamaz şətrənci-eşqin atını,
Görməyən bu rüq'ənin şahmatını.

Ta ki, mən əzmi-dilaram eylədim,
Tərki-fikri-səbrü aram eylədim,
Bivəfa sövdaları xam eylədim,
Özümü aləmdə niknam eylədim.

Bağrımı dəldi, gəl ey can parəsi,
Səndədir bu zəxmü dərdin çarəsi,
Çun ərsədi cani-həsrət parəsi,
Taqətim yoxdur dəxi yalvarəsi.

Dilbərin lə’lini xəndan istərəm,
Ləblərindən abi-heyvan istərəm,
Çun iki aləmdə bir can istərəm,
Canımı yolunda qurban istərəm.

Aləmi-qəddarə əğyar ol, könül,
Yar ilən yari-vəfadar ol, könül,
Canı qurban eylə bərdar ol, könül,
Vəhdətin kuyində pəndar ol, könül.

Şəm’i-ruxsarına can pərvanədir,
Dil vüsalın gəncinə viranədir,
Əhli-eşqin meyli çun sən xanədir,
Andan ötrü könlüm həsrətxanədir.

Xosrova, çox zülmü bidad eyləmə,
Aşiqi manəndi-Fərhad eyləmə,
Əzmi-hicran, cövr bünyad eyləmə,
Müddəinin könlünü şad eyləmə.

# XƏLİLİ

*XV əsrdə Nəsimi təsirində yazan hürufi şairlərindəndir. Azərbaycanda doğulub, mükəmməl mədrəsə təhsili almış, sonra bir yoldaşı ilə Sultan Məhəmməd Fatehin hakimiyyəti illərində Türkiyəyə getmiş, İznik şəhərində yaşamışdır. 1471/72-ci illərdə "Fəraqnamə" adlı məşhur əsərini yazmışdır.*

*Hürufilik təbliğ edən şeirlərilə birlikdə insan gözəlliyini, məhəbbət, sədaqət və insana hörmət ideyalarını təbliğ edən qəzəllər də yazmışdır. Bir il İstanbulda yaşamış, 1485-ci ildə vəfat etmişdir. Əsərlərinin qədim nüsxələri Avropa kitabxanalarındadır. Divanı və poemaları çap olunmamışdır.*

## QƏZƏLLƏR

Ey bilən həqqin süfatin sirri-əsmasi nədir?
Ya bu əsmadən murad olan müsəmması nədir?

Çün ibadət həqqədir, Mə'bud bir həqdir haman,
Müslümanın məscidi, kəbrin kəlisası nədir?

Zahirü batində çün mövcud həqdən özgə yox
Ya bu növcudatın ara yerdə qovğası nədir?

Yazılarkən surəti-əşxas hərdəm müxtəlif
Müttəfiq olduğu ənvain hüveylası nədir?

* * *

Mehr olamı bu, məhmi əcəb ya rüxi-ziba
Əhsəntə zəhi hüsn, təbarəkü təala,

Firuz olaraq tale olur can üfüqündə
Bənzər ana dayə məh idi, mehr idi lala.

Bənzər der idim yüzünə gül, qəddinə sərvi
Pak olsa gülün daməni, sərv olmasa yekna...

Dövlətli zəhi baş kim ola yoluna qurban,
İzzətli zəhi göz kim anı qıla tamaşa.

Ağaz edicək yazmağa bu mədhi Xəlili,
Çeşmi dolu qan idi vu başı dolu sevda.

* * *

Mən ki dərvişəm, gədayəm, padşahi-aləməm,
Ruhi-birəngəm, əgərçi rəngə gəldim adəməm.

Şeş cəhtlə çar ünsürdür məni faş eyləyən,
Yoxsa mən gəncineyi-vəhdətdə mai-mübhəməm.

Ümmihatilə nə var abaya tutdumsa xələf
Aləmi-təhqiqə baxsan cümləsindən əqdəməm.

Söyləyən həqdir mənim dilimdə hərdəm yoxsa mən
Çar ünsürdən mürəkkəb bilisanü əbkəməm.

Ey Xəlili, çün hər iş təqdir əlindən işlənür
Fariğəm dünyavü üqbanın qəmindən, biğəməm.

# H A M İ D İ

*XV əsrdə yaşamış görkəmli Azərbaycan şairidir. Öz vətənində mükəmməl mədrəsə təhsili aldıqdan sonra Fateh dövründə, 1455/56-cı illərdə, Türkiyəyə getmişdir. Fars və Azərbaycan dilində yazdığı gözəl şeirləri ilə sarayın diqqətini cəlb etmişdir. Əsərlərindən aydındır ki, çox ölkələr gəzmiş, otuz ildən artıq səyahət etmişdir. Lakin saray çəkişmələri nəticəsində İstanbuldan uzaqlaşdırılmışdır. Şairin tərcümeyi-halı ilə əlaqədar yazdığı uzun bir məsnəvidə o zamankı saray məmurları və ziyalıların həyatı da təsvir olunur. Təxminən 1485/86-cı illərdə İstanbulda ölmüşdür. Əsərlərindən dövrünün ən qüdrətli şairlərindən olduğu anlaşılır.*

## QƏZƏLLƏR

Neçün ey məh, cənnəti-kuyində bar olmaz bana,
Neçün əvvəlki kimi hiç e'tibar olmaz bana.

Dərdi-hicrində bana yar olmadı səbrü qərar,
Sən bana yar olmayınca kimsə yar olmaz bana.

Bən qaçan görsəm səni kəndümi əsla bilməzəm,
Bəxtiyar olduğumiçün ixtiyar olmaz bana.

Eşqüvün yolunda Mənsurəm vəli napaydar
Ey driğa kim, bu dövlət paydar olmaz bana.

Gər nigar etsən əli qanımdan andan dönməzəm,
Deməsünlər kim məgər mehri-nigar olmaz bana.

Hamidi gərçi qəbul olsa dəhanın vəsfini,
Bundan özgə bu cahanda hiç kar olmaz bana.

* * *

Necə dil səbr edə hicran içində,
Necə dil qəm çəkə dövran içində?

Necə axa gözümdən qanlı yaşlar,
Necə bir üzə könlüm qan içində?

Necə bir şölələnsin bərqi-ahim
Gecələr künbədi-gərdan içində?

Necə bir ol pəriru firqətində
Necə qur naləvü əfğan içində.

Dəxi vəxt olmadı kol şahi-xuban,
Bəni yad eyləyə yaran içində.

Dəxi vəxt olmadı kim xeymeyi-eyş
Quralım laləvü reyhan içində.

Gül, ey mey, Hamidi könlün sevindir
Ki, bəslər dərdi-eşqi can içində.

* * *

Rahət olmadı dil, ey rahəti-can, sən gedəli,
Qönçəvəş könlümə dar oldu cahan, sən gedəli.

Sünbüli-zülfün ilə gül yüzünü yad edərəm
Gecə-gündüz qılaram ahü fəğan, sən gedəli.

Görəli-lə'l kimi ləblərini mərdumi çeşm,
Axıdır dərdilə su yerinə qan, sən gedəli.

Abi-çeşmimdə xəyali-qədri-siminbərini,
İstərəm dəmbədəm ey sərvü rəvan sən gedəli.

Dəhənin şövqi ilə Hamidiyi-süxtənin,
Getdi səbri-dilü can oldu rəvan, sən gedəli.

* * *

Gər bu rəsmə unuda yar vəfadarlığı
Qönçəvəş getməyə hərgiz bu könül darlığı.

Qılmazam cövrü cəfavü sitəm ayrıq dedi ah,
Kimdən öyrəndi yenə bunca cəfakarlığı.

Ki, seydgahü dürüst eylədi zülfi dilimi,
Kim görübdür hələ bu vəchlə dildarlığı.

Pişkəş qıldı dəhaninə könül zərrəcə can
Neyləsün aşiqi-biçarə, budur varlığı.

Gər bəni öldürəsən qapını tərk eyləməyəm,
Anca azar ola kim olmaya bizarlığı.

Tut ki, mən xud yenə eşqini faş eyləmişəm,
Qani əhli-kərəmin adəti-səttarlığı.

Hiç yad eyləmədi Hamidiyi-süxtəyi
Bumidir bizim ilə o sənəmin yarlığı.

* * *

Ay yüzün ayineyi-surəti-candır bilirəm,
Anda nəqşi-rüxi-dildar əyandır bilirəm.

Ol əyan nur ki, mətlubidur əhli-nəzərin,
Dil hər zərrənin içində nəhandır bilirəm.

Bu ki, aram edəməz seyrü silukində fələk
Qərəzi tərbiyəti-hüsni-bəyandır bilirəm.

Ol kim alur dilü səbrü xirədi qarət edər
Məzhəri-surəti-zibayi filandır bilirəm.

Ol şəkərləb götürər Hamidiyi meygədəyə
Göstərən ola bana Mehdi zamandır bilirəm.

* * *

Varalım ol sənəmi-gülüzarə yalvaralım,
Bəlayi-firqət əlindən nigarə yalvaralım.

Niyazü həsrətilə qapusuna yüz sürəlim,
Şifiə edüb səki-kuyini yarə yalvaralım.

Müsaid olsa əgər ruzigar bizim ilə
Orada baş açubən ruzigarə yalvaralım.

Könül, bütün günü əyyami-qəmdə sabir idin
Bu gün kim oldu könül parə-parə, yalvaralım.

Bu dərdi-hicrə ki, həq ruzi qıldı bizə bu gün
Əgərçi hiç edəməziz bir çarə yalvaralım.

Gər istəsən ki yenə Hamidi kimi görəsən
Xəttü rüxi dinü gün girdkarə yalvaralım.

* * *

Dustun qəddi xəyali gecələr canda qonar,
Canda gər olmasa ol sərvü rəvan xanda qonar?

Gözdə qonsa nə əcəb xeyli-xəyali-xəttin,
Xanda kim abi-rəvan olsa çəri anda qonar.

Yarəb ol xali-rüxü lə'l kimi Xızrmi kim
Ki, gül üstündə vəki çeşmeyi heyvanda qonar.

Kim qəddin eşqilə bunda dirilirsə bu gün
Doğru bundan çokidə mövzeyi-rizvanda qonar.

Zülfünə kərdi könül eşqilə baş ovunmağa
Kim bahadır olan ər gecədə meydanda qonar.

Könlümə qəndi-ğəmi-eşq bəs, əz-qətli rəqib,
Şu səfərdən çudinə fəthilə eyvanda qonar.

Hicrlə Hamidi gər qablocadə qonsa nola
Dərdlə bülbüli-şuridə gülüstanda qonar.

# HİDAYƏT

*Şairin əsl adı Əfsəhəddin Hidayətüllahdır, "Hidayət" isə onun şeirdə işlətdiyi təxəllüsdür. XV əsrin sonlarına qədər Təbrizdə yaşamışdır. Ağqoyunluların böyük hökmdarı Uzun Həsənin (1423-1478) ölümündən sonra onun oğlu Əbülfəth Sultan Xəlil Bahadır xanın sarayında böyük əmir rütbəsinə qədər yüksəlmiş, az sonra onun qardaşı Sultan Yəqubun sarayında xidmət etmişdir.*

*Hidayətin istedadlı bir şair olması haqqında ilk məlumatı XV əsr alimi, şair və filosofu Cəlaləddin Dəvani "Əxlaqi Cəlali" adlı kitabında vermişdir. Daha sonra XVII əsr türk alimi Katib Çələbi "Kəşfüzzünün" əsərində Hidayətin divanını yad etmiş, Qafqazda Əbdülfəyyaz 1620-ci ildə yazdığı "Zəbdətülbeytan" təzkirəsində şairin divanından nümunələr vermişdir. Hələlik elm aləmində şairin divanının dörd nüsxəsi məlumdur. Bunlar Dublinin "Çester Betti", Oksfordun "Bodlian" kitabxanalarında, İstanbulun "Topqapı Sarayı" Muzeyində və Londonda F.S.Stivensenin şəxsi kitabxanasında saxlanılan nüsxələrdir.*

*Hidayət zəmanəsinə görə sadə Azərbaycan dilində şeirlər yazmışdır. Şeirlərində xalq ifadə tərzi, sözlər və orijinal təşbehlər işlətmək bacarığı vardır.*

## QƏZƏLLƏR

Dün görsədüb biləklərin ol şuxi-dilrüba,
Qıldı şikəstə könlümi dəstinə mübtəla.

Ey mişk, urma laf, xətadan o zülf ilə,
Düşməz sana bu söz, yeri get, ey yüzi qara.

Hicran güni mana nola ərz eyləsən cəmal,
Çün həşr olanda bəndəyə həq görsədür liqa.

Sən yardan gəlür, necə əğyardən qaçım,
Tədbir yoxdurur yetəcax tanrıdan bəla.

Səndən cəfadan özgə Hidayət nə uma kim,
Çün çin imiş bu nüktə ki, ömür eyləməz vəfa.

* * *

Ey canü könül mehrin ilə valehü şeyda,
İsbatın içün kövnü məkan oldu hüveyda.

Hökmünlə sənin sakin olub təxteyi-əğbər,
Əmrinlə rəvan çizginədir günbədi-xəzra.

Sənsən ki, olubdur kərəmin ami cahanda,
Hər xarə verürsən gülü hər xarəyə xara.

Səndən nə dilü didə ilən gizlü deyim raz,
Hər didəvü hər dil ilə binasənü güya.

Yarəb ki, nə iş düşsə Hidayətinin əlin dut,
Səndən budur ol düşməsə ey dust təmənna.

* * *

Həqin sifatını görübən sən nigarda,
Ol vəchə nazirəm mən o nəqşü nigarda.

Yüzin kim, səlasil purçində gizlüdür,
Bir Rumidir ki, qalmış ola Zəngibarda.

Yaşım axanda istərəm ol mahi kim, olur
Hacət qəbul olucaq əxtər güdarda.

Yüzin görəndə sormağıma açmadı ağız
Bəxtim güli açılmadı dərdi-əbharda.

Sorma, Hidayət, ol sənəmin xəşmü ğəmzəsin,
Əmnü fərağət istəmə bu ruzigarda.

* * *

Buy çəkdi zülfi-arizi ta verdi tab ana,
Reyhan gögərdi, tab hörüb aftab ana.

Kuyində məskən etdi, könül yaxma hicr ilən,
Çün cənnət əhlidir, nə verürsən əzab ana.

Sorğac könül ləbin nola derlərsə gül yüzi,
Bimar şərbət içsə qatarlar gülab ana.

Zülfini salma yüzinə, qılma günüm qara
Kim, verməz ay işığ, düşər olsa səhab ana.

Göz xəndəginə su salubam təki bulmaya
Yol vəsl günlərində şəha, xeyl xab ana.

Lə’lindən özgə təşneyi-didarına müdam,
Gər abi-Xızr olursa görünür şərab ana.

Yerdən gögə yetirə Hidayət sözü əgər,
Olursa mültəfit şəhi-alicənab ana.

* * *

Xətti-səbzən kim, deyərlər əhli-dil reyhan ana,
Səbzəmidür ya bənəfşə qalmışam heyran ana.

Könlümə yağduqca oxun mehrin artuğrağ olur,
Bəhrə artuğ verür ol yer kim, düşər baran ana.

Qanlu kirpüklər yaşımla al ipəkdir sanasan
Kim, düzər göz mərdümi hərca dürü qəltan ana.

Necə kim, su qopsa, qaynar yengi kuzə suz ilən,
Bu dili-suzanda bənzər atduğun peykan ana.

Gözlərim xəttin xəyalından sana qarşu müdam,
İki mənzərdir ki, əkmişlər ola reyhan ana.

Mərdumi-çeşmim kimi yüzimdə sanman munca xal,
Badi-sübh ötmüş dürür, dün gecə müşk əfşan ana.

Oxu əfğanlar qılub gedər Hidayət sor nədən,
Xansı yaydan güc görər yarəb ki, mən qurban ana.

* * *

Cövrü qəhrindən şəha, neçün məlamətdir mana,
Çün yetər hər nəsnə kim, həqdən həvalətdir mana.

Duşdə gördüm zülfini düşdüm cida səndən bəli,
Oldu rovşən kim bu əyyami-zəlalətdir mana.

Xali-mişkinin görəndən bərlü, ey huri sənin,
Xaldan[1] düşdüm ikən bilmən nə halətdir mana.

Canə çox ox atdığından, sanma cana inciyim
Kim, hər oxun bir ümidü istimalətdir mana.

Can əl üstə dutmuşam, gül tərki-yəğmayi deyə,
Ey Hidayət, canü dil nəğdini talətdir mana.

* * *

Səndən nə qəm kim, ey büti-dilcu yetər mana,
Aləmdə şadəm ol qəm ilə bu yetər mana.

Əğyarə yar olub, mana cövr etdigin nədir,
Qəsdin həla kim isə bu qayğu yetər mana.

Xaki-rəhin görüb, neydərəm sürməni, həkim,
Göz rövşənlığına bu daru yetər mana.

Gər fikrin axmağında isə ey yağış, bu gün,
Gör yaşımivü yağma ki, bu su yetər mana.

Baş oynayan Hidayət onunçün bəqa bulur,
Meydani-eşq içində bu cəldü yetər mana.

* * *

Bu sucdan özgə kim, verübəm canü tən sana,
Ey şux, söylə, neyləmişəm daxi mən sana.

[1] Haldan

Sən gəlmədən bulub da neçə cani-baş oynasam,
Heç bab yarəmən, mən bidil nədən sana.

Bu halə kim mən istəyüb ol xali düşmüşəm,
Düşsün görüm o halə yaman istəyən sana.

Ey dil, yetər uş ki, mana oxi yetmədi
Bir gün ola yetirə ani yetirən sana.

Çün yari-fani dünyanın əğyaridir xamu,
Yar ola gör Hidayət dil xəstəsən sana.

* * *

Ey türk, getdi canü dilü əqlü din sana,
Heç dinmədin mənimlə nədir munca, dinsana!

Könlümdə kini-qılıcü əxunçün olur müdam,
Budur dedim şəha, xamu könlümdəkin sana.

Zulfini çin dedim, mana dersən xəta dilə,
Doğrusi demək olmaz imiş heç kin sana.

Dedim kim, görmədin gedirəm tirü xəncərin,
Dur, dedi yetirim ikisindən birin sana.

Dərman yox isə, dərdilə məşhuri-şəhrsən,
Yetər Hidayət, iki cahanda həmin sana.

* * *

Seyli-sirişkim ilə yağış qıldı macəra,
Utanmadı o qətrə dənizdən zehi-həya.

Zülfeyni aldı könlümi, ey dustlar mədəd
Kim, oldu bir dəlü iki zəncirə mübtəla.

Sordum ki, Çini-zülfinə müşki-Xəta demək,
Yarəb, xəta degülmi, könül dedi kim, xəta.

Görsət dedin, nə gəlsə əlindən mana rəqib,
Gər tanrı qoysa ölməz isəm görsədim sana.

Hicran güni Hidayətə, həmdəm olur rəqib,
Doğru imiş ki, yavuzə əksük degül qəza.

* * *

Xəti-səbzin hər xaçan ol lə'li-xəndandan çıxa,
Hər yana seylabi-xunin çeşmi-giryandan çıxa.

Zülmət içindən çıxarsa abi-heyvan, yox əcəb,
Bu əcayibdir ki, zülmət abi-heyvandan çıxa.

Dövri-hüsnində əgər qul olsa könlüm Yusifi,
Olmasun yarəb kim, ol cahi-ruxundan çıxa.

Can oxunan vəsfin degəc yer tutdu könlümdə, bəli,
Könülə yer eyləyə hər söz kim, ol candan çıxa.

Göz yaşından çıxmadı miskin Hidayət aqibət,
Müşkil, ey can, hər düşən dəryayi-ümmandan çıxa.

* * *

Zülf arasında yaşur yüzüni tökkəc didə ab
Kim, yağış yağsa yaşunur bulut içrə aftab.

Almayınca busə lə'lindən bəha, can verməzəm
Kim, dadır ol bir ər cami satun alan şərab.

Mən sögüşündən sənin əkməğini fərq etmərəm,
Tanrı sözünü ədəbsizlikdir etmək intixab.

Dün məni məxmur gördü, söylədi ol kənci-hüsn,
Çeşmi-məstim fitnəsindən necəsən, dedim xərab.

Zülfidən yüzin görüb bihuş olursa dil nola,
Kim ki, dün qatsa səhərgəh, qalib olur ana xab.

Gər Hidayətin Nəvayi kimi rəngin sözləri,
Necə kim çoxdur, vəli demək gərək bir-bir cavab.

* * *

Getmə ey gülçöhrə, tərki-əhdü peyman eyləmə,
Gəl otur, çox ğönçə kimi ağzını qan eyləmə.

Eyləmə pünhan yüzini zülfi-ənbərbar ilə,
Yenə mən aşüftəvü bidinü iman eyləmə.

Sönməz oldun mən fəqiri-binəvayi bilməzəm,
Kim dedi yarəb sana kim, daxı ehsan eyləmə.

Gül budağı kimi hər dəm eyləmə bir yanə meyl,
Yaxşı olmaz, belə iş eyləmə, ey can eyləmə.

Xətü xalı zikrin anın qoyma ağzından müdam,
Gər müsəlmansan, Hidayət, tərki-Quran eyləmə.

* * *

Dəlülüb şövqi-ruxundan günəş, ey yüzi çirağ,
Yazıya düşdi yenə baş açuban yalın çirağ.

Sürgil əğyarü rəqibi qapudan, yarəb kim,
Görim ola qəza ilə bəlasından irağ.

Yar atilən məni görgəc, nola gər gülsə rəqib,
Bu məsəldir ola gər, atluya gülməsə yəyağ.

Gözümün yaşı çoxalur göricək arizini,
Nişə kim, fəsli-bahar olucağın arta bulağ.

Dinləgilən, der indi əğyar, Hidayət sözini
Ta ki, sən söz ilə söz başladın, ol dutdu qulağ.

* * *

Ah kim yar degil, eylə ki, ana məni,
Xanı bildürməgə bir əhli-kərəm ana məni.

Belə kim, şövq odu canımda yanar şəm'sifət,
Əcəb ola bu gecə gər yetürə ana məni.

Getdi dil bir yana, can bir yanə mən səndən irağ,
Qalıbam, xanı əcəl kim, qıla bir yana məni.

Göz yaşımdan keçə bilmən üzüb, ey mürği-səhər,
Bu dənizdən keçürə gör, alub arxana məni.

Mən Hidayət kimi getmən eşigindən zahid,
Necə də'vət qılasan cənnəti-ə'lana məni.

* * *

Ta ki, geydin ey xəti reyhan qəbayi-süsəni,
Sünbili-zülfin utandırdı çəməndə süsəni.

Xansı dağın laləsisən, ey bənəfşə xətlü kim,
Sünbülün buyindən olur bağ içində susəni.

Gözlərim suyin görən lə'lin ğəmindən der mana,
Ğafil olma kim, aparur aqibət bu su səni.

Ey könül mətlubi, çün hər yerdə hazırsan mana,
Küfr ola bihudə girən istəmən hər su səni.

Gər busarsan bus, könül, meydani-eşq içində bul
Kim, yetürür aqibət məqsudə ol busu səni.

Dami-ğəmdən bulmadım bir dəm Hidayətin xilas,
Ta ki, gördüm hər nəzər, ey ənbərin keysusini.

* * *

Gəl ey içmiş bu gün ğəflət şərabı,
Salmış yüzin şurü şərabı.

Gəl iç dövlət meyin, məxmurini yaz,
Yetir ğəm dəftərin alub tez yaz.

İçən dövlət meyin, bir kim, oyandı,
Ğəm odunda xaçan dövlətlü yandı?

Burada görmüşəm dövlət yüzini
Nə bir kim, yüzə-yüz gördüm yüzini.

Demə aldanmazam düşmən sözinə,
Bu uca qəl'ədən düşmən süzinə.

Gəl içgil zövq ilən dövlət əyağı,
Bu dövlətdən bəri çəkmə əyağı.

Uyarsan qəl'ə içrə duş görərsən,
Səadət yuzini gəl duş görərsən.

Gəlicək bulmaz olsan dost kamı,
Əcəl yanımda içsün düstkami.

Ol gün ki, dövlətə şəm'i Hidayət,
Eşitsən sözüm, ey şəm' Hidayət.

* * *

Ta gördüm, ey sənəm ruxi-fərxəndə falını,
Can ilə söylərəm sifəti-xətü xalını.

Şol al yanağı görsədüb, aldın qərarü səbr,
Ey məkr iyəsi, kimsə sənin duymaz alını.

Gülşəndə danə bulmayacax quş həlak olur,
Bu vəch ilən nəzərdən iraq etmə xalını.

Sən av edəndə canü dil olur sana şəğal,
Cəhd eylə, qoyma özgələr ata şəğalını.

Bir gəz xəyal ilə səni qucum dedim, nola,
Başdan Hidayət itdi, gedər bu xəyalını.

* * *

Cana, ğəmdən axdı gözüm yaşı Nil tək,
Cismim belini istəyüb incəldi qıl tək.

Lə'li-ləbini sormadın, ey məhliqa bəkam,
Düşdüm xəlayiq ağzının içində dil tək.

Hər sürmə kim, degil ayağın tozu çeşmimə
Çəksəm görünür, ey büti-gülçöhrə mil tək.

Kafir olam götürməsəm imanı xalına,
Çün gördüm oldu nar ana gülşən Xəlil tək.

Hər necə natəvansa Hidayət misali-mur,
Yar firaqını çəkədir bari fil tək.

* * *

Ey dil, cahanda nəsnə bulunmaz nigar tək,
Cəhd et nigar əlin duta görgil nigar tək.

Qıldan qələm alub qılur əşkim mühərriri,
Təhriri-çöhrəmi vərəqi-zərnigar tək.

Qan yaş ilə rəqib yüzin eyləmək nigar
Asandır, eyləsün mana meyl ol nigar tək.

Dil xümrə kimi talibü anın xəyalının
Tən qəl'əsində məskəni mehri-nigar tək.

Aşiq Hidayət özinə bilür yuz ağlığı,
Boyansa qan ilən hər dəm nigar tək.

* * *

Səba, ol kuyə lütf edüb kədər qıl,
Nigarı hali-zarımdan xəbər qıl.

Degil kim, anıcax kirpiklərini,
Durar xəncər kimi cismimdə hər qıl.

Rəqibə öldürüm dedin özümni,
Xamu eybin ilə cəhd et bir hünər qıl.

Ləbin sor, çeşmü ağzın yad et, ey dil,
Mey iç, nöqlini badamu şəkər qıl.

Yağış tək gər səpər ol türki-navəkə,
Hidayət, verme yan, sinən sipər qıl.

* * *

Kimdə vardır bu qamət ilə qiyam,
Ana sanma qiyamət olsa qiyam.

Dedi hər dəm sana yüz ox dəgürəm,
Dedügi söz könülə dəgdi təmam.

Yüz çevirdin cahanı dutdu züllam,
Gün dolanğac, bəli olur axşam.

Dilü can ilə hicranuzda nə ğəm,
El ilə qara gün olur bayram.

Dün salam eyləgəc kəsərdim eydür,
Səni gər olmasaydı həqqi-salam.

Yüzini görgəc aldı ağzı könül
Gər yox edürsə, var aradə kəlam.

Çünki duydun Hidayətin halın,
Sözlərindən nə hacəti-peyğam.

* * *

Bir sərvi-simintən k'anın canu dil ilən yarıyam,
Xani-visalından anın fikrim budur kim, yarıyam.

Başım kəsüb, yarəb, nola çəksə məlamət darına,
Ta təlqi-aləm bilə kim, eşq əhlinin sərdarıyam.

Könlüm anınçün bəslərəm, ansız dirilmən, neyləyim,
Ol gərçi canımdır mənim, mən həm anın dildarıyam.

Şəhla gözi saruların derlər sorar, yarəb nədən,
Sormaz mən məhcuri kim, çoxdan anın bimarıyam.

Vəslindən ayru şol məhin, daim yerəm hicranda ğəm,
Amma Hidayət bilməz ol kim, mən anın ğəmxarıyam.

* * *

Ey can nədimi, sorma məni kim, nə dəmdəyəm,
Həmdəmi-ğəm oldu könlümə sənsiz nə dəmdəyəm.

Hər gündə qanlu yaşıma ğərqəm bu didədən,
Gəl gör ki, səndən ayru nə gündə, nə dəmdəyəm.

Gözdən irağə salma məni abi-didə tək,
Ey sərvi-qəd ki, xancəru varsan qədəmdəyəm.

Gahi-vücud tərkin edərmən yüzün görüb,
Gah ol ağır xəyalilə sağın ədəmdəyəm.

Dün öldürəm dedin, ğəmumi kim ki yer nədən
Öldürmədin Hidayəti, mən həm bu ğəmdəyəm.

* * *

Vəsl içün can istər olsan, sanma tə'sir eyləyim,
Kafirəm, gər mən bu xeyr işinə tə'xir eyləyim.

Şol kəmanəbru qılan bu bağrı yanmış canıma,
Bulmazam hər kimsənə kim, ana təqrir eyləyim.

Tiğ ilən canu dilin qıldımsa hər birin iki,
İmdi oxumlan eydür hər ikisin bir eyləyim.

Özinə hər kim oxun tədbir edər, ya xəncərin,
Ah kim, mən qalmışam, bilmən nə tədbir eyləyim.

Gördi aşüftə Hidayəti, burub zülfin, dedi
Umma, ey Məcnun, səninçün fikri-zəncir eyləyim.

* * *

Cana, sana şikayəti-hicran nə söyləyim
Çün yoxdur ol hekayətə bəyan, nə söyləyim.

Səndən irağ çəkdügimi dərdü ğüssədən,
Sən həm bilürsən, ey şəhi-xuban, nə söyləyim.

Dingəc ğəmindən ağzıma çaldın ki, söyləmə,
Şimdən gerü nə deyim, ey can, nə söyləyim.

Xalü xətin rümuzi demən şeyxü sufiyə,
Hər div içün həqiqəti-Qur’an nə söyləyim.

Söylə dedin Hidayətə heyran, nə vəchə sən,
Ey canü dil, camalına heyran, nə söyləyim.

* * *

Mən nə yalğuz eşq içində abi-rəvan əl yudum,
Getdi dinü dil səni görgəc xamudan əl yudum.

Cənnətü cuyi huri-eyn könlümdə var idi yüzün,
Ta yüzin gördüm, şəha, ol cənnətü cudan əl yudum.

Zülfinə bağlanmadın, ömrüm uslana könül,
Ta kim, ol zəncirə düşdi, ol dəlüdən əl yudum.

Ləbləri yanında ögmən abi-heyvani ki, mən
Bu suyi ta ağzıma aldım, o sudan əl yudum.

Göz yaşı günini din bir həddilə almışdı kim,
Dışra çün basdım ayağ, evdən, qapudan əl yudum.

Arzum idi Hidayət qan yaş ilən əl yumaq,
Hasil oldu kami-dil ol arzudan əl yudum.

* * *

İrişdi yazü çiçək, dutdu bağü zağ ətəgin,
Təvaf içün çaldı şükufə ağ ətəgin.

Qonağ oldu gülü ğönçə bustanda yenə,
Nəsim altun ilə doldurur qonağ ətəgin.

Əcəbli qoymasa əldən gül ətəgin bülbül,
Qoyarmı dilbərinin əhl olan bu cağ ətəgin.

Sağınma, lalə dürür, ya şəqayiq, ey gülçöhrə,
Ğəmində qanlu yaşımdır ki, dutdu dağ ətəgin.

Hidayət, eylə canü könülini yaz parə,
Əlindən etsə fələk yarının irağ ətəgin.

* * *

Nədən bağlu ol şux dilbənd ağzın,
Nə artuğ dedim ki, qılur bənd ağzın.

Günəşdə olur zərrə, amma bulunmaz,
Yüzündə gözətdükcə hərçənd ağzın.

Gedərkən dil ol kakili saru dün-gün,
Xəbər qıldı lə'li-şəkərxənd ağzın.

Qara xal şol iki qaş arasında,
Siyəhpuş tək aldı dərbənd ağzın.

Hidayət, bu bir şe'r ilən bənd qıldın,
Xorasanü əhli-Səmərqənd ağzın.

* * *

Mübarək olsun, ey sultani-aləm fəsli-novruzun,
Müsa'id gecədən keçən müvafiq ruzun uzun.

Həmişə bürci-dövlətdən tülu' mahi-iqbalın,
Müdami övci-himmətdən zühuri sə'd yulduzun.

Nə gecəm gecədir şaha, nə ruzum ruz, həq bilür,
Gözümdən ta irağ oldu camali-aləməfruzun.

Gedüpdür canü dil, yanar ğəminlə, kimsə bilməz kim,
Nədir sirri bu canbazın, nədir halı bu dilsuzun.

Bir hicr oduna yaxmın Hidayəti, şəha şimdi,
Visalın şəhrini yayın firaq iqlimni nov ruzun.

* * *

Dedim: olmağa ayağında könül həsrəti var,
Dedi: gər ona nəsib olur isə dövləti var.

Dedim: öldürürdi yüküşün meyi-lə'lin qədəhi,
Dedi: qayırma sana dəxi bir az şərbəti var.

Mən demən ləzzəti var sandilən hər yigitin
Ki, hədis oxumuşam hər yigitin ləzzəti var.

Varmazam uçmağa kuyindən anın get zahid,
Damuya nişə vara kim ki, anın cənnəti var.

Çox gəmirdi sümük itinlə Hidayət, ani
Xaçan unuda ki, bu bəndədə həqq ne'məti var.

* * *

Səndən həmişə canıma dərdü bəla yetər,
Biganəlik həmin ola ey aşina, yetər.

Şimdi ki, vəslə vasiləm öldürə gər məni.
Hicrində bilürəm sun ki, işim buna yetər.

Tarac qəmzədən yetürür rahətə nişan,
Canə, peya-peya oxların ey şux büta yetər.

Hər ildə bir söyüş deyər minnətin var anca kim,
Yetməz ol dəxi məni-miskinə ya yetər.

Digəc Hidayətin sözi yetmək durur sana,
Dinmün deyər ki, sözləri ayıtın mana yetər.

* * *

Dedim: ey gün, yüzini görsət gözümdən nəm gedər,
Dedi: gər sənin yüzin seyl axıdarsa nəm gedər.

Gözlərimdən ayü il dəm getdügi andan durur
Kim, bu ömür arxanılmaz bir dəm ikən il dəm gedər.

Buyi-zülfi can dimağından gedib gəldisə ğəm,
Ğəm yemə ey dil necə bu gemdisə ol həm gedər.

Oxu getgəc yürəgimdən dərdim artar sor nədən,
Yüz urar sağalmağa çün yarədən mərhəm gedər.

Könlümə düşgəc ləbi əksi nədən göz yaş tökər,
Dəm gəlür bildim Hidayət, göz yolundan dəm gedir.

* * *

Ey ki, gündüzdür yanağın zülfi-mişkin gecələr,
Gəl ki, uymadı fəraqından bu miskin gecələr.

Arizində iki yandan həlqələndi zülfiniz,
Bir güni aldı araya, ey büti-Çin gecələr.

Bulma kəc ağzını yüzünlə varur şol zülfə dil,
Gündüz ilən çün ani bulmaz bu qəmgin gecələr.

Var könül zülfinə saru yüri ənvar ilə kim,
Xoşdur uzax yolları varmaq ey aydın gecələr.

Vəsl balın dadmaq içün hicr ağusın çəküb,
Çox bəla daşın Hidayət, qıldı balın gecələr.

* * *

Gəldi novruz, yenə gülşənü səhra dəmidir,
Yari-gülçöhrə ilən eyşü tamaşa dəmidir.

Çox siyam ayı deyüb üzr götürmə arayə
Saqiya, badə gətür kim, güli-həmra dəmidir.

Qaşın görsədübən qıl nəzər əhvalıma kim,
Sərvi-rə’na çağıvü nərgisi-şəhla dəmidir.

Böylə mövsümdə mən ol yardən diriyəm,
Ey əcəl, gəl bərü kim, şimdi təğaza dəmidir.

Qıl təvəkkül həqqə, varını yolunda tərk et,
Ey Hidayət ki, təvəllavü təbra dəmidir.

## ŞEYX İBRAHİM GÜLŞƏNİ

*Şeyx İbrahim bin Məhəmməd bin Şəhabəddin Gülşəni XV əsrin tanınmış şairlərindən biridir. 1427-ci ildə Bərdədə doğulmuş, hələ uşaq yaşlarından öz istedadı ilə başqa yoldaşlarından fərqlənmişdir. Gənc ikən Bərdədən Təbrizə gəlmiş, burada Dədə Rövşəninin tələbəsi olmuşdur. "Xəlvətiyyə" sufi təriqətinin görkəmli nümayəndələrindən olan Rövşəni sonralar bu təriqətin "Rövşəniyyə" qolunu yaratmışdır. Yüz ildən artıq ömr sürmüş şair 1533-cü ildə Misirdə vəfat etmişdir. Gülşəninin yaradıcılığı azərbaycanca, farsca, ərəbcə yazdığı divanlardan. "Məsnəviyi-xəfi" və "Raznamə" məsnəvilərindən ibarətdir.*

### QƏZƏLLƏR

Eşqə könül verməyən canını qıymaz bana,
Bənligini tərk edüp eşq ilə gəlməz bana.

Eşqi murad edübən tərki-murad etməyən,
Olubəni namurad eşq ilə uymaz bana.

Eşq ilə Məcnun olan əql ilə divanəvəş,
Olubəni münkirim qal ilə gəlməz bana.

Diri ikən ölüymüş, istəyübən bulmazam,
Çünki diri olmuyan eşq ilə duymaz bana.

Cani-cəhandan keçüp istəməyən eşq ərin,
Dirlik içün eşq ilə canını verməz bana.

Bir nəfəs yüz belə can verübəni almıyan
Diləsəm ondan bəha eşq ilə saymaz bana.

Eşq oduna yanmayan Gülşənidir sananuz,
Rövşəninin yürəgi mehr ilə yanmaz bana.

* * *

İstəyüp dərdinə eşqin bulmazam andan dəva,
Nə qədərdür yaşuma çün bilməzəm andan qəza.

Bir nəfəsdə yüz bəlasin çəkmədin eşqin nedim?
Çün usanmaz könlüm andən çəkübən yüz bin bəla.

Gün kimi yüzüm sürübən hər qapudan istərəm,
Sevdügimin izi-tozun gözimə kəhli-cila.

Alalı könlümi verməz bir pəripeykər nedim?
Çün könül nedə, dilər kim canımı daxı ala.

Nasehim tərki-həva deyübəni ögüb verər,
Bilməzəm tərkündən alun nədür anunçun həva.

Girəli medani-eşqə başumu top etmişəm,
Kim çalub çövkan dilər ardına düşüp qova.

Rövşəni pərvərdəsidir Gülşəni anun içün,
Gün kimi rövşən görünür aləmə andan ziya.

* * *

Əcəb yüzin görən necə qılar tab,
Çu andan bibədəl olur şeyxlə şab.

Əcəb nərgislərin uyur oyanux,
Görənün gözünə necə girər xab.

Əcəb durci-göhər kimi dəhandan
Düşünmidür görünən madəri-tab.

Əcəb ay kimi alınundan münəvvər,
Cəhanda varmıdur bir taqi-mehrab.

Əcəbmi təşnəliqdən can verərsə,
Görənlər ləblərüni lə'li-sirab.

Əcəbmi, ey pəri, yüzin görəndə
Günəş sararuban, qararə möhtab.

Əcəbmi gözlərümdən yaş yerinə
Axudam həsrətündən seyli-sürxab.

Əcəbmi Gülşəninün Rövşəniçün
İnildü zarisin manəndi-dulab.

* * *

Ağlamaqdan gülməz imiş şad olub bir dəm qərib,
Fikri-zikri olubanu dərd ilə ney dəm qərib.

Vay əgər həsrətlə verəm canımı axır nəfəs,
Görmədən sevdüklərimi dünyadan gedəm qərib.

Vay əgər həsrətlə verəm canımı axır nəfəs,
Görmədən sevdüklərimi dünyadan gedəm qərib.

Sevnişür xəlqi cahanun ay görüb bayram içün
Yaslu kimi qayğuludur movt ilə ol dəm qərib.

Dönübən sahib əzayə ün çökübən dərd ilə
Gözlərindən axıdırmış yaş yerinə dəm qərib.

Ya ilahi, Rövşənidən ayru zari-hüzn ilə
Gülşəni kimi cahanda olmasun adəm qərib.

* * *

Bəni hər dəmdə nedim öldürür eşq,
Qara yerə dirilmə girdürür eşq.

Qılup rüsvavü məlamət rindü bədnam
Cəhan xəlqini bana güldürür eşq.

Nedim Məcnun kibi xəlqi cəhanun
Yerub sevmədügini sevdürür eşq.

Girüb bazari-hüsnə sevduginə
Bəha can ver, deyübən öldürür eşq.

Olub məst, xiyalun unuduram,
Özüm xafi önümə düşürür eşq.

Nə sevdadır başumda püxtəvü xam
Ki, mehr ilə dəmadəm pişirür eşq.

Qiyamətdür məgər bu səpvqamət
Ki, həşrin xəlqün ana düşürür eşq.

Cəhan qovğasın aşiq başına
Aru kimi yığuban düşürür eşq.

Demin rüsvavü rində, saxla canun
Qaçan gizləyüb ani yaşurur eşq.

Gözüm dəryasının rövşən suyunu
Bulandırub rəvandan aşurur eşq.

Bana der Gülşəni kim Rövşəninün
Xiyalundan bilumi şaşurur eşq.

* * *

Bilməzəm kim, nə bəladur başıma sevdayi-eşq,
Karturub əksilməz başımdan dəmbədəm qovğayi-eşq.

Çıxalı sevdası eşqün başıma zikrim budur
Çün çəküp zarlığilən vay eşq, ey vay eşq.

Görmədim Məcnun bixud-valehü aşüftə hal
Olduğun buncılayın bir daxi şeydayi-eşq.

İstəyüb dərdinə dərman kim bilür eşqün dilün
Çünki ol dərdə dəva bulunmaz illah vay eşq.

Çəkmədi eşqün bəlasın mübtəla olub demək
Ola hər nadani-bixəs arifü danayi-eşq.

Rövşəninün eşqi ilə, Gülşəni, degil bana
Kim olupdur sənciləyin bir daha rüsvayi-eşq.

* * *

Nə bəladür bilməzəm kim, eşq olupdur ana ad
Eşidün anun kimi bidad əlindən dadü ad.

Kimə varub dad edim, den kolə birsə ğourimə,
Çünki ana hökm edəməz dad içün şəddadi-ad.

Sevübənü lütf umana qəhr edər düşmən kibi
Namurad olsun deyüp istəyənə bəndən murad.

Nerə varsam eşq əlindən yoxsulu bay
Dərtlüdür, guya ki, ondan ayrı gün şəhrü bəlad.

Eşq həmvar olanı əql ilə dayib-xərab
Eşq imiş sərsər kim ondan halın oldi qövmi-ad.

Eşq əlindən ağlıyub gülməz degin bər bidili
Der həm ondandur ğəm ilə bulmıyan könlə güşad.

Rövşəni eşqə bəla der, leyk nedim Gülşəni,
Ol bəlasız edəməzəm vərhəm ikən könlini şad.

* * *

Nədür keyfiyyətin eşqün bilmək olmaz,
Çu keyf ilə yüzini görmək olmaz.

Görən bikeyf ikən keyfi eşqün,
Nədür keyfini anun söyləmək olmaz.

Yoğ ikən var olan bilür nədür eşq,
Nedim kim yoği var eyləmək olmaz.

Dilün dil diləsən eşqün təriqin,
O yolə dilmədən dil girmək olmaz.

Ölə gər eşq ilə olmazdən öndin,
Demə olmadən öndin ölmək olmaz.

Görək eşqün yolinə xeyri təmkin
Ki, ol yol talibinə irmək olmaz.

Nedim, ey Gülşəni, Aydın elinə
Ziyayi-Rövşənisiz girmək olmaz.

* * *

Bana canü cəhan sənsiz gərəkməz,
Behişti-cavidan sənsiz gərəkməz.

İki aləmdə sənsən istədigim,
Anunçün inü an sənsiz gərəkməz.

Nəyə baxsam yüzin görmək dilərəm,
Nihanü həm əyan sənsiz gərəkməz.

Nədür vəchündən özgə zahir, ey məh,
K'anı deyim rəvan sənsiz gərəkməz.

Tənümdə cani-şirin təlx olan dəm,
Derəm zövqi-rəvan sənsiz gərəkməz.

Eşitdim Gülşəni der Rövşəniyə,
Bana dildən bəyan sənsiz gərəkməz.

* * *

Bana dərdün gərək, dərman gərəkməz
Tənümdə səndən özgə can gərəkməz.

Könül Misrində Yusifdən əzizim,
Sənün sevgün gərək, sultan gərəkməz.

Səni bilmək yetər aləmdə bana,
Cahanda sənsizün ürfan gərəkməz.

Gözümün qanlu yaşi həsrətündən
Axan, höccət yetər, bürhan gərəkməz.

Rəqibi sür yanundan, ey pərixu,
Mələk yanında çün şeytan gərəkməz.

Görən mehr ilə, ey məh, nərgisün der
Gözüm ana nədən heyran gərəkməz.

Könüldə Rövşəni derdün özünə,
Sana, ey Gülşəni, dərman gərəkməz.

* * *

Gülüstan car olupdur bana sənsiz,
Genişlik dar olupdur bana sənsiz.

Çıxub sevdası eşqünün başuma,
Xəyalun yar olupdur bana sənsiz.

Fəraqun zikri söylənmək dilümdən,
İnildü zar olupdur bana sənsiz.

Cahanda bir nəfəs, ey dilbəri-şux,
Dirilmək ar olupdur bana sənsiz.

Fəraqun zövqidir ağudən acı
Ki, zəhri-mar olupdur bana sənsiz.

Yanuram həsrətündən geci-gündüz
Çü hicran nar olupdur bana sənsiz.

Dəmadəm Gülşəni der Rövşəniyə
Rəqibim yar olupdur bana sənsiz.

* * *

Gəl, ey Misri-dilim sultanı cahanda,
Əzizi canımın cananı dilbər.

Günəş kimi nəzirün yox cahanda,
Mələksima, gözəllər canı, dilbər.

Cahan xuğlarının təndə rəvanı
Bilindi səndən imiş canı, dilbər.

Məazallah ki, edəm səndən özgə
Dəvasız dərdimə dərmanı, dilbər.

Yanubən həsrətindən axıduram
Gözümdən yaş yerinə qanı, dilbər.

Dilərdim sanıyım hüsnün hesabın,
Hesabsız gördüm anda sanı, dilbər.

Cahanda Rövşənidən özgə degil
Bana, ey Gülşəni, sən xanı, dilbər.

* * *

Eşqün bana, ey şux, belə gör nələr eylər,
Sedayi-sifət, əqlüm alub bixəbər eylər.

Dəlürübəni dağa necə düşməsün, ey can,
Çün əqli gedər hər ki sana bir nəzər eylər.

Bir deyəməzəm bən dilün, ey dilbəri-məhru,
Kuyində görər bəbkini hər kim güzər eylər.

Eşqün yoluna necə qədəm qoya olar kim,
Şərbətüni canunə başdan həzər eylər.

Gün gördigiçün yüzini hər sübhidəm, ey dust,
Başun ayağə salubəni dərbədər eylər.

Eşqinə könül verəlüdən sanadum, ey dust,
Ğeyrün eşidüb görməsini kuri-kər eylər.

Eybin görəməz sevdüginin aşiqi-bidil,
Çün eybi anun gözinə sevgü hünər eylər.

Zövq edənə şövq ilə ğəmündən necə deyim,
Könlüni anun həqq ilə ğəmün gedər eylər.

Gün kimi yüzün Rövşənidən, Gülşəni, görən,
Ay kimi cəhan xəlqinə nuri-bəsər eylər.

* * *

Dəmbədəm sevdası eşqün əqlimi başdan qapar,
Dönübən Məcnuna andan oluram bən bixəbər.

Dəlü kimi daşa dönər oğlan-usəx göricək
Valehü şeyda bəni aşüftə, heyran, rəhgüzər.

Soraram sərgəştə bəndəm kim, nə gördüm deməzəm,
Cizginən dövrandan özgə gecə-gündüz sərbəsər.

Eşq ilə rüsva məlamət olalı canım görən
Tən' edüp der kim, məlamət görmədin bundan betər.

Dəlü, uslu olduğumu bilməzəm heyrət budur,
Dəlu kimi uslu halum necə fərq edüb seçər.

İtürən eşqün məqamın qapu-qapu gəzübən,
Gün kimi yerün yüzinə baş qoyuban dərbədər.

Bir sor axı Rövşəniyə, Gülşəni, nə mə'nidən
Gəlmədün der, gəlür olsam, dönübən sürər, qovar.

* * *

Dəmbədəm çün gözlərimdən qanlu yaş qəltan düşər,
Qətrə-qətrə san sədəfdən dürr ilə mərcan düşər.

Qönçəvəş qanım yürəkdən açılan dəmdə degil,
Baş urub gözdən yüz üzrə necə sərgərdan düşər.

Gülməyincə bəllü olmaz gül sifət yüzdən dəhan
Çün sədəfdən dolu anda dürri-can rəxşan düşər.

Gülşənara seyr edərkən, ey güləndamım, gözün
Bənzədübən gül yüzünə özünü xəndan düşər.

Salayum dedim canımdan ğeyrət edüp sevgüni,
Bən nihan etsəm könüldən suz ilə giryan düşər.

Görəli doğru əlindən qəddini nunü qələm
İstiqamətdən dönüb beş hərfi kəc kərdan düşər.

Əhd edüp, peymanuni çün sındurar, ey rəqib,
Eyləsəm misaq ötkülə əhdara peyman düşər.

Həsr-həsri örtürürən guya hüsnün gülini
Kim içüp abni həyatun vərdinə reyhan düşər.

Cəzb edəli mehrün ilən həlqeyi-zülfün vəli,
Tup dutub bisəpü pa zülfi ana çövkan düşər.

Mehrdə görüb cəmalun nedim, ey məhru, degil
Çahi-Yusif kimi canə ğəbğəbun zindan düşər.

Rövşənidən Gülşəniyə əmr imiş sevgilu can
Anın içün dildə mehri dəmbədəm fərman düşər.

* * *

Eşqə könül verməyən can ilə aşiqmidir?
Kizblə hər müddəi dəvisi sadiqmidir?

Eşqə könül vermiyən, sevgilü can almıyan,
Yoxluq ilə gəlmiyən, varlığa layiqmidir?

Eşqi səlah edübən, zəhrü fəlah etmiyən,
Talehi tərk edübən salehə layiqmidir?

Eşq ilə me'racuni qılmiyana, ey səni,
Derəm eşitgil bunu lahəqqə sabiqmidir?

Eşq ilə sayruluğun bilmiyənə sağlığun
Soraram etsün mübin teyb ilə haziqmidir?

Müşkülümü sürərəm, sanma düşəm, yürərəm.
Əbdi-həvaçun derəm, bəndəyə xaliqmidir?

Rövşəninin, Gülşəni, eşqinə can vermiyən
Leyliyə Məcnun olub, Əzrayə Vamiqmidir?

* * *

Ey könül, eşqün bəni divanə qıldı aqibət
Bilgümi əql əhlinə əfsanə qıldı aqibət.

Düşürüb dağlara aşinalardan bəni,
Dəlü kimi xəlq ilən biganə qıldı aqibət.

Yıxdı çün könlümi eşqün saxlamağa gəncüni
Əjdahanın yatağın viranə qıldı aqibət.

Qətreyi-insan kimi bu bəhri-canım dürri-saf,
Ha sədəfdən göz görə dürdanə qaldı aqibət.

Qara geyüp gözlərim məndən betər gör, ey sənəm,
Qaşlarun mehrabını bütxanə qıldı aqibət.

Susayuban ləbləründən tutuşub yanar cigər,
Qanımğa ondan ləbün peymanə qıldı aqibət.

Yüz çevirmə Gülşənidən, ey könül, hər vəch ilə
Can verübən çün səni cananə qıldı aqibət.

* * *

Qiyamət gər dilbərsən, ey sərvqamət,
Rəvan ol kim qopa xəlqə qiyamət.

Görənlər fitnədən qaş ilə gözün
Bilür nədür qiyamətdən əlamət.

Bu gündə görmiyən vəchüni danlı,
Çökür fövtü fərasətdən nədamət.

Nədür vəchündən özgə, ey pərixu,
Görünə bir nəzər eyni-kəramət.

Səkiz cənnət kimi görən cəmalun,
Nə yüzdəndür bilür cənnət təmamət.

Nədür kuyindən özgə bilməzəm
Məqami-ümmətlə dari-səlamət.

Çilədin Rövşənidən əhli-eşqə
Dəgübdür Gülşəninə çün imamət.

* * *

Nədür eşqündən özgə canım, ey dust,
Odur can ilə çün cananım, ey dust.

Könül Misrində Yusifdən əzizim
Sənün sevgün imiş sultanım, ey dust.

Saçun küfrün görən iman yüzündən
Bilür ol küfr ilə imanım, ey dust.

Qiyamət vəchün imiş zahir oldu
Günəşdən aləmə bürhanım, ey dust.

Bu gün yüzün görüb, danla deməzəm
Çü danladur bu gün durağum, ey dust.

Xəlayiq həşrin istər nəşr içində
Qiyamətdən görəməz şanım, ey dust.

Dəvasuz dərdün içün Gülşəni der
Nədür can, vermədün dərmanım, ey düst.

* * *

Necə kim ğəmdən dilərəm könlümi qılmax fərəh
Diləməz der məmləkətdən istəyüp bulmax fərəh.

Dilərəm hümmətlə ğəmdən qurtaram canım, nedim?
Qayğulu könlüm əlindən diləməz olmax fərəh.

Girübən bazari-eşqə dəmbədəm der həm könül
Verübən nəqdini qəmdən diləməz almax fərəh.

Ağladuğum görübəni şad olub gülənə sor
Ki, nə hülqətündür ana cəhl ilə qılmax fərəh.

Həmm-ğəmdür istədügi könlümün eyşü nişat
Der anunçun gərəkməz könlümə salmax fərəh.

Rövşəninün ğəmiyimiş Gülşənini şad edən,
Ondan özgə diləməz çün könlünə bulmax fərəh.

* * *

Eşq elinə getməgə dur könül, eylə bir ax,
Həmdəm olup deməgil yolu yaxındır, irax.

Dur yola düş gedəlüm, yoxluğu zar edəlüm,
Varluğum nedəlüm sən bəni tərk et, burax.

Mavü mənidən qaçub, bənlik olandan keçüb,
Eşq ilə gözün açub, istədügin yüzə bax.

Şövq eliyü qıl məqam, əqlə uyub qurma dam,
Ta ki, xəyalundan müdam urmiyə boynuna fax.

Tərki-həvayi-həvəs əldə ikən dəstrəs.
Yə'ni verüp son nəfəs demiyəsən ahi-vax.

Diri ikən ölə gör, axırı tən böylə gör,
İstəgüni bula gör, saxlamayüp həlqə çax.

Rövşəninün şəm'inə dutuşuban, Gülşəni,
Eşq ilə pərvanəvəş ancaq özin oda yax.

# KİŞVƏRİ

*Nemətulla Kişvəri XV əsrin ortalarında Azərbaycanın Deyləmqan şəhərində (Cənubi Azərbaycanın indiki Salmas şəhərində) doğulmuşdur. 1490-cı ilə qədər, yəni Ağqoyunlu Sultan Yəqubun hakimiyyəti dövründə sarayda yaşamış, sultan öldürüldükdən sonra oradan uzaqlaşdırılmışdır.*

*Təbriz ədəbi mühitində tərbiyələnmiş, sonralar saray, divan şerinin qaydalarına riayət etmək məcburiyyətində qalmış, öz imtedadı sayəsində həmkarlarından seçilən, mədhiyyəçiliyə alışa bilməyən, ona həsəd aparan şairlərin təhqirinə dözməyən Kişvəri sarayı tərk edib, Əlişir Nəvaiyə pənah aparır.*

*Kişvəri Azərbaycan və fars dillərində "Divan" yaratmış, əsasən lirik qəzəllər yazmış, ülvi məhəbbəti tərənnüm etmiş, təriqət görüşlərindən azad, sərbəst yaradıcılıq yolu keçmişdir. Forma rəngarəngliyi, bədii ifadə vasitələrindən istifadə bacarığı, ana dilinin ən zərif incəliklərinə bələdolma qabiliyyəti ilə seçilən Kişvəri, bədii sənətkarlıq baxımından sanballı əsərlər yaradaraq həm müasirlərinin (Həbibi, xüsusilə böyük özbək şairi Əlişir Nəvainin), həm də sonrakı dövr şairlərinin nəzərini özünə cəlb etmişdir.*

## QƏZƏLLƏR

Səndən ayru yüz ğəmü dərdü məlamətdür mana,
Nə xoşam, nə naxoşam, bilməm nə halətdür mana.

Hicrümə qatlan deyincə, tiği çək öldür məni,
Həq rizasiçün ki, bu eyni-ədalətdür mana.

Mülki-həsti içrə nə hasil mana bazari-gərm,
İmdi kim, kuhi-ə'dəm sarı həvalətdür mana.

Eşqdən keç der mana idraksız zahid, vəli
Bilməz anı kim, bu bir eybi-cəhalətdür mana.

Yar göndərmiş bitik kim, Kişvərini öldürün,
Xoşdiləm kim, bir nişani-istimalətdür mana.

* * *

Ey pəriləb, demə həq bir parə can vermiş sana,
Çeşmeyi-heyvan deyib, şəkli-dəhan vermiş sana.

Karigahi-afəriniş içrə guya dəsti-sün',
Rişteyi-can birlə peyvəndi-miyan vermiş sana.

Qıldı qurban kirpigün navəklərilən könlümü,
Ol ki, çatma qaşidən iki kəman vermiş sana.

Arizin bağı su içrə çeşmeyi-xurşiddən
Demə a'riz kim, behişti-cavidan vermiş sana.

Ol kim axıtdı gözindən ərğəvani yaşlar,
Türreyi-şümşadü rəngi-ərğəvan vermiş sana.

Kişvərini qılma növmid, ey gözəllər şahi kim,
Çoxdan ol biçarə ümmid ilə can vermiş sana.

* * *

Alma cana canımı kim, can ilən yarəm sana,
Bivəfalıq qılma kim yari-vəfadarəm sana.

Yusifin gərçi xiridarı çox irür hüsn ilə,
Nəqdi-can birlə məni-bidil xiridarəm sana.

Keçdi ömrüm naləvü zari bilə səndən iraq,
Qıl tərəhhüm bir nəzər kim, aşiqi-zarəm sana.

Qismətimənduhü ğəm boldisə səndən yox əcəb,
Mən çü qismət günündən bərlü giriftarəm sana.

Demə kim yox Kişvərinin könlidə mehrim mənim,
Mehribanəm həq bilür can birlə ta varəm sana.

* * *

Köksümi qalxan qılıb mən oxlarun qarşusuna,
Gər inanmırsan bir oq atgil mana qarşu sına.

Ğəmzə oxu qaşların yayindən, ey əbru kəman,
Sən atarsan canəvü könlüm dutar qarşu sinə.

Ey könül, gər aşiq isən nam ilə namusi qoy,
Kim ki, aşiqdür anun nami nəvü namusi nə.

Qıldı dövri-ruzigarimni qara Qismət güni,
Sürmeyi-nazi ol çəkdi nərgisi-cadusinə.

Kişvərinün sözidür incü, anı sındurmagil
Kim, bəhasindən düşər, çün daneyi-incu sına.

* * *

Qəriblik ixtiyar etməz kimin ki, yarı yar olsa,
Dirilməz yarsız bir dəm kişi gər ixtiyar olsa.

Bu dirlikdən mana yegdür eşigində xuda bilür,
Ləkədkubi-cəfa birlə təni-zarim ğubar olsa.

Sənünlə ol məhəbbət kim, mənüm könlümdə ca qıldı,
Anı aşkarə qılmazmən qiyamət aşikar olsa.

Rəqiblər cövhərini çəkmək mana asandurur, amma,
Əgər sən yari-canidən könül ümmidvar olsa.

Yolunda oynadur, qələndər Kişvəri başın,
Əgər qövlün ola qövlü qərarun bərqərar olsa.

* * *

Vay kim, olmaz mana ol lə’li-ruhəfza nəsib,
Ləblərin şərbətindən binəsibəm, ya nəsib.

Sancılur kirpikləri könlümə sorsam lə’lini,
Bolmadı vəh kim, mana bir xarsız xurma nəsib.

Gülşəni ruyunğa, ey huri, rəqib niçün girir,
Kafirə çün bolmaz irür cənnətül-mava nəsib.

Artuğ-əksük boldular səndən nəsib əhli-vəfa,
Bolmuşam rusvaylığ səndən mənə rusva nəsib.

Guşəşi-bifayidə niçündürür, ey Kişvəri,
Bişü kəm çün hiç kimə bolmaz nəsib, illa nəsib.

* * *

Düşmişəm bir halə sənsiz natəvanü zar olub
Kim, əcəl yanımdan ayrılmaz mana qəmxar olub.

Həsrəta, dərda, diriğa kim, bu bəxti-tirədən,
Qalmışam mən yarsız, yar özgələrlən yar olub.

Bilməzəm kim, neylədim bu qan olası könlümə
Kim, qaçar hər yan məni-biçarədən bizar olub.

Qəddi yüzündən irağ baği-behişti neylərəm,
Sərvü gül hər biri ayru, gözlərimdə xar olub.

Surətin ta gördü cana. xəstəxatir Kişvəri,
Baxa qalmış eşigində surəti-divar olub.

* * *

Xəstə canım çəkdi ah, ol nərgisi fəttan görüb,
Avçı tək kim ox çıxarub səlbdən ceyran görüb.

Həlqəyi-zülfini görgəc könlümün əfğanıdur,
Tiflyanlığ kim, çığırğay nagəhan yilan görüb.

Gözlərim qanın görüb qaçdı qara yüzlü rəqib,
Yoxlurur cana, əcəb gər qaçsa hindu qan görüb.

Ləblərin öpgəc əlimdən getdi ol zülfi-siyah,
Birəhmən kufrin unutdu ləzzəti-iman görüb.

Kişvəri qaçmaz ğəmindən necə kim, var canı kim,
Yüz çevirməz ləşgəri sultanidən ehsan görüb.

* * *

Ah kim, köksümni sənsiz çak-çak etdi fəraq,
Natəvan könlümni qəmdən natəvan etdi fəraq.

Bəzmi vəslindən məni məhrum qıldı ruzigar,
Kuyi-hicrində təni-zarimni çak etdi fəraq.

Gözlərüm xunabəsi birlə kim axar dəmbədəm,
Lövhi-həstidin vücudun nəqşi pak etdi fəraq.

Nuşi can bolsun sizə cami-visal, ey dustlar,
Kim, məni-sərgəştəni bari həlak etdi fəraq.

Kimi yoxdur, kimi var der Kişvəriyi-xəstəni,
Şükr kim, gəldivü rəf' – iştikak etdi fəraq.

* * *

Ey könül, dünya evində istəmə abadlıq
Kim, anun bünyadıdur əslində bibünyadlıq.

Meyvə olan nəxlini səng həvadis sındurur,
Vəh nə xoşdurur səmənbər sərvilə azadlıq.

Xublar bidadı bəs üşşaq içün sən ey fələk,
Tiği-bidadi çəkib munca nədür bidadlıq.

Aşina yad oldu məndən, dust düşmən aşibət,
Vəh kim, ol naaşina həddən aşurdı yadlıq.

Ta riza verdi qəzayə Kişvəri bil kim, ona,
Şadiliq naşadliq naşadliqdur şadilıq.

* * *

Necə ey xodkam, hicründə mana bədnamlıq,
Sən vəfasız dusti sevməkdə, düşmən kamlıq.

Gər səninçün, ey pəri, bədnam olubmən ğəm dəgül,
Aşiqəm nami-nikudən yeg mana bədnamlıq.

Sənsizin boldi mana kuyi-ədəm aramgah,
Necə çəksün bir kişi peyvəstə biaramlıq.

Zahida, mən’ etməgil görsən məni məstü xərab
Kim, mana sübhi-əzəldən gəldi dərd aşamlıq.

Cami əldən qoyma kim, mə’lum imas əncami-kar,
Haliya, xoşvəqtdür məstivü ib-aramlıq.

Bitmədi baği-cahanda sən təki bir şax gül,
Sərv boylu, ğönçə ləb, bərgi-səmən əndamlıq.

Gəldi əyyami-şərif, ey məh, zəkati-hüsn içün,
Kişvəri xəstəyə bir busə ver bayramlıq.

* * *

Can əgər getdisə sən sağ ol, mana candan nə ğəm,
Sübh vəsl ümmidi bolsa, şami-hicrandan nə ğəm.

Gər qılursa tiri-baran kim, yolundan dönməzəm,
Kə’bənün müştaqinə xari-müğilandan nə ğəm.

Eşqi kamil aşiqə rüsvalığından dərdi yox,
Nuh ilə həmxanə bolsan mövci-tufandan nə ğəm.

Tikməgil çaki-giribanımnı ey həmdəm ki, yar
Yürəgimdə çaklar, çaki-giribandan nə ğəm.

Yar əgər dersə rəqibin boynun üzgil, Kişvəri,
Taəti-həq etkənə təlbisi-şeytandan nə ğəm.

* * *

Ol ki verür canü canan yüzini görməz mənəm,
Ol ki tartar dərdü dərman yüzini görməz mənəm.

Ol ki Məcnun tək sənün eşqündə, ey Leylisifət,
Tərki-sər qıldıvü saman yüzini görməz mənəm.

Ol ki suzi-atəşi-hicran ara pərvanə var,
Yanarü şəm'i-dirəxşan yüzini görməz mənəm.

Ta ki, verdim həlqeyi-zülfi-pərişanına dil,
Kafəri kim, hiç iman yüzini görməz mənəm.

Bulmadı hiç kimsə bu dərgahidən növmüdlik,
Mur-ləngi kim Süleyman yüzini görməz mənəm.

Eşigində Kişvəri tək ola yüz bəndə vəli,
Bəndəyi kim, hiç sultan yüzini görməz mənəm.

* * *

Pərtövi-hüsnün görüb xurşidi-tabandur derəm,
Şiveyi-qəddin görüb sərvi-xuramandur derəm.

Həlqeyi-lə'li-ləbin içində incu dişlərün,
Bir düzulmiş daneyi-mirvarid ğəltandur derəm.

Gülşəni-hüsnündə hər yan nərgisi-məstin görüb,
Laləzar içrə yaturlar iki ceyrandur derəm.

Ləblərin dövrində kim sorsa xətin mahiyyətin,
Səbzələr hər yanı bitmiş abi-heyvandur derəm.

Sən gedəndən bərlü halimdur ki, kafər görməsün,
Xariliğ çəkməkdən isə ölmək asandur derəm.

Halətimdür gülbeyi-əhzanda canan getgəli,
Kim anun yanında ölmək rahəti-candur derəm.

Həsrətindən Kişvəri-ey Misri-canım Yusifi,
Ağlamaqdan gözdən olmuş piri-Kən'andur derəm.

* * *

Yarə köp can verdim, əmma bivəfadur bilmədim,
Aşinalıq rəsmidən naaşinadür bilmədim.

Şivəvü nazü itabi çoxdurur bildüm, vəli,
Ğönçəsi qan tökməkü işi cəfadur bilmədim.

Surətin gögçəkliginə aldanıb verdim könül,
Əhdi süstü bağrı daş, könlü qaradur bilmədim.

Sözünə şirinlədim əvvəl ki, yarımdür mənim,
Təlxi-kam axır yerim kuyi-fənadur bilmədim.

Gözlərinin şivəsinə mübtəla boldum vəli,
Zülfünün hər tari bir dami-bəldur bilmədim.

Eşqi bustanında tikdim yüz tuman nəxli-vəfa,
Bərgi-mehnət meyvəsi rəncü ənadur, bilmədim.

Tapmağa gənci-müradi Kişvəri, qıldım həvəs,
Hər qədəm yolunda kami-əjdahadur bilmədim.

* * *

Bu kim ölkəmdürür, adı fəraqi-yarimiş, bildim,
Bu qan, bu dig ki derlər, ğeyrəti-əğyar imiş, bildim.

Bu kim qalur gözi açux ölür çağında aşiqnün,
Sevir dildarini ol həsrəti-dildarimiş, bildim.

Görünməz zərrəcə ağzın nigara, deridim, leykən,
Gülər çağında ey xurşid, ağzın var imiş, bildim.

Zəmanə bəzmidə hər kim ki içdi şərbəti-vəslin,
Fəraqın zəhrini dadmaq ana naçar imiş, bildim.

Rəqib sözünə baxmazdım visalın istəyib, əmma,
Məni məhrum edən bu bəxti-nahəmvar imiş, bildim.

Dəhanın fikridür hər dəm, ədəm saru uçar könlüm,
Bu açux dünyada anun məqamı dar imiş, bildim.

Cahanü canidən ey Kişvəri, keçmək bolur asan,
Vəli məhbub canidən keçib düşvar imiş, bildim.

* * *

Səadət həmrəhim boldi, müsaid bəxti-firuzim,
Bu gün gördüm xəmaluni, mübarək oldu novruzim.

Nə yerdə kim, keçər sözüm, mnim halımğa ağlarlar,
Diriğa kim, sənün yanında bir gün keçmədi sözim.

Məhi-ruyun fərağında şəbi-ğəm gər nəfəs çəksəm,
Salur od xirməni-xurşidə bu ahi-cigərsuzim.

Saçındur hasili-ömrüm, qaşın mehrabi-məqsudim,
Boyundur nəxli-ümmidim, yüzün şəm'i-şəbəfruzim.

Ğəmü ənduhi-mülkindən nişan hər kimsəyə gəlsə,
Anın tuğrası qan birlə yazılmış Kişvəri, sözim.

* * *

Payibəndəm bir gözi heyranə, bilmən neyləyim,
Düşmişəm ahu təki yabanə, bilmən neyləyim.

Ol pərirüxsarədən kim, canım arami durur,
Qalmışam ayru məni-divanə, bilmən neyləyim.

Bəs ki nəm çəkdi gözümdən, qorxuram kim başhıma
Nagəhan yıxıla bu viranə, bilmən neyləyim.

Gözlərimdən danə-danə əşki-xunin kim düşər,
Vəh ki, bər verməz mana bir danə, bilmən neyləyim.

Xəlq deyər kim, yenə aşiqdür qələndər Kişvəri,
Gerçəkin derlər bu sözə, danə bilmən, neyləyim?

* * *

Kami-dil tərkin qılıb, nakamlıqdur istəgim,
Namu namusi qoyub, bədnamlığdur istəgim.

Ruzigarım tirədür, gəl ey hidayət şəm'i kim,
Sübh vəslin birlə dərü aşamlıqdur istəgim.

Nə mana sərvü gülü nə simü zər təskin verür,
Sən kimi bir sərvi-siməndamlıqdur istəgim.

Ey hilal əbru səbah eyd gəldüm qapuna,
Ləblərindən busəyi-bayramluqdur istəgim.

Kişvəri tək xanə-xanə gəzdügüm bayram günü,
Bir ləbi püstə, gözi badamlıqdur istəgim.

* * *

Yari görgəc der idim əvvəlki yarımdur mənim,
Bildim axir kim, bəlayi-ruzigarımdur mənim.

Gülşəni-ömrüm ara girib xəhanlığ yel kimi,
Hər necə qılsa savuxlux bu baharımdur mənim.

Lalə tək qanımnı töksə canım arami durur,
Ğönçə tək bağrımnı yarsa gülüzarımdur mənim.

Nərgisə bənzər çiçək bitsə nəzarım üstünə,
Sanmagil nərgis ki, çeşmi-intizarımdur mənim.

Pərtövi-xurşid rüxsarın ara cövlan qılıb,
Zərrələr demə ki, cani-biqərarımdur mənim.

Könlimin əhvalını, ey Kişvəri üşşaq ara,
Faş qılğan naleyi-biixtiyarımdur mənim.

* * *

Əbirim, ənbərim, müşkim, ğəzalim, Çinü Maçinim,
Bənaəfşəm, sünbülüm, laləm, gülüm, tazə gülüstanım.

Behiştim, düzəxim, hurim, qüsurim, nurimü narim,
Əzabım, rahətim, ruhum, mənim şəm'i-şəbistanım.

Kitabım, katibim, kilkim, yazılmış nameyi-ömrüm,
Dilazarım, cigərxarım, mələk surətlü nisanım.

Nigarım, dilbərim, yarım, vəfasız şuxi-dildarım,
Xəyalım, həmdəmim, fikrim, hədisim, şe'rü divanım.

Yüzi bədrim, sözi şəhdim, gözü ahu, saçı cadu,
Qədi ər'ər, təni mərmər, ləbi lə'li-Bədəxşanım.

Gözim, eynim, çirağım, afitabım, mərdümüm, çeşmim,
Zəbanım, fikrim, idrakım, sözüm təb'i-dürəfşanım.

Baharım, tazə gülzarım, pəri peykər, güləndamım,
Səmənbər tazə nəsrinim, mənim sərvi-xuramanım.

Meyü bəzmim, neyü çəngim, dilü dinim, xurü xabım,
Qərarü səbrim, aramım, nihani dərdə dərmanım.

Məta'im, mayeyi-ömrüm, qumaşım, nəqdimü nisyəm,
Əqiqim, gövhərim, kanim, bəhasız dürri-ğəltanım.

Cahan içrə mana sənsən muradü məqsədü məqsud,
Əzəl günində bağlanmış sənünlən əhdü peymanım.

Götür bürqə' yüzün görgəz, inayət vəqtidür, şaha,
Necə bolsun itab ilə xitabın afəti-canım.

Ğəmü ənduh ilən ölsəm, deməzsən, ey sənəm, xanı
Ğulamım, çakərim, itim, əsirim, bəndəfərmanım.

Cənabi-dövlətində Kişvəri bir quldur, sənsən
Bəgim, şahim, xudavəndim, ümidim, xosrovum, xanım.

* * *

Gəl axı, ey mənim cismi-zəifim içrə sən canım,
Vücudum zərreyi-sərgəştə sən xurşidi-tabanım.

Muradım, məqsədim, sidqim, şəfiqim, müşfiqim, dustim,
Təriqim, mürşidim, pirim, yolum, adabü ərkanım.

Xəlilü Söhfü İncilim, Kəlimim, Turü Tövratım,
Zəburum, nəğməvü sövt ilə Davudi-xoşəlhanım.

Səlahim, təqvayü zöhdim, iki qaşunla mehrabım,
Ləbin Kövsər, cəmalın Rövzeyi-firdovsi-rizvanım.

Səlahim, təqvayü zöhdim, iki qaşunla mehrabım,
Ləbin Kövsər, cəmalın Rövzeyi-firdovsi-rizvanım.

Səlatım, qibləvü sövmim, səfavü Hərvəvü Məccim,
İmamım, məzhəbim, şər'im, nəmazım, dinim, imanım.

Gülüm, bağım, baharım, cilveyi-tavusi-tənnazım,
Həzarım, bülbülüm, kəklik yerişli vəhşi ceyranım.

Zərim, simim, mülküm, girami gəncimü malım,
Kəminim, Xatəmim, təxtim mənim mülki-Süleymanım.

Ənisim, munisim, yarım, Əzizim, Yusifim, Misrim,
Məsihim, Xızrü zülmatım, həyatım, abi-heyvanim.

Nəbatım, şərbətim, qəndim şəkərləb, məğzi-badamım,
Behim, sibi-süxənguyim, turuncum nari-xəndanım.

* * *

Ol mənəm kim, ölmüşəm hicrindən, ey simin bədən,
Gər dilərlər nagəhan ölmüş ğərib içün kəfən.

Ey sənəm, tax boynuma zülfi-siyahından mərəs
Kim, gərək anın təki zünnarə, mən tək brəhmən.

Sən gedəndən bərlü, ey firdövs bağın gülşəni,
Lalə qandur gözlərümdə, ğönçə peykan, gül tikən.

Yar getdi, ey könül, mən qaldumü sən yarsız,
Möhnəti-hicran əgər budur, nə sən qalgil, nə mən.

Səndən ayru, ey güli-xəndan, qılurmən çak-çak,
Ğönçə tək əgnimdə gər yüz təh bolursa pirəhən.

Degil, ey badi-səba Misrin sipəhsalarına
Kim, ğəmindən oldu ol miskin sakini-beytül-həzan.

Mərhəba, ey sən səfərdin yengi yetmiş mahru,
Şükr bari kim, səni bir daxı gördük sağ-əsən.

Çıxmaya kuyin həvası Kişvərinin başıdan,
Ol zaman daxı ki, dutsa toprağ altında vətən.

* * *

Eylə kim mən yanaram şəm'i-ruxi-cananədən,
Kimsədən bilməz ol mə'ni məgər pərvanədən.

Görmədim ta anədən doğdum ğəmində ruzi-xoş,
Mən kimi bədruz daxı doğmayıbdur anədən.

Qamətin sərvi-rəvandur, dedim isə küsməgil,
Bu məsəldür cani-mən kim “doğru söz divanədən”.

Çün bilürsən halım, ey həmsayeyi-beytül-həzən,
Rəhm edib sürmə məni bu guşeyi-viranədən.

Ta səni gördüm mən, ey canü cəhanim afəti,
Yüz ğəmü dərdü bəla gəldi mana hər yanədən.

Kişvəri yaralidə demə cüdalıq dərdini,
Olmaya ğəmgin ola bu suznak əfsanədən.

* * *

Könlüm nəsibi çün ki, bəla qıldı yarədən,
Tabi-bəla gətürmədi, can çıxdı arədən.

Çeşmimdən ey ğəzalə, fəraqində ağlasam,
Pərkalələr düşər cigəri-parə parədən.

Könlüm qara qılur yüzini sənsiz ah ilən,
Qurtar xuday içün məni bu yüzi qarədən.

Baş ağradur səhər bu müəzzin dedikləri,
Yarəb ki, uçursun tanrı anı minarədən.

Könlündə hiç rəhmi yox ol dilbərün, bəli,
Mehri-kiyah bitməz olur səngi-xarədən.

Bimarlıq nəhayətə yetdi, gör ey rəqib,
Gorü kəfən yəraqı ki, iş ötdü çarədən.

Kirpikləri xəyalında, ey Kişvəri yenə,
Bağrım bolub kəbabü asıldı qənarədən.

* * *

Gözüm ağlar cəmalın həsrətindən,
Yanar bağrım visalın həsrətindən.

Dügünlər göydürüb kəsdim əliflər,
Yüzündə xəttü xalın həsrətindən.

Məsihü Xızr iki avarədürlər,
Ləbi abi-zülalin həsrətindən.

Gülistanda quru qalmış sənubər,
Sənün qəddi-nihalın həsrətindən.

Keyik tək Kişvəri səhrayə düşdi,
Oşol çeşmi-ğəzalın həsrətindən.

* * *

Çün yazılmışdı bu sərgərdanlığım təqdirdən,
Necə kim cəhd eylədim, pozulmadı tədbirdən.

Çəkmə zülfini əlimdən, ey məhi-bədmehr kim,
Dərdinakəm, qorxuram bu naləyi-şəbgirdən.

Vay kim, yüzündən ayru qaldımü can vermədim,
Baxa bilmən yüzünə, şərməndəəm təqsirdən.

Yarəb, ol şahi-cəvanan ərzinə nə yetdi kim,
Hiç qılmaz yad bir gün mən ğülami-pirdən.

İştiyağın şərhini təqrir qılmaz Kişvəri
Kim, irür dərdi-dili mə’lum bu təhrirdən.

* * *

Sənsən, ey Leyli məni-Məcnuni rüsva eyləyən,
Könlümi çak eyləyib, canımı ara ca eyləyən.

Şuxilər mehman kibi könlüm evin məskən qılıb,
Mərdümi-çeşmim təki çeşm içrə mə'va eyləyən.

Nola gər sorsan məni rüsvayi-aləm halini,
Ey məni bu hal ilən aləmdə rüsva eyləyən.

Bolma ğafil kim, canazəmdən çıxar hər yan şərər,

Ey çıxıb tabutum ardınca təmaşa eyləyən.

yoluna baş qoymuşam, çünkim əyağım qalmadı,
Ey saçın tək Kişvərini bi sərü pa eyləyən.

* * *

Düşdü könlüm dami-zülfün bəndinə təqdir ilən,
Eylə kim, qurtulmağı mümkün iməs tədbir ilən.

Həlqə-həlqə kakilün cırmaşdı könlüm boyinə,
Necə kim, aslanı bağlarlar iki zəncir ilən.

Zinhar, ey həmnişin, söylətmə mən divanəni
Kim, tükənməz bu mənim dərdi-dilim təqrir ilən.

Tilbə könlüm saçın sevdasi istər hər gecə
İstərəm könlüm muradi naleyi-şəbgir ilən.

Sizni görgəc Kişvəri can vermədi təqsir edib,
Qulluğuna gəldi üştə, yüz tuman təqsir ilən.

* * *

Məni kim öynə-öynə öldürürsən
Aşiq öldürməgin cani bilürsən.

İki mehman bir evdə çün sığışmaz,
Mənim canım gedər, çün sən gəlürsən.

Dila, meyxanədən dışxarı çıxma
Ki, hər nə istəsən anda bulursan.

Gər ol ay mehri yox, ey çərx səndə,
Nədən başına hər dəm çizginürsən.

Bolupdur Kişvəri zəifin ziyadə,
Əcəb gər bu gecə dana qalursən.

* * *

Necə kim, xəlqi dirildür şivəvü rə'nalığın,
Vəh kim, öldürdü məni məstivü bipərvalığın.

Zülməti-zülfün əgərçi afəti-candur, vəli,
Abi-heyvan şərbətidür lə'li-ruhəfzalığın.

Vəh nə məclisdür bu kim, hər canı təndə qoymadı,
Ol qıya baxuşlarınü adabi-bəxmaralığın.

Çıxmaya eyvani-xavərdən daxı xurşid əgər,
Çəksələr anda sənün bu surəti-zibalığın.

Yuzidən bürqə' götürdü ol pərivəş, ey könül,
Vəh ki, yetdi tilbəlik çağı bilə rüsvalığın.

Sürmeyi-naz görsən çeşmi-şəhlasın məgər,
Bilsən ey nərgis ki, yarutmaz səni şəhlalığın.

Üştə can verdi ğəmindən xəstəxatir Kişvəri,
Xanı ey ruhi-mücəssəm, ol dəmi-İsalığın?

* * *

Ruzin həmişə xürrəm, fərxəndə ruzigarın,
Bolsun mübarək, ey gül, novruzü növbaharın.

Ey bülbüli-cigərxun fəsli-bahar gəldi,
Qıl nalə kim, göründü bağ içrə gülüzarın.

Yüzün behişt bağı, zülfün ana bənəfşə,
Bolsun müdam tazə, ey gül bənəfşəzarın.

Qaşınla qəddi-nazın getdi gözümdən, əmma
Nunü əlif qalupdur köksümdə yadigarın.

Ruhinə bir dua qıl dərvişi-Kişvərinün,
Düşsə məzarı üstə nagah rəhgüzarın.

* * *

Zülf açıb qıl cilvə kim, tavus rə'nalanmasun,
Tutiyə görsət xəti-səbzin şəkərxalanmasun.

Sübhi-dəm gülşəndə xabi-nazdən acgil gözün,
Bir qıya bax nərgisə, bağ içrə şahlalanmasun.

Zahidə görkəz yüzün birlə qaşın mehrabini
Kim, unutsun məscidü mehrabi ma'valanmasun.

Kakilin sevdasinə düşgəc utuzdum dinü dil,
Heç müsəlman bu pərişan fikri sövdalanmasun.

Bülbüli-nalan əgər gül vəsfini çox söyləyə,
Kişvəri şe'rini ərz etgil ki, ğövğalanmasun.

* * *

Ey məni aşüftə qılğan ənbərafşan kakilün,
Ruzigarımnı qılıb mundaq pərişan kakilün.

Şivəvü nazü məlahət birlə sənsən gənci-hüsn,
Yatur ol gənc üstinə bir qarə yilan kakilün.

Kim ki, gördü kakilini bağladı zünnari-küfr,
Qoymadı aləmdə vəh bir salim iman kakilün.

Mən daxı bir əhli-islam irdim, ey dil, vay kimi,
Küfrə döndərdi məni şol namüsəlman kakilün.

Nola mən divanə qucsam sən pərini bir gecə,
Boynuma zəncir tək dolansa hər yan kakilün.

Xəstə canlardur giriftarın ki, sənsən haliya,
Xubilər sultanivü zənciri-sultan kakilün.

Kakilindən rişteyi-ümmidi yüzməz Kişvəri
Kim, anun hər taridür bir rişteyi-can kakilün.

* * *

Öldürmə cövr ilən məni kim, yarunam sənün,
Qıl bir nəzər ki, yari-vəfadarunam sənün.

Canü cəhanü dinü dilü səbrü huş ilə,
Ey gövhəri-yeganə xəzinədarunam sənin.

Can ver iki ləbindən, əgər yarisən mana,
Ey çeşmeyi-həyat ki, bimarunam sənün.

Özgə həvavü özgə həvəs məndə qalmadı,
Ey sənvinaz, ta ki, həvadarunam sənün.

Gülzarü-hüsndür yüzün və bəndə Kişvəri,
Şirin kəlam bülbüli-gülzarunam sənün.

* * *

Natəvan könlüm ki, lə’lindən zəkat almış gəlür,
Sayrudur dərman içün həbi-nəbat almış gəlür.

Zülfin altında xəti-səbz ol ləb üzrə guyiya,
Zülmətə girmiş Xızır abi-həyat almış gəlür.

Xanda kim, tumari-dərdüni açırmən, xəlq der,
Bir sipahidür ki, divandan bərat almış gəlür.

Vəh nə laçındur gözün kim, qaşlarından mal açıb,
Qafi-qüdrət quşidən iki qanat almış gəlür.

Şərhi-şövqin yazğalı deb Kişvəriyi-xəstədin,
Qanlu kirpikdən qələm, gözdən dəvat almış gəlür.

* * *

Xublar yanında ol şahi-cavanın bəllüdür,
Ləşkəri gər çox bolursa nola, sultan bəllüdür.

Yüz qəmər yüzlü sənəm gər doğsa, sənsən afitab,
Dutsa yulduz gög yuzin xurşidi-taban bəllüdür.

Məndə daxi də'viyi-mehrü bolsa, nola,
Kimdə var çeşmi-tər, çaki-giriban bəllüdür.

Cövhəri-hüsnün çox, amma ləblərün ayruxsidür,
Cövhəri dükkanidə lə'li-Bədəxşan bəllüdür.

Bəllüdür xunabi-çeşmim içrə şəkli-qamətin,
Seyli-ğəm dutsa cahanı, abi-heyvan bəllüdür.

Kişvəri meydani-eşqünə girib baş oynadur,
Qılsa də'vi yüz dilavər, mərdi-meydan bəllüdür.

* * *

Məni mən' etmə, ey zahid, fəğandan ruy-yar olğac
Ki, bülbülnin fəğandan ixtiyarı yox bahar olğac.

Nə yarımdan vəfa gördüm, nə xoşluq ruzigarimdən,
Vəfalu yar həm xoşdur, cəfayi-ruzigar olğac.

Fələk eyvanına hər yan düşər od könlum ahindən,
Yıxar tufan səlamət evini çeşm əşkibar, olğac.

Vəsiyyətin bu kim andan qoparma, ey səhər yeli,
Səri-kuyində bu xaki təni-zarim ğubar olğac.

## RÜBAİLƏR

1

Qılğıl məni-gümrahə inayət yarəb,
Görsət mənə bir rahi-hidayət yarəb,
Vergil nəfəsi-gərm ilə ahi-səhəri
Könlümcə kim ol qılsa sirayət yarəb.

2

Ey şəm' yüzün ovci-səadət günəşi,
Sən türki-Xətayisənü xalın həbəşi.
Sən xandə vü mən xandə zəhi fikri-məhəl
Mən qul həbəşivü sən çirağı Qüreşi.

3

Cismimi zəifü natəvan qıldı fərağ,
Canımnı ədəm sarı rəvan qıldı fəraq.
Bulmaz desə kim, yaxşı-yaman qıldı fəraq,
Yari məni rüsvayi-cahan qıldı fəraq.

4

Fikrim bu durur kim, səni mehman qılabən,
Bu cani-girami sənə qurban qılabən,
Bağrım qanidən şərabi-lə'li götürüb,
Köksüm içində könülnü büryan qılabən.

5

Hər dəm qəmi-eşqin məni ğəmgin qıladur,
Xunabeyi-dil çöhrəmi rəngin qıladür.
Ey dil xanı sən ki, ol sənəm imdidən,
Zülm ilə sitəmpişəsi ayin qıladur.

6

Ğürbət məni zarü natəvan qıldı yenə,
Seylabi-sirişkimni rəvan qıldı yenə.
Ğəm bülbüli kim, ovci fərəh bürcündən
Könlüm qəfəsini aşiyan qıldı yenə.

7

Aləmdə məni-xəstəyə bir yar gərək
Hər yar nə kim, yari-vəfadar gərək.
İşrət günidə çox bulunur yar, vəli
Ğəm köçər icək yar ilə qəmxar gərək.

8

Qıldı səri-zülfün yenə divanə məni,
Qərq etdi yenə kafə təki qanə məni.
Səhrayi-ədəm sarusuna qıldı rəvan
Ahu təki ol nərgisi-məstanə məni.

9

Ey bağı-rüxün rövzeyi-rizvan qara göz,
Künci-dəhənin çeşmeyi-heyvan qara göz
Ey mərdüməki-dideyi giryan qara göz.
Canım qara göz, canıma canan qara göz.

10

Ey vay ki, qaldım yenə qürbətdə qərib,
Nə yarü nə qəmxarü nə həmdəm, nə təbib.
Nə halıma behbud, nə dərdimğə təbib,
Nə vəslinə ümid, nə hicrinə şəkib.

## BƏSİRİ

*Bəsiri XV əsrin sonu – XVI əsrin əvvəllərində yaşamış Azərbaycan şairidir, doğulduğu il və yer məlum deyildir. Gəncliyində Orta Asiyaya getmiş, Əlişir Nəvai və Əbdürrəhman Cami ilə şəxsən tanış olub, onların məktubu və Əlişir Nəvainin divanı ilə Türkiyə sarayına gəlmiş və ömrünün sonuna qədər Türkiyədə yaşamışdır. Nəvai divanını ilk dəfə Türkiyəyə gətirən Bəsiri olmuşdur. Fars və Azərbaycan dilində gözəl şerlər yazmışdır.*

*Bəsiri eyni zamanda gözəl lətifələr müəllifi imiş. Müasirləri "cünglərə, cəriflərə səbt olunacaq rəngin lətaifi... çoxdur" deyirlər. Şairin əsərləri toplanılmamışdır. Təzkirələrdə saxlanılan qəzəllərində təriqət şairlərinin təsiri hiss olunsa da, bunlar əsasən məhəbbət mövzusunda yazılmış lirik parçalarıdır.*

### QƏZƏLLƏR

Şol nazənin ki, dili-zarım aşinadır ana,
Bəlayi görgi gözəllərdə mübtəladır ana.

Yaqub yıqarsa dilü canım e'tiraz edəməm,
Nə söyləyim biri qurban, biri fədadır ana.

Səzamm bağda gülgəşti nasəzalərilə,
Nə tə'n bədəndiliələr səzadır ana.

Təbiəti qatı nazikdir ol şəhi-hüsnün,
Şikayət eyləyəməm cövrdən cəfadır ana.

Hekayət etmə mana huri-eyni, ey Vaiz
Ki, dust təşnəsiyəm rəğbətim anadır ana.

Füsunü ğəncü dəlalü girişməvü şuxi,
Bütün bənimdə var əksik həmin vəfadır ana.

Nə dəm ki eyləyə tərtib bəzmi-sağü tərb
Nəva təraz Bəsiriyi binəvadır ana.

* * *

Pürdir ol saf güli-tərdən dəhani-əndəlib,
Həşrədək bulmaz nəhayət dastani-əndəlib.

Bimi-fürqətdən yenə fəryad edər şamü səhər
Şax gül üzrə bulunsa aşiyani-əndəlib.

Olmuş əczayi-vücudla əzmü xakəstəri
Atəşi-güldən yaqılmış kimi cani-əndəlib.

Şövqi-ruyi-dilguşasidir bəni nalan edən,
Baği-aləmdə gül içündür fəğani-əndəlib.

Ol bənimdir, bən anın, məfhum birdir desələr
Əndəlibi-gülüstan ya gülüstani-əndəlib.

Ləfzi-güldən qeyri yazmaq mümkün olmaz katibə
Xaməsinə məqtə olsa üstüxani-əndəlib.

Mürğlər xamuş olur, güllər sərapa guş olur,
Olsa gülşəndə Bəsiri həmzəbani-əndəlib.

* * *

İki surət xubdur həqdən bana olsa nəsib,
Ol məhin yüzüni görmək, görməmək ruyi-rəqib.

Xali-mişkin arizi-kafurun üzrə ey sənəm,
Hinduyi-miskin durur kim, Ruma düşmüşdür qərib.

Etməyin zaye bana sən yox yerə dərmanını
Dərdməndi eşqə dərmanımı bulunur ey təbib!

Bir deyil bülbül tənində fəm küli vəsf etməyə
Başdan ayağa zəban olmuş çəməndə əndəlib.

Ey Bəsiri, sərbəsər xakəstər olur kainat
Dolsa ahəng atəşindən aləm içrə bir ləhib.

* * *

Arifə dövlətdən istiğna kimi dövlətmi var,
Tərki-ləzzəti-cahan etmək qədər ləzzətmi var?

Şahi-ali cahdən, dərvişi, xatirrimə dək
Kimsəyə təxti-sərayi-dəhrdə rahətmi var?

Eşqi-hüsni-pak əzəldən xaslər məxsusidir,
Yoxsa amilərdə heyhat oylə xasiyyətmi var?

Ləzzət iras eyləyir amazişi-ənbai-dəhr
Ğafilə üzlət kimi sərmayeyi-izzətmi var?

Nəqşi-şirin kühf asandır amma mən kimi
Kuhgəndə kuhi-möhnət çəkməyə taqətmi var?

Yar qətlimçün vüzu qılmış təqərrüb əzmini
Ya zəmirində nəmazım qılmağa niyyətmi var?

Ey Bəsiri, əbdin əhvali ana mə'lum ikən,
Dərgəhi mövlada ərzi-hacətə hacətmi var?

* * *

Sənin dərdindən, ey şuxi-cəfakar
Bəla bu kim nə sağəm mən nə bimar.

Nə gül qalur bu gülşəndə, nə bülbül
Gərək sən könlün açıq tut, gərək dar.

Qamu əğyarinə yar eylər rəhm
Bana nə yar rəhm eylər, nə əğyar.

Səba çün rəşkdən kim öpdüm izin
Üzün yerdən yerə urar yeri var.

Edər aqilləri Məcnun Bəsiri
Qaçan kim eşq dərsin edə təkrar.

# HƏBİBİ

*XV əsrin sonu XVI əsrin əvvəllərində yaşayıb-yaradan Həbibi təxminən 1470-ci ildə Göyçayın Bərgüşad kəndində dünyaya gəlmişdir. Uşaq yaşlarında quzu otararmış. Təsadüfi bir hadisə nəticəsində Ağqoyunlu hökmdarı Sultan Yəqubun sarayına düşən Həbibi burada bir şair kimi yetişmək imkanı tapır. Ağqoyunlu hökmdarı Sultan Yəqubun sarayına düşən Həbibi burada bir şair kimi yetişmək imkanı tapır. Ağqoyunluların süqutundan sonra şair Səfəvilərin sarayında da hörmətlə qarşılanmış, Şah İsmayıl Xətayinin sarayında "Məlik üş-şüəra" rütbəsi qazanmışdır.*

*Həbibinin ahəngdar poetik dili, bədii üslubu, şeirlərindəki sadəlik və əlvanlıq, səmimi hissləri ecazkar bir şəkildə ifadə etmək qabiliyyəti ona Azərbaycan ədəbiyyatı tarixində xüsusi bir mövqe qazandırmışdır. Şairin əsərləri tam halda əldə yoxdur. Həbibinin irsindən məlum olan 42 şeir nümunəsinə Ə.Məmmədov 5 şeir də əlavə edərək, 1980-ci ildə çap etdirmişdir.*

## QƏSİDƏLƏR

Müavin mana ol Sübhan olursa,
Bədəndə ruhi-qüdsi can olursa,

Tutam ömrüm kimi zülfün ucun bərk,
Nigara, vəslinə dərman olursa.

Çü cövhər dür saçam ol dəm gözümdən,
Xəyalın lütf edüb mehman olursa.

Necə etsün qərarı can saçınla
Ki, sir nə əhdü nə peyman olursa.

Sən ol sultani-cansan, ey diləfruz
Ki, qapında səğir, min xan olursa.

Nə qəm, sən Xosrovin min cani-Şirin
Səri-zülfində sərgərdən olursa.

Yüzün nuri edər şəksiz hidayət,
Saçın küfri mənə iman olursa.

Səadət bulur ol dəm nəhsi-əkbər,
Qapunda, ey Günəş, dərban olursa.

Şu fəttan eyninin eyninə gəlməz,
Ucundan dəmdə yüz min qan olursa

Ruxun şəm'inə qarşı canı hər dəm,
Nola pərvanəvəş büryan olursa.

Ruxun, zülfün görüb oldum müsəlman,
Olur min illik ol röhban olursa.

Əgər dünyadəvü üqbadə sənsən,
Həmin cana əzimüşşan olursa.

Oxur can müshəfini bigüman, ol
Xətü xalın kimə bürhan olursa.

Görən şol vəchi-zibanı, nigara
Nola gər valehü heyran olursa.

Nə sultansan ki, qapunun gədası
Durur, min Xosrovü Xaqan olursa.

İrəm ruzi-visalə, ey məhi-növ!
Şəbi-hicranına payan olursa.

Dü aləmdə qəni ola fəqirin,
Qapundan fəzl ilə ehsan olursa.

Qamu dərdü fəraqindən həmin bəs,
Bu aşiq dərdinə dərman olursa.

Həyati-cavidan bula Həbibi,
O qaşın eydinə qurban olursa.

* * *

Əla, ey dilbərim, yarım, xərabat,
Dilü can içrə dildarım, xərabat.

Bu viran dil sarayın vəsl əlilə
Yap, ey lütf issı me’marım xərabat.

Məni zar etməsün, de, xari-hicran,
A can bağında gülzarım, xərabat.

Məni şol cami-meydən məst eylə
Ki, sənsən sətri-əsrarım, xərabat.

Mənim bu mənliyim, mülkümi yəğma
Çün etdin, türkü tatarım, xərabat.

Məhəllən külxaninün güşəsidir,
Sığıncım, bürcümü barım, xərabat.

Girov olsun da piri-meyfiruşə
Mürəqqə, cübbə, dəstarım, xərabat.

Ümidim bad etmə, badə vergil,
Ey abu xakimü narım, xərabat.

Ənasir, şeş cəhatü həft kövkəb,
Bu doqquz çərxi-dəvvarım, xərabat.

Əgər sufi vicudi nur olursa,
Hədisü nəqlü əxbarım, xərabat.

Kəlamü hikmətü elmi-lədünni,
Mənim mehrimdir, ənvarım, xərabat.

Bəyanü məntiqü qanuni-hey’ət,
Qəzəl, qövlilə əş’arım, xərabat.

Dəfü neyü udu şeşta çəngü bərbət,
Mənim təsnifi-ədvarım, xərabat.

Məşami-canə ətrin buyun irgər,
A tibb ənfas, əttarım, xərabat.

Şu fir'ovni gözünlə qarə zülfin
Olaldan bərü səhharım, xərabat.

Dəli-divanə oldum məst gözündən,
Bil, ey danayi-huşyarım, xərabat.

Həbibi niyc ed istiğfarü tövbə[1]
Ki, əzəldən oldun əhrarım, xərabat.

Könül çirkin yu getsin Fəzl əliylə,
A tahir, pak əbharım, xərabat.

Məni bu ikilikdən birə irgər,
A həftü pəncümü çarım, xərabat.

## QƏZƏLLƏR

Dərdi-eşqə hər ki, ol dəmsaz ola,
Ol gərək labüd ki, əhli-raz ola.

Aşiqi-sadiq odur mə'şuqunun
Yoluna can tərk edə, sərbaz ola.

Dəmdə min gəz qal edərsə aşiqi,
Qəmzəsi mə'şuqunun xud az ola.

Aşiqa, cövrü cəfavü dərdü qəm,
Zövqü şadi, hüsnü xülqü naz ola.

[1] Necə istiğfar və tövbə edə

Hər məzəllət ki, irişə mə'şuqdən,
Aşiqə xud ol qəmu e'zaz ola.

Aşiq anda necə tövbə edə kim,
Abü səbzə, şahidü mey saz ola.

İrişəməz şol hümanın zülfinə
Mürği-dil gər şahinü şahbaz ola.

Ey Həbibi, xoş durur cami-şərab,
Xassə kim, məhbubi xoş avaz ola.

* * *

Sünbül saçın gül yüzünə çünkim niqab olur, şəha,
Pünhan olan gözün ol dəm şol afitab olur, şəha,

Lə'li-ləbi-yaqutuna can necə təşnə olmasın,
Çünkim anın hər qətrəsi dürri-xoşab olur, şəha.

Yüzünə Zöhrə, Müştəri, Mehr ilə Mah ögünməsin,
K'ol günəşin bir zərrəsi min mahtab olur, şəha.

Mehrinlə kinən odunu canım içində yaxalı,
Eynül-yə'qin yerin yüzü eynimdən ab olur, şəha.

Ol dəm ki, sən nuş edəsən cami-sifayi Cəm kimi,
Lə'linə cam irdügünə bağrım kəbab olur, şəha.

Nəzr etdügün bir busəyi dərviş içün etsən əda,
Vallahi kim, andan sana min-min səvab olur, şəha.

Lə'lün dürür ehya edən hər dəm o bicismi, vəli,
Sərxoş gözündən sayru can məsti-xarab olur, şəha,

Abi-zülali-vəslinə şol rəsmə təşnədir bu can,
Kim gözlərimə bu cəhan eyni-sərab olur, şəha.

Bağrım qanını gözlərin hər dəm, Həbibi, tökdügü
Budur ki, rəngin ab ilə ol xoş xizab olur, şəha.

* * *

Hər kimə həmrah Fəzlullah ola,
Ana fəzli-feyz ol Allah ola.

Hər nə kim edər kişi, ey yol əri,
Ol gərək kim, həsbətən-lillah ola,

Eşqi-mə’şuqə qul olan sidq ilə
Dünyəvü üqba içində şah ola.

Aşiqin işi gərək şamü səhər
Virdi həsrət gözyaşilə ah ola.

Bu üfüqdən hər sitarə kim doğar,
Mehri-aləm can gögündə mah ola.

Nur ilə röşən ola bu kainat
Ol səadət nəcmi Şəmsullah ola.

Vəchi-adəmdir sirati-müstəqim,
Ana doğru getməyən birah ola.

Etməyən səcdə mələkvəş adəmə
Divi-məl’un, asiyi-gümrah ola.

Öldürür sultan iki aləmdə bəs,
Çün Həbibi hər ki, Abdullah ola.

* * *

Türreyi-tərrarını sən edəlidən piçü tab,
Canü dildən səbrü aram getdi, gəlməz gözə xab.

Valehü heyran olur, hər kim görür gün yüzünü,
Sən necə hurü mələksima bəşərsən, ey şəbab.

Ruxlarınla arizin hər kim görürsə der rəvan,
Zi əcəb qüdrət ki, atəş yanarü həm axar ab.

Pərtövi-hüsnü cəmalın aləmi rövşən qılır,
Sən doğaldan can gögündə, ey qəmərrux afitab.

Ol siyəhdil mənlərindən əhli-dildir münfəil,
Şol pərişan sünbülündən cana irər iztirab.

Şəhpəri-ərş-aşiyanın, yə'ni ğəmzən, ey sənəm,
Məkr ilə yıxdı cəhanı, (aləmi) qıldı xərab.

Ey Həbibi, ol həbibin dərdi-eşqi-suzunu
Canü könlün yoldaş eylə kim, budur xeyrül-mə'ab.

* * *

Dur səhər, ey saqiyi-can, bir qədəh mey sun bizə,
Gözlərin çünkim yedirdi, sehr edib, əfyun bizə.

Valehü biəqlü sərxoş, məstü heyran olmuşuz,
Görünəli şol gözü nərgis, yüzü gülün bizə.

Ruxların şol cami-Cəm giti-nümadır kim yəqin,
Rövşən ol yüzdən görünür xaliqi-biçün bizə.

Pür edüb peymanəyi, saqi, əlümə sun müdam,
Nuş edəlüm, kim bilür, neydə bu çərxi-dun bizə.

Ol səfa camın peyapey nuş edəlüm, ey həkim,
Çünki ol piri-muğandan oldu bu qanun bizə.

Şol ləbi-yaqutini qut etməkiçün canına,
Dəmdəbəm yedirdügü qandır dili-pürxun bizə.

Ey Həbibi, əqli qoy, tut cami-eşqi hər nəfəs,
Şöylə layə'qəl oli gör kim gülə Məcnun bizə.

* * *

Dur uru, ey saqiyi-məhru bizə,
Sun bərü bir qaç qədəh vinu[1] bizə.

Ləblərindir gərçi kim, tiryaki-can,
Əf'i zülfin içirür ağu bizə.

Gün yüzündən şadü xəndandır könül,
Saçların əbri salar qayğu bizə.

Eyni-aşubi-cahandır gözlərin,
Afəti-can oldu ol cadu bizə.

Rövzəyi-hüsni-camalın görəli,
Hasil oldu cənnəti-minu bizə.

Gərçi kim səhmi-səadətdir qaşın,
Ox edər tiz ol kəman-əbru bizə.

Dür dişinlə lə'li-nabun zövqini
Verməz, ey can, laləvü lö'lö bizə.

Abi-heyvan çeşməsindən dadlıdur,
Versə lə'lin çün bir içim su bizə.

Rəhzəni-candır, Həbibi, xaki-dust,
Vəh ki, edər ol dil siyəh hindu bizə.

* * *

Şol mübarək zatına işim sənadır, ya nəbi,
Asiliq bimarına adın şəfadır, ya nəbi.

Ayağın torpağının qədrin nə bilsin hər kişi,
Kunfəkan ol toprağa kəmtər bəhadır, ya nəbi.

[1] Çaxır, şərab

Ey günəş yüzlü həbib, hər kim səni həq bilmədi,
Danla məhşərdə anın yüzi qəradır, ya nəbi.

Çün sənin xoşlığına yaratdı sane' aləmi,
Ayağın toprağına aləm fədadır, ya nəbi.

Bu Həbibi xəstəyə qılğıl şəfaət ruzi-həşr,
Çünki əslində səninlə aşinadır, ya nəbi.

* * *

Billah, ey sərvi-rəvan, durgil səhər, gül şən degül,
Gün yüzün şəm'i önündə ta gülə gülşəndə gül.

Cümlə aləm gülşən olsa, gülsə hər dəm yüzümə,
Çün gülər yüzün mənə gəlmiyə, ol gülşən degül.

Rövzəyi-hüsnü cəmalın ərz edəldən, ey sənəm,
Güldü bağü lalə, nəsrin, süsənü gülşəndə gül.

Bitirəldən gülsitanı, bağbani-kainat,
Bitmədi bir gül yüzün misli dəxi gülşən degül.

Lalə yüzün həsrətindən oda yaxar içini,
Qönçə lə'lün qeyrətindən su olur gül şən degül.

Sünbülün vəsfin səbadən eşidüb dürür məgər,
Anın içün yelə verür xirmənin gülşəndə gül.

Bu Həbibi irişəldən növbahari-vəslünə,
Aləm ana cənnət oldu, yalnız gülşən degül.

* * *

Dur uru, saqi, billah, xoşxiram,
Cami-Cəmdən nuş edüb sərxoş həram.

Lə’li-yaquti-rəvani lütf edüb,
Sun əlümə edəvüz bəzmi-müdam.

Gün yüzünlə zülfi-şəbrəngün, a dost,
Virdimü zikrim olubdur sübhü şam.

Ey qəmərrux, şəmsi-can, saqi, saqın,
Puxtə olmuş aşiqini etmə xam.

Səbzəvü abü hərifü sazü mey,
Bu durur əsbabi-işrət, vəssəlam.

Hazır ikən dur içəlüm durmadan
Kim, gedər Cəm taxtdan uşanur bu cam.

Söhbəti bir xas edəlim yar ilə,
Müttəli olmasın ana heç avam.

Cəhd qıl, sənligi səndən zail et,
Şol müsəffa ab ilə sən, ey qulam.

Ey Həbibi, hali olma bir nəfəs,
İç şərabı il on iki ay tamam.

* * *

Gərəldən zülfi-ənbərbarın, ey dust,
Pərişandır bu dil-əfkarın, ey dust.

Yaşarduqca ləbi-lə’lində xəttin,
Qızarır atəşi-rüxsarın, ey dust.

Nə şirin abi-rəngü xalü xətdir,
Şu ziba surəti-pərgarın, ey dust.

Bu gün mahiyyəti sənsən həqiqət
Bu həftü pəncü nöhlə çarın, ey dust.

Əcəb afətdürür cani-cəhanə
O çeşmi-caduyi-əyyarın, ey dust.

Nə rövşən şəmsi-dinü mehri-cansan
Ki, tutdu aləmi ənvarın, ey dust.

Olubdur qərqi-ənvari-təcəlla
Həbibi görəli didarın, ey dust.

Yüzün mahin görən mehrinə baxmaz
O çərxi-atlasi-dəvvarın, ey dust.

* * *

Dil saçından oldu sevdayi mizac
Cana, şirin ləblərindən et əlac.

Eyni candır əllərindən zəhri-nab,
Sənsiz abi-zindəgi milhi-ücac.

Ənbəri-sara saçından oldu xak,
Nafeyi-Çin necəsi bula rəvac.

Hüsnünin razın necə saxlaya dil,
Gizlətmək mümkünmi misbahi zücac.

Cövhərindən xaki-pakin, ey sənəm,
İrişən baş olmadı möhtaci-tac.

Bu Həbibi dünyəvü üqbadə bəs
Həzrətindən qeyrə etməz ehtiyac.

Olmadan bu badü atəş xakimiz,
Mahi-mehrinlə bulaydı imtizac.

## MÜSƏDDƏS

Dün gördüm ol nigari-tərəbnakü ərcimənd,
Kafur əliylə dəstələmiş ənbərin kəmənd,
Baxdım işkənci-türrəsinə zarü müstəmənd,
Bir şəxsi-natəvan oturur gərdənində bənd,
– Kimdir bu miskin, ol nə rəsəndir? – dedim, dedi:
– Zülfim kəməndi tutsaği canındürür sənin.

Çəkmiş cəmalə fərrü dəmü izzü cahını,
Ənbərlə, doldurub, başa əymiş külahını,
Əbrin yüzündən aldı və ərz etdi mahını,
Gördüm yüzündə daneyi-xali-siyahını,
– Şol müşk lalə üzrə nədəndir? – dedim, dedi:
– Canında əksi-daği-nihanın dürür sənin.

Lə'lü göhər dişiylə yapışmış dodağinə,
Müşki-Xütən həvəsdən ulaşmış yanağinə,
Dürri-Nəcəf həvadən asılmış qulağinə,
Çox danə-danə nəsnə tökülmüş ayağinə,
– Hey-hey, bu nə əqiqi-Yəməndir? – dedim, dedi:
Gözdən axan cigərdəki qanın dürür sənin.

Gəşt ilə çıxdı gülşənə ol sərvi-gülüzar,
Əlvanı meyvə daməninə tökdü şaxsar.
Mən gördüm anda püstəvü badamü sibü nar,
Bir mürğ oxurdu arizi bağında zar-zar,
– Ol mürğ nə mürğ, bu nə çəməndir? – dedim, dedi:
– Baği-çəməndə mürği-rəvanın dürür sənin.

Göz gördügüncə könlüm olur hüsnü maili,
Eylər dəli bu şivə ilə neçə aqili,
Sehr eyləmiş yüzündə yenə çahi-Babili,
Bənd etmiş anda bir neçə sahibnəzər dili,
– Çin söylə, bu nə çahi-zəqəndir? – dedim, dedi:
– Ey çox xətalı, kəndü məkanın dürür sənin.

Yaşım yürüdü su kimi ol sərv suyinə,
Göz baxa qaldı zülfü xətü ruyü muyinə,
Piranəsər könül axub ol qəddi-cuyinə,
Aldandı tifltək dil anın rəngi-ruyinə,
– Bu nə xöcəstə sərvi-səməndir? – dedim, dedi:
– Bəxti-səidü ömri-cəvanın dürür sənin.

Nərgis oyandı, bu çəmən damənü caməxab...
Gül çıxdı, pirəhən yaxasından açub niqab
Təb düşdü canə, cümleyi-afaqi tutdu tab,
Ol dəm ki, doğdu qibleyi-məşriqdən afitab,
– Bir zərrə gördüm anda, dəhəndir!
– Bu söz yəqin, Həbibi, gümanın dürür sənin.

## QİT'Ə

Səfa həngamıdır, işrət dəmidir, ey güli-rə'na,
Açıl baği-lətafətdə görünsün pərçəmin, cana,
Münəvvər eyləsün ruyun dili-üşşaqi-qəmxari,
Dili-naşadi şad eylə, budur xasiyyəti-mə'na.

# ŞAH İSMAYIL XƏTAYİ

*Xətayi Şah İsmayıl Heydər oğlu Səfəvi 23 iyun 1486-cı ildə Ərdəbil şəhərində anadan olmuşdur. Xətayi görkəmli Azərbaycan şairi, dövlət xadimi – Azərbaycan Səfəvilər dövlətinin ilk hökmdarı olmuşqdur (1502-1524). Xüsusi mədrəsə təhsili almış, Azərbaycan, fars və ərəb dillərini öyrənmişdir. Hər üç dildə şeir yazmaq qabiliyyətinə malik olan sənətkar əsərlərinin əksər hissəsini doğma ana dilində yazmışdır.*

*Klassik Şərq poeziyasını dərindən bilən Xətayi qəzəl, qəsidə, tərcibənd, rübai, mürəbbe, qitə kimi klassik şeir formaları ilə yanaşı xalq ədəbiyyatı, aşıq şeiri üslubunda da qoşmalar, nəfəslər, varsağılar, bayatılar yazmış, məşhur "Dəhnamə" poeması və didaktik məzmunlu "Nəsihətnamə" məsnəvisi ilə şöhrətlənmişdir.*

*Xətayi 23 may 1524-cü ildə vəfat etmişdir.*

## QƏZƏLLƏR

Roşən yüzin ki, zülfin olubdur niqab ana,
Nisbətdir əbr içində məhü afitab ana.

Eşqin sənin ki, məxzəni-gənci-ilahidir,
Andan durur ki, məskən olubdur xərab ana.

Eşqin nədir cahanda sənin, ey pərisifət,
Heyran durur fələkdə gəzən mahtab ana.

Uyğudə gözlərim necə görsün cəmalını,
Eşqində çünki gəlmədi bir zərrə xab ana.

Aşiqdurur yanağına zülfin Xətayi tək,
Andan düşər bu vəchilə bu piçü tab ana.

* * *

Getdi ol dilbər, bəsi dərdü bəla qaldı mana,
Nə bəla, bil kim, yüküş cövrü cəfa qaldı mana.

Bunca gəldim, mən gədayə heç inayət qılmadın,
Eşigində qaldığım dəsti-dua qaldı mana.

Müjdə gəldi dilstanimdən ki, qətl oldu rəqib,
Şükr kim, biganə getdi, aşina qaldı mana.

Anca kövkəb kimi yaş tökdi, ğəmindən gözlərim,
Yer ilə, gög ilə keyvan həm, baxa qaldı mana.

Ey Xətayi, zülfi tək arındı yüzdən Zəngbar,
Dilbəri-Çinü Xötən, xubi-Xəta qaldı mana.

* * *

Cana, könüldə həmdəm olan qəm durur mana,
Gör kim, fəraq evində nə həmdəm durur mana!

Ancaq yüzün görəndə sənin can degil məlul,
Zülfin kimi könül dəxi bərhəm durur mana.

Dil təşnə olsa vadiyi-hicrində qəm yemən,
Lə’lin zülali çeşmeyi-Zəmzəm durur mana.

Neyçün sevərdi xəstə dil, ey bivəfa səni,
Bu çox bəla ki, hicrin edər kəm durur mana.

Miskin Xətayi vəsl ilə yüz il yaşar, müdam
Bu ömr kim, zəmanədə bir dəm durur mana.

* * *

Dilbəra, eşqin tənimdə sevgili candır mana,
Pərtövi-mehri-rühun xurşidi-tabandır mana.

Dərdi-hicrindən sənin hərgiz şikayət qılmazam,
Heç əlac etmən tələb, neyçün ki, dərmandır mana.

Asitanın xakini vermən cəmii-aləmə,
Hər ayağın torpağı mülki-Süleymandır mana.

Ta cəmalın müshəfin gördüm, əya nuri-ilah,
Zikri-eşqin dildə daim, virdi-Qur'andır mana.

Ey Xətayi, xubların cövri vəfadır aşiqə,
Firqəti, hicri nigarın lütfü ehsandır mana.

Getdi ol məhru yanımdan, yüz cəfa qaldı mana,
Cövr bilmən kim, bəlayi-müntəha qaldı mana.

Ey pəri, çox işveyi-hüsninə məğrur olma kim,
Mülki-fani sanmagil kim, nə sana qaldı, mana.

Ta kim, ol xurşidrux getdi gözümdən su təki,
Göz yaşım onun üzündən aşina qaldı mana.

Sən gedəndən bərlü anca zarü əfğan etmişəm,
Yerü gög, insü mələk cümlə baxa qaldı mana.

Dilbərin getdi, Xətayi, sən nedirsən dünyanı?
Çünki can getdi, bu tən yarəb, niyə qaldı mana!

* * *

Dilbəra, ol ay yüzün xurşidi-tabandır mana,
Bağçan içindən axan su, abi-heyvandır mana.

Məscidə varmaq nə hacət dedim, ey zahid, mana,
Ruy ilə zülfi anın küfrilə imandır mana.

Müddəilər tə'nəsindən sanmanız kim, mən dönəm,
Ol mənim canım içində cani-canandır mana.

Mən səninlə söyləşəndə gər zimistan, gər bahar,
Hər nə çağ görsəm səni, aləm gülüstandır mana.

Ey Xətayi, çün sənə həqdən nəzərdir hər zaman,
Eşqin ilə bu həyatım baği-rizvandır mana.

* * *

Xaki-payin, dilbəra, bir tac dövlətdir mana,
Bəs yüzün görmək sənin bəxtü səadətdir mana.

Çün qəmi-eşqində ölməkdir həyati-cavidan,
Həq bilür ölmək deyil, ol eyni-rahətdir mana.

Munca kim, dərdündə zəhmət çəkmişəm, ey bivəfa,
Çünki səndəndir bu zəhmət, cümlə rahətdir mana.

Gərçi məndən dərhicab olursan, ey arami-can,
Yüzünü göstərdiyin eyni-inayətdir mana.

Duşdə gördi dün Xətayi, yar olubdur həmdəmi,
Ya duşumdur, ya xəyalım bu nə halətdir mana.

* * *

Ah kim sən getdin, ey ay yüzlü, can qaldı mana,
Can səninlə getdi cismi-natəvan qaldı mana.

Taki sən getdin yanımdan ey dilaramım mənim,
Haləti-vəslin könüldə pasiban qaldı mana.

Gərçi gülzari-cəmalın getdi qarşımdan mənim,
Dildə mehri-qamətin sərvi-rəvan qaldı mana.

Gər nihan oldu gözümdən ol pəri-peykər sənəm,
Göydə mah anun yüzündən bir nişan qaldı mana.

Taki səndən ayrı düşdi bu Xətayi xəstədil,
Buyi-muyin müşk ilə ənbərfişan qaldı mana.

* * *

Dust yolunda həlal olsun dila, qeyrət sana,
Qeyridən bir zərrə minnət çəkmədən rəhmət sana.

Ol sənəm əzmi-səfər etdi, könül, əylənmə kim,
Bir nəfəs didar gör kim, qalmaya həsrət sana.

Ey dilü din, siz çıxın evdən ki, dildarım gəlür,
Sən də ey can durma kim, biz vermişiz rüsxət sana.

Çareyi-behbudimi sordum müalicdən, dedi,
Dərd dərdi-eşqisə mümkün deyil səhhət sana.

Ey Xətayi, sən şəhidi-qəmzeyi-dildarsan,
Həşrdə rəşk aparır yetmiş iki millət sana!

* * *

Ey könül, sidqilə hər kim şah ilə yoldaş ola,
Yüz gərək döndərməyə hər necə kim, yol daş ola.

Yolu gər daş ola, gər yay ola, gər oxü qılınc,
Mürşidindən dönənin mə'nidə ismi laş ola.

Qul gərək tanıda öz doğruluğun həq yoluna,
E'tiqaddan azmaya gər bayü gər qəllaş ola.

Ey könül, cəhd eylə gəl doğru yola, gör şahı sən,
Aqibət qəlbi çıxar hər kimsə kim, qəllaş ola.

Ey Xətayi, sidqilə bu şah əyağinə gələn,
Aqibət bir gün gümansız xəlq içində baş ola.

* * *

Ey bəndə, gər cahanda pənahın ilah ola,
Kəmtər qulun məqamı sənin padişah ola.

Aşiq odur ki, də'vi edərsə bu sözünə,
Qanlı yaşilə çöhreyi-zərdi güvah ola.

Mehrabi var ol zahidin, amma ki, aşiqə,
Mə'şuqinin əyaği izi qibləgah ola.

Bədxahım ola cümlə-cahan çəkməzəm məlal,
Çün ol sənəm mənimlən əgər nikxah ola.

Başdan-ayağa bəndə Xətayi xətalıdır,
Zahid, xaçan ki, xubları sevmək günah ola?

* * *

Minbə'd əgər mənimlə həbib olsa aşina,
Mən canımı yolunda anun eylərəm fəda.

Gülgün yüzün xəyalına düşdü könül yenə,
Bənzim saraldı dərdilə manəndi-kəhrəba.

Darüşşəfayə getmədiyim candan ötrüdür,
Ey cismimin həyatı, ləbindir mənə şəfa.

Çeşmin cahanda fitnəvü aşub göstərir,
Hərdəm qiyaməti qoparır qamətin mana.

Yastan Xətayi, yar eşigin e'tiqadilə,
Şamü səhər də dövlətinə eyləgil dua.

* * *

Vəchində peydadır sənin ənvari-zati-kibriya,
Ol yüzə qarşuda da şərməndədir şəmsüz-züha.

Leyli cəmalından cüda Məcnun kimi sərkəştəyəm,
Fərhadvar istər könül Şirin dodağından şəfa.

Cami-müsəffadən mana saqi içirdi bir qədəh,
Sufi nə bilsin mən ol camdan necə buldum səfa.

Hər kim ki tovhid əhlidir, ol didü vadid əhlidir,
Ruzi-əzəldən ta əbəd istər kəmali-müntəha.

Mən cahilü nadaniyəm, ol hüsniçün heyraniyəm,
Ta gəncikən pünhan idim, şimdi gözümdən zahira.

Eynülyəqin həqq sirrinə idrak edən insan idim,
Ey mə’rifətdən bixəbər, insafə gəlgil bihəya.

Canü cəhani sizsizin neylər Xətayi xəstədil,
Səndən müdam ehsan dilər, çünki gədadır binəva.

* * *

Zərreyi-mehrində daim, ey cəmali-afitab,
Əbr yüzündən götürgil dutmagil məndən hicab.

Dur dedim yarin köyündən, ey rəqibi-rusiyah,
Xəstə bülbül var ikən neylər gülüstanda ğürab?

Ey gözü nərgiz, yüzü gültək, boyu sərvi-rəvan,
Ta ki səndən ayrı düşdüm, xəstəyəm halım xərab.

Cənnəti-vəslindən, ey canım, məni dur eyləmə,
Mən fəraqın atəşindən çəkmişəm dərdü əzab.

Bu Xətayi həqqinə dayim dutubdur çox ümid,
Aqibət rəhm eylə anə saəti-yovmülhesab.

* * *

Munca cövr etdin mənə, namehribanlıqdan nə sud?
Öldürəndən sonra ey can, mehribanlıqdan nə sud?

Qəhrin ilən təlx keçdi çünki ömrüm dünyədə,
Yaşım yüzdən istəyibən, şadimanlıqdan nə sud.

Bilməzəm neçün durur düşmənliyin bu növilən,
Lütfini göstərməyib, həm bu yamanlıqdan nə sud.

Çünki rəhmin yox durur, mən piri-eşqin halına,
Bu cahan bağında, ey sərvim, cavanlıqdan nə sud.

Ey Xətayi, dibərin çün kim cəfa eylər sənə,
Bivəfa aləmdə böylə zindəganlıqdan nə sud.

* * *

Fələknin gərdişindən dadü fəryad,
Məni ayırdı səndən dadü fəryad.

Məni yardan ayırdı bu zəmanə,
Zəmanə gərdişindən dadü fəryad.

Mənim iki cəhanım sevgili şah,
Səni sevməkdiyindən dadü fəryad!

Yaxam yırtım gedim əğyar əlindən,
Bu rəhmi yox dilindən dadü fəryad.

Necə biçarəvü büryan olubdur,
Xətayi yar əlindən dadü fəryad!

* * *

Qamətindən münfəildir sayeyi-sərvi bülənd,
Həsrətindən ər'əri-şümşad olubdur dərdmənd.

Arizin bağında zülfin tarinə bənd eylə, gəl
İstər isən naleyi-bülbüldən olmaq bəhrəmənd.

Sərbəsər bir tareyi-muyin bəhasidir sənin,
Mülki-Təbrizü Ciğatayü Xorasanü Xocənd.

Ta ki gəldi, ey sənəm, eşqin xəyalı başıma,
Dünyəvü üqba qəmindən keçdimü oldum ləvənd.

Canımı eşqinə təslim eylədim ixlasilə,
Ol pəri-peykər məni, yarəb nədən qılmaz pəsənd?

Dər biyabani-təhəyyür qalmışam bixurdü xab,
Valehü sərkəştəvü heyranü zarü müstəmənd.

Bu Xətayi ləblərin eşqində gər ah eyləyə,
Ahinin suzindən olur xak ol kuhi-Səhənd.

* * *

Dilbəra, mehrin əzəldən sidqilə canımda var,
Andan özgə kimsə yoxdur, həm bilür pərvərdigar.

Bu fəna darində əhli-zövqilən qılgil səfa,
Mülkü malü təxtü cah olmaz cahanda payidar.

Sayeyi-qəddində gərçi yer yüzü buldu şərəf,
Sayibani-rüf'ətindən nöh fələk dutmuş qərar.

Gəlməmişdir sən təki aləmdə, ey sultani-hüsn,
Sahibi-fəzlü kəmalü izzətü-baiftixar.

Arif isən qoymagil əldən həqiqət mənzilin,
Aqil isən dünyəyi-ğəddarə vermə ixtiyar.

Nəzmi-əş'arın Xətayi, ər biri dürdanədir,
Söyləgil ta şahların guşində olsun guşivar.

* * *

Görəli ol mah yüzün, başıma yüz sevda düşər,
Rüxlərin manəndi ancaq bir güli-həmra düşər.

Ey könül, əql əhli isən sevmə xublar yüzini,
Xubların dərdinə ancaq bu dili-şeyda düşər.

Ey sənəm, xublar içində sən düşübsən sərfəraz,
Eylə kim, bağ içrə rə’na sərvi-xoş bala düşər.

Heyf ola çeşmini cana, nərgizə nisbət qılım,
Xansı nərgiz gözlərintək məstü həm şəhla düşər?

Necə olmasın Xətayi eşq ilən divanə kim,
Könlünə hərdəm sənintək bir pərisima düşər.

* * *

Aşiq oldur kim, sözü canü dililə yar bir,
Bir durur aşiq əzəldən sevgili dildar bir.

Əhli-eşqin mə’niyi-zatü süfati bir durur,
Adəmə qıl səcdə zahid, qılmagil inkar bir.

Cümlənin halın bilən sənsən niyə bildirməyən,
Demə hər naməhrəmə gər qılmasa iqrar bir.

Olmadı bu sirrə məhrəm hər xəsisi-kəcsüxən,
Dərdimin dərmanı doğru, yar bir, əttar bir.

Pir birdir, sirr bir, iqrar bir, köftar bir,
İkilik sığmaz bu yolda, sirr ilə sirdar bir.

Sən bilirsən bəndənin halın, nə bilsin bilməyən
Birmidir, ya yüzmidir, ya minmidir, bazar bir.

Atəşi-eşqin tutuşdurdu vücudim şəhrini,
Baxaram ki, hur birdir, nur birdir, nar bir.

Sədhəzaran zülm edərsən, dönməzəm, döndərməzəm,
Yüzümü, ya sözümü, ya gözümü, ğəmxar br.

Canə minnətdir nə gəlsə ğəm yemən şükr eylərəm,
Canı verdim, başı qoydum, olmuşam bimar bir.

Məsti-eşq etdin məni, Məcnunü əmni neylərəm,
Ey susamış qanıma, nərgizləri xunxar bir.

Ömr birdir, gün bu gündür, yetsə dəm, saət deməz,
Baqi olmaz can bu təndə, fanidir, ədvar bir.

Heç günahsız bəndə olmaz, heç xətasız kimsə yox,
Sən günahın görə görgil əfv edən ğəffar bir.

Bu dükan yüz min dükandır, həq dükanıdır vəli,
Şəhr birdir, kar birdir, asılırsan dar bir.

Ey Xətayi, sən təvəkkül həqqə qılgil çəkmə ğəm,
On səkkiz min aləmə hökm eyləyən sərdar bir.

* * *

Gəl təraş et xəttini, şahi-cahan üç gündə bir,
Ta olasan afəti-dövri-zaman üç gündə bir.

Mən səni çoxdan sevərdim, bilməmişsən, ey pəri,
Öldürür aşiqini verməz aman üç gündə bir.

Çar əbru dilbəri sevdim, ğərəz qucmaq degil,
Mərhaba etsin bizimlə tək haman üç gündə bir.

İki cahan hörmət içün sufi gəlsin can ilə,
İçəlim lə’li-şərabi-ərğəvan üç gündə bir.

Ey günəş yüzlü, yüzün göstər Xətayi bəndənə.
Nur ilə dolsun zəminü asiman üç gündə bir.

* * *

Ol gedən yarımmıdır, ya ixtiyarımdır gedir,
Bilməzəm canımmıdır, ya suvlu yarımdır gedir.

Təndə canım qalmadı, anunla olmuşdur rəvan,
Ol mənim ruhi-rəvanım, ya nigarımdır gedir.

Canım andan ayrı təndə, bir dəm əylənməz mənim,
Ğəm məni eylər həlak, ol qəmküsarımdır gedir.

Qalmadı heç karü bari bu Xətayi xəstənin,
Anın ilə karü barım hərçi varımdır gedir.

* * *

Ta kim, zülfin niqabi mahtab üstündədir,
Bir bulud nisbətlidir kim, afitab üstündədir.

Gün təki yüzün cəhanə zahir olmuşdur, vəli,
Bu əcəb kim, bəndədən daim hicab üstündədir.

Eşqiniz kim, oldu bu viranə könlüm məskəni,
Gəncə bənzər kim, yeri daim xərab üstündədir.

Zahidi-gümrahi gör, divarə eylər səcdəni,
Ol günəhkar öylə sanur kim, səvab üstündədir.

Bu əcəb kim, bəndədən daim hicab üstündədir,
Oda bənzər kim, həmişə ol kəbab üstündədir.

* * *

Bütpərəst oldu könül, bütxanələr küncündədir,
Mən bilürmən bu dili-şeyda nələr küncündədir.

Gənci-eşq içün vücudim şəhrini qıldım xərab,
Nişə kim gəncin yeri viranələr küncündədir.

Yüsifi-Kən'ani salmışdır zənəxdan çahinə,
Zülfünə bağlı necə divanələr küncündədir.

Cismimi tərk etdi dil, kuyində tutmuşdur məqam,
Kim ki can tərkin qılur, cananələr küncündədir.

Nərgisi-məsti-xumarın qanımı içməkliyə,
Qaşların mehrabi ol məstanələr küncündədir.

Dürlü nəzmim həsrətindən, firqətindən ey sənəm,
Bəhri-çeşmim mə'dəni dəndanələr küncündədir.

Zahid aydır, ey Xətayi, rəxti-dəstarın xanı?
Qoymuşam meyçün girov, meyxanələr küncündədir.

* * *

Dilbəra, eşqi-ruxun daim bu can üstündədir,
Bir gülə nisbətdir ol kim, gülsitan üstündədir.

Şol münəvvər çöhrənin qatində kəmtər zərrədir,
Gərçi xurşidin məqami asiman üstündədir.

Eşqinə seyd olalı hər dəm bu canım qəsdinə,
Qaşü gözün dilbəra, tirü kəman üstündədir.

Gərçi derlər mahi-taban nur alur xurşiddən,
Nuri-hüsnin afitabi kün-fəkan üstündədir.

Dövləti-vəslin dilər miskin Xətayi hər zaman,
Xaki-payintək məqami asitan üstündədir.

* * *

Bizim ol dilrüba cananəmizdir,
Məgər ol can degil, cana, nəmizdir?

Yanarmən şəm'i-ruyin həsrətindən,
Deməzsən, ol bizim pərvanəmizdir?

Fəraqindən nə fikri vardır, ey dust,
Vüsalın hər gecə mehmanəmizdir.

Gözün sərməstdür, boyun sürahi,
Sözün noqlü ləbin peymanəmizdir.

Güləndə dişlərin ağzında, ey can,
Sədəf içindəki dürdanəmizdir.

Səri-zülfin içində danə xalın,
Könül quşinə damü danəmizdir.

Dedim: kimdir Xətayi bəndənizdə?
Dedi: bir aşiqi-divanəmizdir!

* * *

Könül bir yarı sevdi kim, pəridir,
Cahan içrə gözəllər sərvəridir!

Boyu bağ içrə sərvi-nazə bənzər,
Yanağı həmçü vərdi-əhməridir.

Yüzüdür nisbəti-xurşidi-taban,
Fələkdə mah anunçün Müştəridir.

Yüzü səhni-gülüstan içrə güldür,
Saçının buyi müşki-ənbəridir.

Kim onun vəslinə bir dəm irişsə,
Cəm'i mülki-aləmdən bəridir.

Saçının rəngidir çün leylətülqədr,
Cəmali-nuri-şəmsi-xavəridir.

Əzəldən anu sevdim canü dildən,
Sağınmasun ki, eşqim sərsəridir.

Baxıb heyran olur hüsnünə aləm,
Xətayi xəstənin ol dilbəridir.

* * *

Dilbəra, canımda dərdin bir dəva nisbətlidir,
Hər cəfa gəlsə mənə səndən, vəfa nisbətlidir.

Bu cərahət cismimə oxun dəyəndə ün verür,
Ol mənə əhlən və səhlən, mərhəba, nisbətlidir.

Gər mənə nifrin edər düşmən, mən andan ğəm yemən,
Kim münafiqdən gələn qarğış dua nisbətlidir!

Abi-çeşmimdən xəyalın hər zaman əksilməsin
Kim, anun əksi gözümdə tutiya nisbətlidir.

Eşq ilə laf etmə ey miskin Xətayi, əbsəm ol,
Kim bu mənzildə səlatinlər gəda nisbətlidir.

* * *

Novcavan ol pir ikən, dövran ki canan dövridir,
Şad ol ey xəstə könül kim, dərdə dərman dövridir.

Zülməti-hicranə söylən hökmini tərk eyləsin,
Bir günəş doğdu arayə, mahi-taban dövridir.

Lal oturma, söylə, ey can mürği, gəldi növbahar,
Getdi qış vəqti aradan, uş gülüstan dövridir.

Aşiqə mehr etdi dilbər, qalmadı cövri-rəqib,
Küfr aralıqdan arındı şimdi iman dövridir.

Ömr içün ğəm çəkmə ey dil, nuş qıl abi-həyat,
Dilbərin şirin ləbindən, abi-heyvan dövridir.

Naümid olma cahanda, ey gədayi-binəva,
Dərgahi-sultanə gəl kim, lütfü ehsan dövridir.

Möhnəti-dünyadən ey dil, fariğ ol, sürgil mürad,
Xürrəm ol, ğəm çəkməgil kim, zilli-sübhan dövridir.

Gəzməgil aləmdə sərgərdan könül, pərvanətək,
Xoş münəvvərdir cahan, şəm'i-şəbistan dövridir.

Dudi-ahindir Xətayi, göydə buludlar sənin,
Durmayıb tök göz yaşın kim, abü baran dövridir.

* * *

Yanağın ey pəri, can mənzilidir,
Bu bülbülnün gülüstan mənzilidir.

Ayağın basdığı yer, ey dilaram,
Bu mur içün Süleyman mənzilidir.

Saçının zülmətində təşnə Xızram,
Dodağın abi-heyvan mənzilidir.

Bitibdir qamətin çeşmim üzündə,
Nə xoş sərvi-xuraman mənzilidir.

Götürmə ağ yüzündən qarə zülfün
Ki, əqrəb mahi-taban mənzilidir.

Murad içün gəlibdir dil qapına,
İnayət qıl ki, ehsan mənzilidir.

Xətayi könlünə yar mehri düşdü,
İmarət qıl ki, sultan mənzilidir.

* * *

Ey müsəlmanlar, bu gün ol yari-pünhan ayrılır,
Uçdu ruhim, getdi əqlim, gövdədən can ayrılır.

Ayrılır ol yari-sərdarım, gedir, qoymuş məni,
Səd həzaran dadü bidad, bədəndən can ayrılır.

Ey könül, fəryadü nalə vaxtıdır, eylə fəğan,
Şimdi şəhrindən sənin ol şahi-sultan ayrılır.

Zar qıl bülbül kimi, çak et yaxanı gül kimi,
Şol əzəldən yari-həmdəm, əhdü peyman ayrılır.

Gözlərim, hər dəmdə mövc eylə ki, firqətdir bu gün,
Tök sədəflər dürri kim, şol gövhəri-kan ayrılır.

Dust vida' eylər mənimlən ağlaram mən zar-zar,
Gözlərimdən hər zaman gör Bəhri-Ümman ayrılır.

Ey Xətayi, tanrı sorsun bu şikəstə könlümü,
Zərd olubdur arizin, andan məgər qan ayrılır?

* * *

Ta camalın nuri çeşmimdən nihan olmuş durur,
Gecə-gündüz işim ah ilə fəğan olmuş durur.

Hüsnün ta görmüşəm, bir bülbüli-zar olmuşam,
Çün mənə kuyin məqami gülstan olmuş durur.

Bir məsəldir kim deyərlər: "Gəncin üstə mar olur",
Zülf içində hüsnin ol gənci-nihan olmuş durur.

Gər fələk yüzündə derlər: "Mahi-tabandır şərəf",
Təl'ətin yer üstə mahi-asiman olmuş durur.

Pir olmuşdu cahanda firqətindən, ey sənəm,
Ta yüzün gördü Xətayi növcəvan olmuş durur.

* * *

Ənbərin zülfinmidir, ya müşki-tatarın durur,
Köydə kovkəb əqdi həm, lö'löyi-şəhvarın durur.

Hər səhərgəh aləmü afaqı pürnur eyləyən,
Gün dəgil, ey dilbərim, ol hüsni-didarın durur.

Ruzi-məhşər qoparan cana, qiyamət qamətin,
Fitnələr zahir qılan ol çeşmi-məkkarın durur.

Tuba kim, derlər, cahanda qəddi-rəftarındır ol,
Bağı-rizvan kim, deyirlər ruyi-gülzarın durur.

Dünyəvü üqbadə hərgiz ğəm yemə əğyardən,
Ey Xətayi, çün sənin lütfi-xuda yarın durur.

* * *

Arizində sünbülün ənbərfişan etmiş durur,
Sanəsən kim, əqrəb ilə məhqıran etmiş durur.

Afərin, ol gül yanağlu dilbəri-rə'nayə kim,
Hüsn bağında boyu sərvi-rəvan etmiş durur.

Zərrəmidir bilməzəm, yaxud dəhani dilbərin,
Sün' ilən bir mumudur, yaxud miyan etmiş durur.

Qaş ilən gözmidir ol rüxsarın üstə, ey sənəm,
Yoxsa dövran fitneyi-axır zaman etmiş durur.

Ey Xətayi, ahuyi-könlün şikar etməkliyə,
Dəsti-qüdrət kim, səni əbru kəman etmiş durur.

* * *

Eşqin ey dilbər, könül təxtində şah olmuş durur,
Surətin can mülkinə xurşidü mah olmuş durur.

Eşqini könlümdə mən dəxi neçün pünhan edim,
Ruyi-zərdim, əşgi-sürxim çün güvah olmuş durur.

Müddəilərdən dəxi cana nə fikrim var mənim,
Bəndəyə çün sən kimi sultan pənah olmuş durur.

Bağçada hüsnün gülünü bülbüli-şeyda görüb,
Axdı yaşı danə-danə bənzi kah olmuş durur.

Hüsnini hər kim ki gördü valehü heyran olub,
İşi anun dünyada fəryadü ah olmuş durur.

Çün cəmalın gördü düşmən, qılmadın anə nigah,
Müddəilərinin məqami bəndü çah olmuş durur.

Bu Xətayi yüzüni ta gördü, ey xubi-Xötən,
Ol Xətavü Hind elində padşah olmuş durur.

* * *

Ey könül, vəqti-bahar ötdü, xəzan olmuş durur,
Su kənarində sənəm, sərvi-rəvan olmuş durur.

Ey fələk, dünya yüzində dövri-hicran keçdi çün,
Ol büti-namehribanım, mehriban olmuş durur.

Şərh edəndən bərlü şirin ləblərin ovsafini,
Mürği-canım tutiyi-şirinzəban olmuş durur.

Gərçi düşmən tə’nəsindən çox cəfa çəkdim, vəli,
Şükr kim, işim bekami-dustan olmuş durur.

Döşədi yüz dürlü xali bəzm içün fərraşi-sün;
Saqiya, gəl kim, cəhan baği-cinan olmuş durur.

Simü zərdən şaxlər doldurdu dəstü damənin,
Məclisi-şabaş içün göhərfəşan olmuş durur.

Uğraşanda ta ki, eşqin zərrə qılur dağları,
Bu Xətayi xəstə andan natəvan olmuş durur.

* * *

Ol pəripeykər ki, çeşmimdən nihan olmuş durur,
Baqi ömrüm olsun, ol cismimdə can olmuş durur.

Ya rəb, ol gözlər nə bağın nərgizi-şəhlasıdır
Kim, qəmindən cismü canım natəvan olmuş durur.

Eylə kim, bülbül yeri gülşəndir, ey gülyüzlü yar,
Könlümə kuyin məqamı gülsitan olmuş durur.

Anca çəkdim möhnəti-hicrin ğəmin, ey bivəfa,
Cövri-eşqindən vücudim natəvan olmuş durur.

Ta Xətayi gördi ol hüsni-cəmalın, ey günəş,
Gör necə aləm dilində dasitan olmuş durur.

* * *

Könlümü alan mənim ol dilrüba yarım durur,
Gərçi könlümni alur, amma ki, qəmxarım durur.

Necə kim, cövri-cəfa qılsan bu mən dilxəstəyə,
Eyləmən andan şikayət kim, vəfadarım durur.

Gecələr də uyxu gəlməz gözümə qan ağlaram,
Göydəki kövkəb deyil, şol çeşmi-bidarım durur.

Tanrı içün, yola gəlsən, bir qədəm ahəstə bas,
Ayağın altında topraq cismi-bimarım durur.

Bu Xətayi afitabə eylədi göydə nəzər,
Yar aydır, kim: “ana bax, əksi-rüxsarım durur”.

* * *

Dilbəra, səncəliyən billah ki, yarım yox durur,
Bir saat sənsiz mənim səbrü qərarım yox durur.

Düşmüşəm eşqin ğəminə, yet mənim fəryadıma,
Səndən özgə hiç kimsə ğəmküsarım yox durur.

Ayrılıq, billah! Sorman mən səni ey dilrüba,
Ta təmami sevmişəm, busü kənarım yox durur.

Gər məni öldürsələr, sən eylə bilgil, ey nigar,
Bu məhəbbət ətəgin əldən qoyarım yox durur.

Aqil aydır: ey Xətayi, ixtiyar əldən qoma,
Aşiqəm bir dərd əlində ixtiyarım yox durur!

* * *

Mənəm bir tən və leykin can anundur
Ki, hər kim can qıyar canan anundur.

Təbibimdir mənim, ruhum, rəvanım,
Zəifəm, xəstəyəm, dərman anundur.

Eşigində anun mən bir gədayəm,
Nə kim, lütf eyləsə ehsan anundur.

Səadət bürcünün dilxahi oldur,
Yer ilə göyü həm Keyvan anundur.

Ləbin yanında xəttin Xızrə, bənzər,
Kənari-çeşməyi-heyvan anundur.

Səri-zülfi-ləbi-lə’lini gördüm,
Təmami Türk, Hindistan anundur.

Səni sevmən deyənlər kafər oldu,
Yüzünü kim sevər iman anundur.

Məgər məşşatə zülfin şanə qılmış,
Bu könlün nikhəti-reyhan anundur.

Xətavü Misr ilən Çinü Xorasan,
Əraqü Fars həm Kirman anundur.

Başın top edə gər canan yolunda,
Çalınsın top çün çövkan anundur.

Xətayi, can fəda şol yarə qıl ki,
Cəhani cümlə cismü can anundur.

* * *

Ləblərin yadi ilə didələrim qan doludur,
Ağlamaqdan ətəyim lə’l ilə mərcan doludur.

Səri-kuyində nə ğəm nalə qılırsa dilü can,
Yüzü gül, gülşənara bülbüli-xoşxan doludur.

Kimə şikvə edəyəm, sən qaşı yayın oxudan?
Hər yana sancıla, sinəmdə bu peykan doludur.

Buyi-zülfin gətirir yadinə badi-səhəri,
Canü dil bağçasında müşk ilə reyhan doludur.

Ey Xətayi, özünü xak edə gör, pak olasan,
Mənlik etmə ki, cahan əhlinə ürfan doludur.

* * *

Mənim ol suvlu yarım gəldi xoşdur,
Əlimə ol nigarım gəldi xoşdur.

Əlindən itxiyarın getsə getsin,
Əlimə ixtiyarım gəldi xoşdur.

Sən ol səhrada çün quli-biyaban,
Çəməndə gül’üzarım gəldi xoşdur.

Öl imdi qış günü, sərma əlindən,
Mənim tazə baharım gəldi xoşdur.

Qəm ilən intizar içində sən öl,
Həmişə intizarım gəldi xoşdur.

Xətayi, şükr qıl Allaha daim,
Gedən səbrü qərarım gəldi xoşdur.

* * *

Ta kim ol ahu gözün mülki-Xötəndən bac alur,
Şol hümayun zülfiniz fəğfuri-Çindən tac alur.

Nola gər hüsnindən alsa zərreyi-nur afitab,
Kim bəli, daim ğənilərdən nəva möhtac alur.

Nə əcəb, mən miskinin könlün əgər yəğma qıla,
Hinduyi-zülfin ki, mülki-Rumidən tarac alur.

Ta əyağın tozu tək qapunda məskən dutmuşam,
Bu səadətdən mənim bəxtim mələkdən bac alur.

Bu Xətayi Kə'beyi-kuyində tapmışdır şərəf,
Hacıtək könlüm təvafi-kuyinizdən hac alur.

* * *

Ey könül, ol mə'nisiz cahili yar etməkmolur?
Mə'nisiz cahil sözünə e'tibar etməkmolur?

Həm anun qövli xətadır, həm qərari bivəfa,
Öylə bir bədnam ilə qövlü qərar etməkmolur?

Xakpayi əhli-dil ol, olmagil cəhlə rəfiq,
Çün əbabil var ikən zaği şikar etməkmolur?

Cəhlini ürfan edəndə xaki nay olgil ana,
Əhli söhbət görəcək andan kənar etməkmolur?

Hər kəs öz eybilə səttarına tutmuşdur yüzün,
Sən anun eybini açıb, şərmsar etməkmolur?

Bir neçə vəqt yar olub, bir kimsənin eybin tutub,
Sən anun gizlicə sirrin aşikar etməkmolur?

Ey Xətayi, can fəda qıl bir vəfalı yar içün,
Hər vəfasız bivəfanı ixtiyar etməkmolur?

* * *

Bu könlüm şad olur qəmdən, ruxi çün laləgun görgəc,
Misali-mərdi-müflis nagəhan bir yaxşı gün görgəc.

Əgər ah eyləsəm topraq olur dərləhzə ahimdən,
Düşər hər parəsi bir yerdə kuhi-Bisütun görgəc.

Anunçün əyləməz ahi bu canım rəhgüzarında,
Həramilər çaparlar karivani çün tütün görgəc.

Məhü səyyarələr şərməndədir yüzünə baxmaqdan,
Fələk ovcində xurşidi həyadan sərnigun görgəc.

Xətayi, rəsm beylə eyləyibdir e'tiraz ilə,
Həzaran naz edər xublar ki, aşiqni zəbun görgəc.

## DƏHNAMƏ

(*parçalar*)

BAHARİYYƏ

Qış getdi, yenə bahar gəldi,
Gül bitdivü laləzar gəldi.
Quşlar qamusu fəğanə düşdü,
Eşq odu yenə bu canə düşdü.
Yer geydi qəbayi-xizrpuşan,
Cümlə dilə gəldi ləbxamuşan.
Sərvin yenə tutdu damənin su,
Sərv üstə oxudu faxtə gu-gu.
Qönçə dəhəni çəməndə xəndan,
Gülməkdən ənar açıldı dəndan.
Bülbül oxudu süfati-hicran,
Dəryada dür oldu əbri-neysan.
Durna uçuban həvayə düşdü,
Laçın oluban ovayə düşdü.
Alma ağacı dibində sayə,
Tə’n eylər idi buludda, ayə...
Yaşın yerə tökdü əbri-neysan.
Bülbüllər oxudu səd həzaran.
Mey bəslədi jalə hər vərəqdə,
Turac kitab oxur təbəqdə.
Qum-qum der idi ağacda qumri.
Məst oldu bənəfşə içdi xəmri.
Şax üstə qabaqlar aslı halı,
Qu gərdənidən verir misalı.
Quş beççələri ünü yuvadən
Məktəb ünü tək gəlir həvadən.
Boyandı zəmin həzar rəngə,
Övraqi-şəcər də təngə-təngə.
Neylufər açıldı suya girdi,
Pirahənini başına bürdi,
Çinar əlini çü rəqsə açdı,
Gül xırda zərin şabaşə saçdı.
Çaylar bulandı, yıxdı arxın,

Bağlar ağacı göyərtdi şaxın.
Gilas ağacı dibində mahüm.
Çün mah idi dər miyani-əncüm.
Yüz dürlü qəba geyib çəmənlər,
Ağ donunu geydi yasəmənlər.
Sirabi gülün yüzündə abi,
Nərgiz oturar gözündə xabi,
Hər qönçədə vərdi-ərğəvani,
Qumri gəzidən verir nişani.
Ta çalmaya dan yeli tapancə,
Yüzünə niqabin örtdü qönçə.
Yaşıl çəmən üstə jalə çin-çin,
Əxzər fələk üstə rəşki-Pərvin.
Sərv etdi çəməndə sərfərazi,
Gül cilvələnir başında nazi,
Çıxmış budaq üstə əndəlibi,
Minbərdə oxur çəmən xətibi.
Cular axadır çəməndə hər su,
Nərgiz gülünün gözündə uyxu;
Lalə oturur başında tacı,
Heç sərvərə yoxdur ehtiyacı.
Sünbül daramış saçın, bəşanə,
Ənbər qoxusun qılır fəşanə.
Cular axadır kənari-bağdan.
Su içməyə ahu gəldi dağdan.
Lalə gecələr yaxub çırağı,
Aşiq cigərinə çəkdi dağı.
Naz ilə bəzəndi bağ sərvi,
Sancıb başına dümi-təzərvi.
Güllər vərəqinə doldu şəbnəm,
Çün birkəyi-hovzi-abi-zəmzəm.
Al ilə yaşıl geyindi bağlar,
Ağ ləçəyi sərpə saldı dağlar.
Susən qılıc aldı, bid xəncər
Eyş etməyənin gözünə sancər...
Sayrar ağac üstə yüz sığırçın.
Ahəng tutar ana gökərçin.

Əsməkdə nəsimi-ənbərəfşan.
Yaprağnı qılır budaqda lərzan.
Ötgün quşu köçdü, qıldı pərvaz
Düravü üqabü qupqura, qaz
Murçinü çürəvü nərgə, sona,
Yaydı qanadın ki, gölə qona.
Kəklik gülər idi dağda qah-qah,
Bayquşlar oxurdu "li məllah".
Sərv öz ayağına sayə salmış,
Zilli-saçını hümayə salmış,
Novruz gülünün açıq dəhanı,
Mürğ anda həzar oxur zəbanı.
Daylar tülədi, buraxdı yalı,
Kişnər çalağan qulun misalı.
Quzladı qoyun, töküldü döllər,
Yaylaq həvəsini qıldı ellər.
Düşmən qanı tək qızardı hər su,
Ötgün saruya yeridi ahu.
Biri-birini qovur keyiklər,
Bala dölümün qılır peyiklər.
Durmuş çəmən üzrə sərv ayağa,
Qılmağa tamaşa solu-sağa.
Gül düxtərinin ərusi yetmiş,
Gülgün duvağın başına örtmüş,
Ahu quzu doyurub uyutdi,
Oğurlanıb özü ota getdi.
Səhrayə buraxdı nafə ahu,
Xaki-siyəh oldu müşki-xoşbu.
Durna uçub, ün çəküb havadə,
Gedər ünü qırx ağac ziyadə.
Bağrıqaranın qarardı bağrı,
Şahbaz ana varanda doğrı.
Quşlar yuvadan uçurdu bala.
Ahu yenə süd verir qəzala.
Çıxdı günəşə yer əjdahası,
Buynuzunu saldı dağ buğası.
Hər bir çiçək üstə qondu zənbur,

Dövşürməyə çıxdı danəsin mur,
Hər şey günəşə qurutdu yaşın,
Qövsi-quzeh açdı tər qumaşın...
Yaprağı ağaclar üstə lərzan,
Kimisi çü tir, kimisi peykan.
Şəh tuti oxur şəkər kəlamın,
Qənd ilə pür etdi bəndü damın,
Döndü vətəninə cümlə quşlur,
Gəldi yuvasına qırlaquşlar.

## AŞİQİN ƏHVALI

Aləm qamusu bu dəmdə xoşhal,
Mən həm öz işimdə fariğülbal.
Gəh yüyrür idim çü ahu dağda,
Gəh axər idim çü cuy bağda.
Gəh könlüm ilən çəməndə xürrəm,
Gəh həmdəm ilən gəzəndə biğəm
Mə’şuq ilə eşqi tanımazdım,
Heç kimə könül verim deməzdim.
Derlərdi bu eşq qissəsini,
Dil zərrə yeməzdi qüssəsini.
Öz peşəmə, öz işimə qane,
Heç kimsə yox idi ola mane.
Kim desə mənə ki: “aşiq oldum,
Rüsvayi-dili-xəlayiq oldum”,
– Əbləh, – deyibən gülərdim ana,
Hər tə’nə ki, var qılardım ana,
“Gey əbləhü kəcxəyalü biəql!
Bu sözmüdurur ki, eylədin nəql?
Ol oda salamı canı kimsə,
Qeyrə vərəmi inanı kimsə?”
Çün düşməmiş idi dil bu qalə,
Yüz tə’nə qılırdım əhli-halə.
Yanmayan oda nə bilir odi,
Başdan çıxarır düşəndə dudi...

Məcnun ögünə düşəndə Leyli,
Gözdən axıdırdı qanlı seyli.
Fərhada deyəndə eşqi-Şirin,
Eylərdi fəğani-zəhri akin.
Əlqissə, bu sözü bilməz idim,
Üşşaqi gözümə almaz idim.
Bir gün çəmən içrə seyr edərdim,
Pərvanə misali teyr edərdim,
Bir sayeyi-sərvi-nazə yetdim,
Bir ləhzə oradə xabə getdim,
Ruhaniyə ruh qıldı seyran,
Gəl gör ki, mənə nə qıldı dövran.
Göründü gözümə bir pəriru,
Xoşləhcəvü xoşcəmalü xoşbu.
Çün seyr ilə gəldi mənə yetdi,
Canü könül aldı, belə getdi.
Hüsni-sifətin nə qılım anın,
Nuri fələyin, gözü cəhanın
Xoş qaməti rəşgi-sərvi-rə’na
Haşa ki, yüzündə dudi-həmra
Qaşları kəman, kipriyi ox,
Aləm gözü qatda nərgizi-şux.
Nə şəkli-pəri, mələk, nə insan,
Rövşən yanağında nuri-rəhman.
Oldum bəmisli-divanə bidar,
Nə məstü nə aqiləm, nə huşyar.
Bilmən özümü ki, qandayam mən,
Ya mürdəmi, yoxsa zindəyəm mən.
Bağrım yaralı, misali-lalə
Qəmdən ürəyim dolu piyalə.
Sona kimi göz yaşında qərqab,
Səyyarə kimi dü çeşm bixab.
El lalə təki piyalə nuşan,
Susən kimi mən zi ləbxamuşan.
Göylərdə sədayi-əbr ünüm tək,
Aləm gözümə qara günüm tək,
Bağlarda nəsim ənbərəfşan,

Sünbül təki mən könül pərişan.
Gər dağda əgər çəməndə idim,
Heç bilməz idim ki, qandə idim.
İşim gecə-gündüz ahü zari,
Tutmazdı dəli könül qərari,
Nə fikri-yemək, nə xab dər çeşm,
Xabın yerin aldı ab dər çeşm,
Nə ab gözümdə, bəlkə xunbar,
Qan doldu yaşımla kuhü gülzar,
Bülbüli fəğanım eylədi lal,
Boynuma səlasil oldu əğlal.
Uzun gecələr səhər görünməz,
Zülmətdə mənə qəmər görünməz
Bu yola, ilahi, yoxmu payan?
Bu dərdə, ilahi, yoxmu dərman?
Biçarəvü zarü natəvanəm,
Mən taqəti-qəm nə mitəvanəm.
Yar zülfü təki günüm qaraldı,
Yar ağzı kimi yerim daraldı.
Qanlar uduram yüzündə ayru.
Bimartənəm gözündən ayru.
Bilməm necədir kəminə halım,
Artar dünü gün qəmu məlalım,
Səbrim səbəbini pişə qıldım
Ki, mən bu xəyalı nişə qaldım?
Qıldım könülə həzar nifrin,
Kim şad ikən etdi bizni ğəmkin.

## ÜRƏKDƏN ŞİKAYƏT

Ey eşqə özün fəda qılan dil!
Əz səbr məni cüda qılan dil!

Üşşaqi cahanda xürrəm ikən
Pürmöhnətü pürbəla qılan dil!

Məhbubi-xocəstə, zülfi-çinin
Bəndinə düşüb, xəta qılan dil!

Dilşadları könül gözündən,
Qəm kuyinə aşinə qılan dil!

Xoşxatir ikən fərağət əhli
Dərdü qəmə mübtəla qılan dil!

Yüz dürlü bəlayi-eşqə hər dəm,
Könlün veribən, riza qılan dil!

Bir busəsinə gözəl nigarın,
Can ilə cahan bəha qılan dil!

Sidqi-dil ilən yolunda yarın,
Öz ölməyinə dua qılan dil!

Mə’şuqədən alsa qərz busə,
Canü sər ilən əda qılan dil!

Bir zərrə təki günəş yolunda
Yüz min həvəsü həva qılan dil!

Yarın diləyib bəğai-ömrün
Öz varlığını fəna qılan dil!

Yüz hökmilə şah ikən Xətayi
Yar eşiginə gəda qılan dil!

## MƏSNƏVİ

Bu növ ilə iş kim, oldu bədhal,
Hər ruz mənə keçirdi bir sal.
Naləm gecələr olurdu yahu,
İncəldi tənim misali-yek mu.

Həm yox mənə bir rəfiqi-həmdəm
Kim, eyliyə bu yarama mərhəm.
Həm səbrü qərarə taqətim yox,
Həm daxi kişiylə ülfətim yox.
Yüz tutdum ilah həzrətinə,
Ol cümləyə şah həzrətinə.

## HAQQA YALVARIŞ

Dedim ki, əya kərimi-biçun,
Qoyma məni sən bu halə məğbun.
Bu eşqə məni düçar qıldın,
İşimni fəğanü zar qıldın.
Bu mur gəzərdi binəva tək,
Eşq ağzına saldın, əjdaha tək.
Lütf eylə məni-fəqirə bari,
Öldürmə qəm içrə zar-zari.
Odu buraxan bu canə sənsən,
Məqsudi verən cəhanə sənsən.
Məqsudə yetir məni-fəqiri,
Sənsən qamunun çü dəstgiri.
Ya hicri mənə vüsal qılgil.
Ya həsrəti bu könüldən algil!
Bu növ ilə kim, niyaz qıldım,
İxlas ilə kəşfi-raz qıldım,
"Hatifdən eşitdi güşim avaz:
"Key[1] sidq ilə eşq evində sərbaz,
On könlün alan gözəl pəridir,
Gülzari-cinan onun yeridir.
Oldur oturur filan çəməndə,
Çün sərvi-çəmən, çü qönçə xəndə.
Cövlanda durur qamu pərilər,
Güntəl'ətü mahpeykərilər.
Dur, imdi onun saru səfər qıl,

[1] "Ki ey" deməkdir.

Fərxəndə cəmalına nəzər qıl,
Çün görə gözün ruxi-dilaram,
Ol vəchlə tuta könlüm aram.
Kim ayrılıq atəşi-səqərdir,
Əlqürb civari-mö'təbərdir.
Göz görməsə dil götürməz aram
Kim, gözə verir məhəbbət ilham.
Şayəd səni hər görəndə ol yar,
Könlündə mürüvvət edə izhar.
Canın məgər onda bula rahət,
Didarə baxıb edə qənaət".
Bu sözə həzar şükr qıldım,
Varmağa yolumu fikr qıldım.
Yarəb, mənə sən o yarı vergil,
Əğyardan ayru yarı vergil.

## AŞİQİN MƏ'ŞUQƏYƏ TƏRƏF GETMƏSİ

Ol gülşəni soruban yeridim,
Yarəb, nə ola işim, der idim.
Hərdəm ürəyim qılırdı tıp-tıp,
Canım zi həvəs edərdi gup-gup.
Özümnü yetirdim anda nəçar,
Ol bağa ki, bəzm edərdi dildar,
Bir şəkl göründü bir şəmail,
Huşim bilə əqlim oldu zail.
Gün kimi cəmalı tab salmış,
Zülfün yüzünə niqab salmış.
Yüz hurü pəri, həzar ğılman,
Qulluqda durur mütii-fərman.
Sərv anun içün ayağa durmuş
Xublar qamu solu sağa durmuş.
Gül yüzü qızarmış infialdan,
Bənövşə yerə baxır məlaldan,
Nərgizlər önündə cam tutmuş,
Bülbüllər oxur, nizam tutmuş.

Əflak yüzündə kaxü eyvan.
Bərtəxti-səradə bürci-Keyvan.
Gül yastanuban nigar oturmuş,
Qanlardan əli nigar oturmuş.
Əz bərgi-səmən səriri-təxti,
Gül kimi güşadə ruyi-bəxti.
Məhlər qamusu ayağa durmuş,
Kimi sola, kimi sağa durmuş.
Çakərlər içində şahnisbət.
Kövkəblər içində mahnisbət.
Şahlar qamusu yanında növkər,
Yusif yüzünə qulami-kəmtər.
İskəndər ana bir ayinədar,
Darab qatında bəndəkirdar.
Cəmşid anun piyaləgiri,
Cəm bəzmi-şərabının əsiri.
Yüz qeysər ana qulami-Rumi,
Rüxsari günəşmi, yoxsa rumi?
Ənguştəridar ana Süleyman,
İnsanü pəri sözünə fərman.
Bir zərrə yüzü qatında xurşid,
Bir ləm’ə cəmal yanında Nahid.
Peyvəstə qılır itabü nazi,
Dəstində inani-sərfərazi.
Durdu, yeridi çəməndə rə’na,
Başından əyağə candır ə’za.
Gül qönçəsi tək niqab yüzündə,
Məh kimi həzar tab yüzündə.
Heç kimsə anun yanına varmaz,
Heç mərdum anun yüzüni görməz.
Doğru baxanın alırdı canın,
Gözü görənin tökərdi qanın.
Çün gördüm anu bu səltənətdə
Eyvani-kəmali-mənzələtdə.
Vəhşət ətəyini tutdu könlüm,
Öz halətini unutdu könlüm,
Dedim ki, diriğ neyləyim, ah

Mən zərrə ilən nə nisbət ol mah?
Ol göydə yerir, bəndə bər xak,
Bu xak nəçük yetər bə əflak?
Mən bir qulam, ol bir ulu sultan?
Sultan ilə qul məqami qandan?
Bu gücləri mənə eşq qıldı,
Bu vərtəyə canı eşq saldı
Fəryad ilə ah eşq əlindən!
Ömrü oldu təbah eşq əlindən!
Eşqi anuban şikayət etdim,
Qəm şərhini bi nihayət etdim.

## EŞQ ODU HAQQINDA

Eşq odu yamandır, ey xirədmənd,
Bu bənddə dolaşmagil, eşit pənd!
Eşq uğraşır olsa kuhi-Qafə,
Ənğa qıla Qafə irtihafə.
Gər eşqi görərsə nöh fələklər,
Çərx üzrə fələk yana mələklər.
Gər eşqin odu düşər zəminə,
Suzi yetə ərzi-həftominə.
Bir zərrəcə eşq canə düşsə,
Ya rəglər içində qanə düşsə.
Bir dəm tən içində durmaya can.
Həm rəglər içində xüşk ola qan.
Gər atəşi-eşq başə düşsə,
Bir zərrəcə suzi daşə düşsə,
Qatlanmaya ana, çatlaya daş,
Meydani-həvadə oynaya baş.
Gər atəşi-eşq dilə düşsə.
Bir qətrəcə bəhri-Nilə düşsə,
Bir ləhzədə oda yana dillər,
Hirqətdə quruya bəhri-Nillər.
Gər eşqin odu düşərsə bəhrə,
Səbr etməyə bəhr, uş bu qəhrə.

Ol oddur odu çıxardı daşdan
Əqli gəlicək apardı başdan...
Uğraşdı ol od bə qəlbi-Məcnun.
Fərhadı qəm ilə qıldı məhzun.
Vətfindən anun yetərdi neylər,
Fəthadə son ucu gör ki, neylər?
Oldur ki, ana sataşdı Həllac,
Mahmud misalı sahibi-tac,
Bir darə birini mənzər etdi,
Bir qula birini çakər etdi.
Oldur ki, ana yaxıldı Yə'qub,
Həm çəkdi anun bəlasın Əyyub.
Ağlatdı birini, kur qıldı,
Birin bu yola səbur qıldı.
Bu oda sataşdı Şeyx Sən'an.
Həm cani-Züleyxa Misrə sultan.
Ol birini kafər etdi bi din,
Ol biri şah ikən oldu miskin.
Bu eşqilə kim, əsir oldum,
Dər vəqti-cəvani pir oldum.
Qalmadı dəxi tənimdə taqət,
Qəsd etdi mənə hücum firqət.
Eşq oduna bir rəvayət etdim,
Adın tutuban şikayət etdim.

## EŞQDƏN ŞİKAYƏT

Ey canü dili xərab edən, eşq,
Üşşaqi kəm əz türab edən, eşq!

Odlara salıb fərağət əhlin,
Yaxıb cigərin kəbab edən, eşq!

Mə'şuqə müdam içmək içün,
Dillər qanını şərab edən, eşq!

Divanələrin tutub təriqin,
Tərki-vər'əü səvab edən, eşq!

Bir zərrə təki vücuda düşsə,
Məşhur çü afitab edən, eşq!

Dünyada hər əhli-xanimani,
Bi məskənü xürdü xab edən, eşq!

Zöhd əhli sual edəndə hər dəm,
Min höccətə bir cavab edən, eşq!

Mə'şuqə saruyə baxsa aşiq
Bəxti-siyəhin niqab edən, eşq!

Hər dəmdə Xətayi xəstəhalə
Səd naz ilə min itab edən eşq!

## SƏBANIN YATMAĞA GETMƏSİ

Dedim ki:
– Əya qamudan ulu,
Oldu bu sözə könül təsəllu.
Əzm etdi həvəs ki, yazə namə,
Baş qoydu günəş məqami-Şamə.
Xurşid çü məğribinə batdı,
Bəs vardı Səba yerində yatdı.
Qövl etdi mənə ki:
"Dan atan çağ,
Bülbül budağa qonub ötən çağ,
Olmuş ola namə cümlə təhrir,
Hər ərzə ki, var içində təğrir.
Gəlim, aparım anı nigarə.
Başəd ki, ola bu dərdə çarə".
Ol getdi vü mən də bağda qaldım,
Məcnun kimi dəştü dağda qıldım.
Aldım qələmi ki, namə yazım,
Əhvali-dilim kəlamə yazım.

## MƏSNƏVİ

Ol şuxə ki, can olurdu Fərhad,
Şirin dodağından aldı yüz dad.
Ol yarə ki, əql olurdu Məcnun
Uş Leyli saçına oldu məğrun,
Pərvanə idi o şəm'ə bu can,
Bir tabi-rüxündən oldu büryan,
Ol mahə ki, can müştəridi,
Vüslət gecəsində xoştər idi.

* * *

Təhsinim edirdi ol pəriru:
– Çəkdinmi fəraqi-dərdi qayğu?
Zar etdi səni bu ruyi-çün gül.
Gül görməsə səbr edərmi bülbül?
Bir baddə qurur zi tabi-hicran,
Gər içməsə səbzə abi-baran.
Halın nə ləbimdən ayrı, miskin?
Fərhad ölür zi dərdi-Şirin.
Pərvərdə olurmu cismi-bi ruh
Olmasa gəmisi, qərq olur Nuh.
Gər hicr yüki düşər bəirə.
Kafər qaçan uğruşur səirə?
Gər yükləsə hicr odun cibalə,
Çoğundan olur zühur nalə.
Gər girqəti salsan asimanə,
Göylərdə mələk cəmisi yanə.
Hicran odu gər düşə zəminə
Yandıra zəmini-həftominə.
Gər hicran odu düşərsə bəhrə,
Bəhr ola çü bərr dü şəb bə qətrə.
Gər olmasa firqəti bəla, bil
Olmazdı həzar nitqə qabil.
Pərvanə əgər fəraqə yanmaz
Qəltan oluban oda dolanmaz...

Məndən sorar idi yari-cani,
Sevməkdə qılırdı imtahani.
Derdim:
– Mən anı nəcük qılam ədd,
Sevməkdə səni qılamazam hədd.
Yanımda həzar pür olursa,
Yüz işvəvü naz əgər qılursa,
Hər birində səd girişmə bolsa,
Alışma ilə verişmə bolsa
Bir dərdü xəyalın olsa dildə,
Ya mehrü cəmalın olsa dildə
Qılmayam olara könlü mayil,
Olmaya yüzün xəyali zayil.
Hər gözüm olursa yüz göz,
Bir yüzüm əgər olursa yüz yüz,
Səndən kəsəmən o gözlərimni,
Sallam ayağına yüzlərimni.
Hər əldə həzar barmaq olsa,
Birində həzar dırnaq olsa,
Yazar sifətin həzar barmağ,
Pak edə qələmni nöki-dırnaq.
Hər payim içün gər olsa yüz pam,
Səd dəst ola gör bu dəsti-yektam,
Eşqinsiz oları basmasaydım,
Daməndən əlimni kəsməsəydim,
Bir ağzıma gər olaydı yüz dil,
Bir qəlbim əgər olaydı min dil,
Bular sifətin sözün deyəydi,
Olar qəmi-eşqiniz yeyəydi.
Bir başda həzar başım olsa,
Hər gözdə həzar yaşım olsa,
Başları yolunda oynadaydım,
Yaşları sənə nisar edəydim.
Bir təndə həzar ruhum olsa,
Hər birinə əmri-Nuhum olsa,
Ruhumu qılam qaşuna qurban,
Cismimni qılam türabə yeksan...

Ol gecə nə oldu yar ilən hal,
Dilim deyəməz süfati-əf'al.
Zövqü tərəbü hüzurü vəhdət,
Əfsaneyi-hicrü qövli-həsrət.
Qorxardı bu könlüm öz səhərgah,
Pozmaya gəlib hüzuri nagah...
Yarəb, uzun eylə leyli-vəsli
Üşşaqə budur muradi-əsli...
Xurşidi mudam dər hicab et.
Əşya gözündən götürmə xabi,
Aşiq qılır andan ictinabi.
Bu sözdə idim nigar dərbər,
Oxudu müəzzin "Allah əkbər",
Dedim ki, diriğ, gecə keçdi,
Heç biləmədim ki, necə keçdi.
Baz oldu fəraq ruzi-vüslət,
Kam almadı dil bə vəqti-fürsət.
Ah eylər idim ki, düşməyim dur
Uyxudan oyandı çeşmi-məxmur,
Aydır:
– Nədir, ey vüsalə məhrəm,
Ahın nədir, ey yanımda həmdəm?..
Dedim:
– Nə sorarsan, ey pəri cəhr,
Anla gün irişdi, dər şəbi-mehr.
Gecə irişir həbibə məhbub,
Talib gecə buldu kami-mətlub...
Vəh-vəh ki, tükəndi və'deyi-vəsl
Görsəndi mənə bu ruzi-bi vəsl...
Matəmdə idim ki, ayrılım, ah,
Görsətdi yüzün gün əz nəzərgah.
Xavər şəhi yaxə çak qıldı,
Göylər təbəqini pak qıldı.
Pak etdi günəş yüzünü əz xun,
Qoşdu atını bu çərxi-gərdun.
Göy qubbəsindən asıldı qəndil,
Yüzündən alıb niqabü məndil,

Göylər qədəmində rəqsə düşdü,
Səyyarə şüai nəqsə düşdü.
Çin ləşkərini dağıtdı zülmət,
İslam çərisini etdi də’vət.
Hər Müştəri oldu ona Zöhrə,
Rəqs etdi bu bəzmə çərxi-mehrə.
Hər gündüzə xəlq müştəriydi,
Əmma mənə gecə xoştər idi.
Çün gün doğuşu buraxdı təl’ət
Mən xəstəyə yenə düşdü firqət,
Həzl eylədim ol dəm afitabi
Kim, nişə götürdü bu niqabi.

## GÜNƏŞ HAQQINDA ŞE’R

Çıxdı yenə mənə zur edən, gün!
Məsturləri zühur edən gün!

Bu sirri cahana söyləməzmi
Hər zərrəni pür zi nur edən gün!

Xəffaşi-şikəstə ruzə aşiq
Çeşmin həsəd ilə kur edən gün!

Gər düşməz araya şəb niqabi,
Firqətdə vücuda zur edən gün!

Olmuşdu Xətayi yarə vasil,
Yardan yenə onu dur edən gün!

## MƏ’ŞUQƏNİN AŞİQİ YOLA SALMASI

Düşmən, – dedi dust, – dər kəmindir,
Vəslim günü bu idi həmindir,
Bir busə mənə verib pərizad

Dedi:
– Bu sənə yetər, yeri şad,
– Yar etmə, dedim, bizi fəramuş!
Durdum ki, gedəm nizarü bihuş.

## VİDA ŞE'Rİ

Ey sevgi nigar, sən qal imdi!
Ey işvəli yar, sən qal imdi!

Vəslindən irağ ahü vaylı,
Dilxəstəvü var, sən qal imdi!

Hicranın odunda gecə-gündüz
Dil yenə yanar, sən qal imdi!

Ğəm qışı mənə cəfalar eylər,
Ey tazə bahar, sən qal imdi!

Umar bu Xətayi yadigarın,
Ta tuta qərar, sən qal imdi!

## MƏ'ŞUQƏNİN AŞİQƏ YADİGARI

Der:
– Var, belədir səninlə qayğu,
Qan-yaş ilə ruyü rəngi saru.

Bəd halətə düşmə çünki vardır,
Biləncə, xəyali-ruyi-niku.

Tiği-ələm iki bölsə cismin,
Yarusı mənimlə, səndə yaru.

Qılma məni cüsticu ki, bəsdir,
Çeşmində xəyali-yari-dilcu.

Bu ahu gözümdən ayrı düşsən
Var həmnəfəsin qəm ilə yahu.

Bu incə belim qəmi Xətayi
Yetməzmi tənin misali-yek mu?

## AŞİQİN HALALLAŞMASI

Xoş qal – dedim – ey həbibi-canan,
Bu mürdə tənim içində çün can.

Çox tökdün isə həlal bolsun,
Afət bıçağilə didədən qan.

Cəm olmadı dil qəmində vəh-vəh,
Ey zülfü mənim təki pərişan.

Sən min yaşagil bə kamirani,
Mən ölür isəm nə qəmdir, ey can?

Su səpdi yügüş qapında hər dəm,
Eşqin yoluna bu çeşmi-giryan,

Bağrımla gözüm yaşı evində,
Çox oldu gözün, nəmək yedi nan.

Bu xəstə Xətayi yad qılma,
Zinhar, unutma əhdü peyman.

## DOST AYRILIĞI

Çün oldu tamam nəzm, təkmil,
Vəsl oldu haman fəslə təbdil.
Səndən necə kim, can ayrü düşdü,
Tən ya çürüdü, ya sayru düşdü.

Ölüncə unutman ol həbibi,
Gül bəs unudarmı əndəlibi?
Təqdirə var isə ola tədbir
Yox isə nə çarədir bə təqdir?
Hicrində çü zadü nun keçdi,
Sindən dəxi bir füzun keçdi
Çün sərvəri-Çin irişdi şamə,
Xətmində mükəmməl oldu namə.
Xətm oldu bu namə ruzi-şənbə
Eşqilə həmişə suzi-şənbə.

## KİTABIN XATİMƏSİ

Yarəb, irağ etmə cismü cani,
Heç bəndəyə verməgil sən ani.

Sanma bu sözü bəyani-vaqe,
Sözdür qamusu bə sərzəbani.

Vəslin dilərəm vəfalı yarın
Kim, fanidurur məcaz, fani.

Çox nəstə sifətdə zahir olmaz,
Görsət yüzünü bizə nahani.

Bu fəni ömür cahanda qalmaz,
Bəxş et bizə ömri-cavidani.

Bu dari-cahan çü bir fənadır,
Vergil bizə xaneyi-bəqani.

Üç nəsnə dürür səbəb bu namə
Kim, buldu zəruri qılmaq ani.

Əvvəl səbəb oldu nəzmi-tovhid,
Kim bəndəliyin odur nişani.

İkinci bu kim, olanda ğəmgin
Bu könlünün ola mehribani.

Üçüncü bu kim, qalursa xoşdur
Bu dünyada hər kimin nişani.

Ta deyə onu görən mühüblər,
Rəhmətlik ola anun rəvani.

Hər kim ki, bizi anarsa bulsun,
Dər bürci-səadət aşiyani.

Kim munu oxur yazar və dinlər,
Həq lütf ilə yarlığasın ani.

Kiməm ki, Xətayiyəm, deyim mən,
Əhsənət, təbarük, ey filani!

# XƏLİFƏ

*Təbrizli Xəlifə gənc yaşlarında Diyarbəkrə gəlmiş, təhsilini orada davam etdirmişdir. Sonralar Hələb, Şam şəhərlərini gəzmiş, nəhayət, İstanbula getmişdir. Doğulduğu və öldüyü il məlum deyildir*[1].

*Haqqında ilk məlumatı müasiri Bağdadlı Əhdi vermişdir. O,1563-cü ildə bitirdiyi "Gülşəni-şüara" adlı təzkirəsində Xəlifəni oxuculara dövrünün tanınmış şairlərindən biri kimi təqdim edir, alim və hörmətli bir şair olduğundan söhbət açır, onun üç dildə gözəl şeirlər yazdığını, xüsusən Nizami mövzularında "Xəmsə" yaratdığını qeyd edir.*

*Məşhur türk biblioqrafı Katib Çələbinin əsərində isə onun "Xosrov və Şirin", "Yusif və Züleyxa" və "Leyli və Məcnun" əsərlərinin adı çəkilir. "Leyli və Məcnun"un hələlik tək nüsxəsi məzhur türk alimi Agah Sirri Ləvəndin şəxsi kitabxanasındadır.*

Var farsda bu fəsand, amma
Ətrakda olmamış müsəmma.
Türkidə həman demiş Füzuli,
Fəzlə dəxi eyləmiş duxuli,
Der şimdi bu türkuyi Xəlifə
Sən qoy necə surəti-lətifə.
Aləmdə Nəvai kimi bu hin,
Ver türki dilinə bir nov' ayin.
Yoq türki dilində bir misalün,
Məşhur ərəbdədür məqalün.
Hüsni-əcəm et bu türkiyi sən,
Əlfazi-ərəbdən eylə əhsən.
Fürsi-ərəbidə sənsən ustad,
Türkicə bu nəzmi eylə bünyad.

* * *

Söz bəhrin aşin olanlar,
Ümmani-məaniyə dolanlar.
Hər biri məarifilə duya,
Ənvari-lətaif ilə guya.

---

[1] Əli Əmiri "Təzkireyi-şüərayi-Amid" Xəlifənin 1572-ci ildə Diyarbəkrdə vəfat etdiyini qeyd edir.

Bu vəchilə etdilər hekayət
Əhvali-güzəştədən rəvayət.
Kim mülki-ərəbdə bir cəvanbəxt,
Həm maliki-tac idi vü həm təxt.
Amir elinin büzürkvarı,
Mə'mur andan ərəb diyarı.
Həm sahibi-fəzl idivü həm cud
Fəzlü kərəmi ərəbdə mövcud...
Səhrada keçərdi salü mahi,
Dəşt idi həmişə aygahi.

## QƏZƏL

Ləb açub söyləsə ol gül çəməndə ğonçə-fəmlərlə
Əcəbmi ğonçənin həsrətdən ağzı dolsa dəmlərlə.

Xətin əngüştilə ol məh yüzündə piç-piç eylər,
Yazar mehr ayətin hüsn kitabına qələmlərlə.

Ğəmin hər tazə olduqca dili-divanə şad olur,
Məni şad eylə hər dəm, ey pərirüx, tazə ğəmlərlə.

Şəha, dildən ğübari nəsx edən reyhani-xəttindir,
Mühəqqəq bəndəniz, qırma bizi mişkin rəqəmlərlə.

Xəlifə, ol səhi qamət yenə zülfün ələm etmiş,
Gəlir dil kişvərin almağa Əbbasi ələmlərlə.

## DİYARBƏKR ŞƏHRİ ÜÇÜN YAZDIĞI "ŞƏHRƏNGİZ"DƏN BİR PARÇA

Biri nəqqarəçidi adı Heydər,
Olubdur cümlə hüsn əhlinə mehtər.
Çıqıb bir bürcünə ol mahi-təl'ət,
– Günəş sən get, mənimdir indi növbət.
Öz adına çalar dövlət nəfirin,
Nə qarə gündədir görməz fəqirin.

## SÜRURİ

*XV əsrin sonu və XVI əsrin əvvəllərində yaşamışdır. O, Nəsimi ədəbi məktəbini davam etdirən istedadlı bir sənətkardır. Onun hürufi görüşləri təbliğ edən şeirləri çox məşhur olmuşdur. Xüsusən Şah İsmayıl Xətayi hakimiyyət başına gəldikdən sonra (1502-1524) öz fikirlərini daha sərbəst söyləməyə imkan tapmışdır.*

*1515-ci ildə Sultan Səlim orduları Təbriz şəhərini tutduqdan sonra bir sıra elm-sənət adamları ilə birlikdə Süruri də Türkiyəyə göndərilmişdir. O, burada da bir şair kimi böyük şöhrət qazanmışdır.*

*Süruri yaradıcılığı əsasən hürufiliyə həsr olunmuş əsərlərdən ibarət olsa da, onun məhəbbət mövzusunda yazılmış qəzəlləri də vardır. Bu qəzəllər olduqca səmimi və yüksək bədii zövqlə yazılmış sənət nümunələridir.*

Ta müənbər kakilin xurşidə salmışdır kəmənd,
Bağlamışdır boynumu zənciri-zülfün bənd-bənd.

Qəddi-dilcuyin nəhalin gördü çün gülzardə,
Durdu ayağ üstünə tə'zim edüb sərvi-bülənd.

Ənbər-əfşan zülfünə irmək dilər cana könül,
Allah-Allah, nə uzaq sevdayə düşmüş dərdmənd.

Nasiha! Pənd etməgil mehrindən ol məhparənin,
Şöylə dolmuşdur könül kim, qalmamışdır cayi-pənd.

Ey Süruri xətti-sevdasından anın baş çəkən,
Parələnsin tiği-möhnətlə qələm tək bənd-bənd.

* * *

Qamətim ğəmdən büküldü sünbüli-pürtab tək,
Gözlərim qan ilə doldu laleyi-sirab tək.

Cəng içün hər dəm dili-xaradan ol sərvi-rəvan
Daş saqlar sineyi-simin içində ab tək.

Eşq kuyində naməd pütəm ki, nə'lü dağdən
Cismim üzrə hər tərəf olmuşdurur qullab tək.

* * *

Könlümü zülfünə çək zəncirə şeydalanmasın,
Sinəmi çak et ki, səndən özgə mə'valanmasın.

Tutmuşam xunabeyi-dil birlə çeşmim rövzənin
Kim, yüzündən özgəyi hərgiz təmaşalanmasın.

Ləblərin dövründə mişkin zülfüni dağın ki, ta
Ğönçə xəndan olmasın, sünbül-mütərralanmasın.

Ğəmzəni bidar qıl naz yuqusundan kim dəxi,
Nərgisi rə'na çəmən səhnində şəhlalanmasın.

Bixəbərdir çün həbibin dərsi-eşqindən fəqih,
Ey Süruri, şöylə ikən dəxi mollalanmasın.

* * *

Bisituni-ğəmdə bərgi-laleyi-həmrayə bax!
Pərdəhayi-dideyi-Fərhadi-təmfərsayə bax!

Daməni-bərfi-bəharidə nəzər qıl laləyə
Pənbəyi-pürxuni-daği-sineyi səhrayə bax!

Göstərir kəhli-cəvahir hoqqəsindən lalələr,
Lə'li-tərdən sürmədani-nərgisi-şəhlayə bax!

Gər çəməndə lalə ovraqin göricək daği-ğəm,
Filməsəl gögdə şəfəq içrə dutulmuş ayə bax!

Lalə ovraqi çəməndə daği-eşq eylər nəhan,
Nafeyi-mişk üzrə çülğanmış qızıl valaya bax!

Laləgun mey sunsa saqi samdi-siminlə,
Atəşi-inni ənəllahə, yədi-beyzayə bax!

Ey Süruri, laləzari-ömrə yoqdur e'tibar,
Badeyi-gülrəng içüb, bur sirəti-zibayə bax!

# ŞAHİ

*XV əsrin sonu – XVI əsrin əvvəllərində yaşamış şairlərdəndir. Şah İsmayıl Xətayi sarayına yaxın şairlərdən olmuş və ona hörmətən şeirlərində Şahi təxəllüsü işlətmişdir.*

*1514-cü ildə Sultan Səlim Təbrizi işğal etdiyi zaman bir çox alim, nəqqaş, rəssam, memar və şairlərlə birlikdə Şahini də Türkiyəyə köçməyə məcbur etmişlər. Əsərləri toplanmamış, anadan olduğu və öldüyü il məlum deyildir.*

Sünbülün yanında hər su çeşmi-cadularımıdır?
Ya kəmənd ilə tutulmuş vəhşi ahularmıdır?

Yayılarmıdır qurulmuş asılu hər guşədən,
Ya ğəzəblə çatdığın peyvəstə əbrularmıdır?

Qaşın altında iki çeşmindi yaslanmış yatar,
Ya bir eyvan içrə yatmış iki sayrularmıdır?

Şətmidir, qülzəmmidir, ya abi-Ceyhun, ya Fərat,
Həsrətindən hər dü çeşmimdən axan cularmıdır?

Görgəcin bağlandı çeşmim iki xoşbu sünbülə
Türreyi-ənbərəfşanın açdı derlər, bularmıdır?

Baş çıqarqan hər tərəf güllərimdir fəsli-bahar,
Ya fəna dünyada xak olmuş pərirulərmidir?

Bilmən, ey Şahi, sənin yarındır ancaq tundxu,
Yoxsa xublar barcası ha belə bədxularmıdır?

* * *

Ğönçeyi-gül bülbülün qəsdinə peykan eyləmiş
Ğönçə açılğan gülü yüzünə qəlğan eyləmiş.

Ğönçənin peykanını tiz etmək içün şaxi-gül
Cismini başdan ayağə şəkli-suhan eyləmiş.

Gül ərusun sübhdəm bülbül nigah etmiş məgər
Kim, yüzün yaşıl duvaq altında pünhan eyləmiş.

Dəhr ara, hər bir bozuq divar görsən şöylə bil
Bir Süleyman mülkidir çərx anı viran eyləmiş.

Mehrinə aldanma Şahi bu fələyin kim, günü
Göyə yetgirmiş, yenə xakilə yeksan eyləmiş.

# HƏQİRİ

*XVI əsr Azərbaycan ədəbiyyatının görkəmli nümayəndələrindən olan Həqiri Təbrizdə doğulmuş, gənclik illərində mükəmməl təhsil almışdır. Xorasana ziyarətə gedərkən Kaşanda dayanmış, dörd il orada yaşayaraq, şəhərin görkəmli adamları, o cümlədən Mövlana Möhtəşəmlə dostluq etmişdir.*

*Həqirini Kaşanda görən Təqiəddin Kaşi "Xülasət ül-əxbar" əsərində onun sufi təbiətli bir adam olduğunu qeyd edir. 1573-cü ildə Kaşandan Xorasana hərəkət edən Həqiri ziyarətdən sonra Təbrizə qayıtmışdır. Şair 1585-ci ildə türklərin Təbrizə basqını zamanı həlak olmuşdur.*

*Həqirinin yaradıcılığı 6 min beytlik "Divan"ından və "Leyli və Məcnun" poemasından ibarətdir. Onun şeirləri yüksək bədii xüsusiyyətləri, sadə dili və səmimiliyi ilə seçilir.*

## QƏZƏLLƏR

Yar qulaq olmaz mənim əfqanıma,
Mərhəmət qılmaz dili-büryanıma.

Uş vüsalından irağəm mən anın,
Hicrü firqət od salıbdır canıma.

Yar yolunda əz əzəl pərvanə tək
Daima yanmaq gəlibdir şanıma.

Ol sənəmdən ötürü qamu cəhan,
Neyləyim ki, susadılar qanıma.

Nedəyim ol könlüm alan bir zaman
Rəhm qılmaz cani-sərgərdanıma.

Bəs rəvadır əndəlibvəş naleşim,
Çün irişmən ol güli-xəndanıma.

Bəs olum Yə'qub tək zarü həzin,
İrmədim çün Yusifi-Kən'anıma.

Çün deyibdir əkrəmi-seyfi-rəsul,
Canı verdim sən təki mehmanıma.

* * *

Xanimandan olmuşam avarə mən,
Qeyri vəhşi kimsə gəlməz yanıma.

Bülbüləm hüsnün gülüstandır mana,
Həm dodağın abi-heyvandır mana.

Sənsizin, ey canımın cananəsi
Cümlə aləm bəndü zindandır mana.

Dişlərindir dürrü gövhər, ey sənəm,
Ləblərin lə'li-Bədəxşandır mana.

Səndən ayru gəzməzəm, ey dilrüba,
Çün xəyalın canda mehmandır mana.

Surətin uş Kə'bətüllahdır yəqin
Asitanın ərşi-rəhmandır mana.

Ey camalın surəsi səb'ül-məsan
Küfri-zülfün dinü imandır mana.

Ta sənin sövdana düşdüm, ey pəri,
Xaniman dəştü biyabandır mana.

Ta ki, səndən mən bəid oldum, bəid,
Həmdəmü həmraz hicrandır mana.

Bürqə' altda nedəyim, ey dilrüba,
Çünki hüsnün şimdi pünhandır mana.

* * *

Dilrüba, sən eylə gəl əhdə vəfa,
Yazuğam çox canıma qılma cəfa.

Ey saçın şərhi "ələm nəşrəh" sənin
Məh yüzün vəsfi dəhanın "qul kəfa".

Firqətindən olmuşam zarü həzin,
Vüslətinlə dərdimə qılgil şəfa.

Acıdır, cana, sənin hicrin günü,
Həm misalındır mənə sidqü səfa.

Səndən özgə kimseyi yar istəməm,
[Bil] behəqqi-nuri-paki-Mustəfa.

* * *

Səndən ayru zar qaldım, ey həbib!
Dərd ilən bimar qaldım, ey həbib!

Həsrətindən gecələr kövkəb kibi
Ta səba bidar qaldım, ey həbib.

Vüslətinlən nola gər qılsan dəva,
Fikr ilən əfkar qaldım, ey həbib.

Şimdi ol gülgün cəmalından cüda,
Bənddanü zar qaldım, ey həbib.

Eşq ilən aləmlərə pünhan ikən
Sənsizin izhar qaldım, ey həbib.

Eyləməzsən dərdimin dərmanını
Acizü biçar qaldım, ey həbib.

Firqəti-hicran(ın) ilən şimdi mən
Məhrumü bazar qaldım, ey həbib.

* * *

Göz yaşım qıldın mənim dərya, fəraq.
Gizlü razım eylədin peyda, fəraq.

Ləşkərin vardır sənin bihəd bu gün
Mən səninlən nedəyim tənha, fəraq?

Ol sənəmdən ayrı saldın sən məni,
Eylədin aləmlərə rüsva, fəraq.

Eylədin biçarə miskin Vərqanı,
Əz bərayi-didəni-Gülşa, fəraq.

Sən edibsən Vamiqi-nalan içün
Həm ze hicrü surəti-Əzra, fəraq.

Öldürürsən aşiqi hicran ilən
Qamudan betərsən, bipərva, fəraq.

Yaxamı yırtıb əlindən dad edim:
Va fəraqü va fəraqü va fəraq.

* * *

Hicr ilən daim məni zar edən eşq,
Natəvanü xəstə, bimar edən eşq.

Əql ilə tədbirin etmək olmadı,
Ey məni aləmdə biar edən eşq.

Çeşmi-kövkəb kibidir rast ru
Gecələr ta sübh bidar edən eşq.

Xubları sevməkdən ötrü daima,
Bəndəni dərdə giriftar edən eşq.

Xanimandan dur qıldın sən məni,
Gecə-gündüz məni bimar edən eşq.

Bilməzəm səndən kimə dad edəyim,
Ey Həqirinin günün zar edən eşq.

* * *

Ey gözümün yaşını qan edən eşq,
Yürəyimi qəmdə büryan edən eşq,
Canımı məcruhü zar edən əvəl,
Bu iki çeşmimi giryan edən eşq.
Xubların cövrün qəbul edən könül,
Cismimi səhrada üryan edən eşq.
Uş məni Yə'qub kibi bimar edən,
İştiyaqi-şahi-Kən'an edən eşq.
İsm, hər ar ilə namusum mənim
Cümləsin xak ilə yeksan edən eşq.
Həsrətü hicranə düşmüş könlümüz
Şəhrini zicr ilə viran edən eşq.
Şadiman oldum vüsal ilə əzəl,
Aləmi uş mana zindan edən eşq.
Bülbüli-biçareyi fəsli-bahar,
Valehi-ruyi-gülüstan edən eşq.
Abidi həm sufivü zahidləri
Bir zamanda namüsəlman edən eşq.

* * *

Ey şəha, mən bəndəni sən şad qıl,
Vəsl edən bu qayğudan azad qıl.

Mən zəifü natəvanəm hicr ilən
Kamımı ver, bilməzəm, bidad qıl.

Lütf elə, ey aləmin şahı, bu gün
Buncalayın könlümü abad qıl.

Gözlərəm yolun sənin leylü nahar
Vəsl evin könlümdə sən bünyad qıl.

Uş muradım səndən, ey şaha, budur:
Həmdəmi-mə'curi hurizad qıl.

Gecə-gündüz munisi mehrim yarı
Çeşmi-şüxü qaməti-şümşad qıl.

Padşaha kamransan dər cəhan,
Lütfdən ehsanü ədlü dad qıl.

Əsdi badi-sübh əz kuyi-sənəm
Ey könül, sən ömrünü bərbad qıl.

Ey Həqiri ol ləbi-şirin içün
Kuhkən bul naləvü fəryad qıl.

* * *

Hər zaman, aydındı, ey şeyda könül,
Aləmə qıldın məni rüsva, könül.

Bir pəriru dilbərə heyran olub
Bəndəni saldın yüz qovğaya, könül.

Şad ikən ah eylədin dərdimi sən,
Dəştü səhra qıldın ol mə'va, könül.

Həq təalinin məqamısan yəqin
Ərş ilə həm kürsidən ə'la, könül.

Bulmadım tədbirini əql ilə mən,
Ah əlindən, dad əlindən, ya könül.

Misli-Vamiq mən qəribü xəstəni
Valeh edən bir rüxi-üzra, könül.

Binəva sən qıldın axır Vərqanı
Dər həvayi-didəni-Gülşa, könül.

* * *

Ey pərivəş, mən səni yar istərəm,
Yar əgər olmaz isən dar istərəm.

Tərk qıldım malü mülkü təxtü tac,
Gecə-gündüz vəsli-didar istərəm.

Salmışam bazara can beyy eylərəm
Bu mətaə xoş xiridar istərəm.

Valehü heyranəm uş bülbül sifət,
Bir camalı bağü gülzar istərəm.

Tərk qıldım mən yolunda namü nəng,
Ey pərisaid, güli-ar(?) istərəm.

Olmuşam bimar hüsnündən sənin,
Ləblərindən dərdə timar istərəm.

Vəslin içün həsrətindən könlümü
Mən həmişə zarü həmyar istərəm.

Yar olmaz dideyi-hər bivəfa
Əhdinə doğru vəfadar istərəm.

Çeşmimi kövkəb kibi ta sübhdən,
Mən sənin eşqində bidar istərəm.

* * *

Məcnun aydır, ey gözüm, canım mənim
Küfri-zülfün dinü imanım mənim.
Yüzüm üzrə lütf edib basgil qədəm,
Ey qədi sərvi-xuramanım mənim,
Valehəm bülbül kimi didarına,
Çün (gülümsən, həm) gülüstanım mənim.

Dərdmənd oldum çü Yə’qub əz fəraq,
Halımı sor, şahi-Kən’anım mənim.
Məqsudum oldur ləbindən kam alım,
Ləbləri çün abi-heyvanım mənim.
Vəsli-ruyun dərdimin dərmanıdır,
Ey ləbi çün lə’lü mərcanım mənim.
Dutdu afaqı təmamət sərbəsər
Səndən ayrü zarü giryanım mənim.
Eşqin olmuşdur əzəldən ta əbəd
Rəhnümalıq birlə bürhanım mənim.

* * *

Ey vüsalın bağü bustanım mənim,
Ey yüzün virdü gülüstanım mənim.

Eydi vəslində, əya huri liqa,
Sənə qurban cism ilə canım mənim.

Səndən ayru, ey gözümün nuru yar,
Ərşə irdi ahü əfğanım mənim.

Ruzi vəslin eyd ilə novruz durur,
Uş fəraqın zicrü zindanım mənim.

Misli-Yə’qubəm qəm ilə natəvan,
Gəlgil axır şahi-Kən’anım mənim.

Uş sənin xeyli-xəyalın daima
Can içində oldu mehmanım mənim.

Gözlərim kövkəb kimi bulanda gəl,
Ey camalı mahi-tabanım mənim.

Bülbüli-şuridəyəm gəl tez iriş,
Ey ləbi çün qönçə xəndanım mənim.

Dönməzəm eşqin yolundan, haq bilür,
Gər tökərlərsə yerə qanım mənim.

* * *

Eşqdir zahidləri tərsa qılan,
Eşqdir mö'minləri rüsva qılan.

Eşqdir kim əndəlibi dəmbədəm
Güldən ötrü valehü şeyda qılan.

Eşqdir abidləri bidin edən,
Əqlü fəhm ilə yügüş qovğa qılan.

Eşqdir aşiqləri yüz zicr ilə
Mübtəlayi-zülfi-ənbərba qılan.

Eşq dərdin nuş edən ah eyləməz
Məskənin həm kuh (ilə) səhra qılan.

Eşqdir kim hər kimə tuş olsa ol,
Xanimandan cümlə bipərva qılan.

Eşqdir aləmlərin sərmayəsi,
Eşqdir bu əql ilə dava qılan.

* * *

Ey mənim ruhi-rəvanım, qandasan?
Ey mənim cani-giranım, qandasan?

Firqətindən oldu aləm, mana dar,
Ey mənim darüp-əmanım, qandasan?

Bir şikəstə bəndeyi-bimarınam,
Ey mənim şahi-cəhanım, qandasan?

Bülbüli-şeydayəm eşqində sənin
Ey camali gülüstanım, qandasan?

Sən ləbi-şirin içün dünyada mən
Olmuşam Fərhad, xanım, qandasan?

Gözüm üzrə lütf qıl basgil ayaq,
Ey qədi sərvi-rəvanım, qandasan?

Ey məlaik çakərin, huri qulun
Ey ləbi şəkkərfəşanım, qandasan?

Demədin bir gəz mənə, ey dilrüba,
Ey zəifü natəvanım, qandasan?

* * *

Ey mənim könlüm alan şahi-cahan,
Sənsizin oldum zəifü natəvan.
Vüslətinlən dərdimin dərmanın et,
Firqətindən ölmüşəm mən natəvan.
Qəm deyil olsam fərağından həlak.
Dövlət ilə ol cahanda cavidan.
Səndən ayru bir zaman var etməsin
Bəndəni həqqi-qədimü müstəan.
Bivəfa demə vəfadaram sənə,
Kim səbil etdim yolunda başü can.
Xaki-payinə yetirdim yüzümü,
Versə idi gər rəqib bir dəm aman.
Abi-mehrin xakımı qıldı xəmir,
Biz ki, bir canız, ey huri-cinan.
Zarü əfğandır işim bülbül kimi
Səndən ayru, ey camalı gülüstan.
Ta qiyamət mən səni tərk etməzəm,
Ey həbibim, etmə gəl zənnü güman.

* * *

Ey könül, sənsən məni məğbun edən,
Natəvanü xəstəvü məhzun edən.
Yar fərağında məni bimar edən,
Göz yaşımı qulzumi-Ceyhun edən.
Eşq ilə həmdəm olub leylü nəhar,
Talei, bəxtimi misli dun edən.

Ey könül, sənsən məni zar eyləyib,
Üstümə qəmdə yügüş şəbxun edən.
Çarə etmək olmadı heç növ ilən
Sana, ey mən xəstəni Məcnun edən.

* * *

Tərk qıldı bəndini cananədən,
Doğmadı sənciləyin can anədən.

Döndərə bilmən yüzümü həq bilür
Dünyada uş sən təkin cananədən.

Gəl vüsalın bağına apar məni
Firqətin tək guşeyi-viranədən.

Həmdəm etdin özünə biganeyi,
Qoydun uş mən xəstəni tənha nədən?!

Səndən ayru könlüm, ey huri liqa,
Çıxmadı uş bir zaman qəmxanədən.

Abi-heyvandan ləbin yeyrəkdürür,
Dişlərin həm gövhərü durdanədən.

İstərəm ki bir qədəh nuş edəyim
Ləblərin tək sağərü peymanədən.

Həqq ana baği qılursa mehrimi,
Dışra çıxmam mən bu vəhdətxanədən.

* * *

Canımı yandırdı, ey can, firqətin,
Eylədi bağrımı büryan firqətin.

İşi cövr ilə cəfa imiş müdam,
Qılmaz imiş lütfü ehsan firqətin.

Bəndəni öldürməyə qəsd eylədi,
Oldu çün bihəddü payan firqətin.

Yə’qubu məcruhü məhcur eylədi
Hicr ilə, ey şahi-Kən’an, firqətin.

Eyləyibdir yüz əzabü zicr ilən
Könlümün şəhrini viran firqətin.

* * *

Dad əlindən hər zaman, ey dəhri-dun,
Bağrımı qıldın mənim sən dolu xun.

Xanimanımdan cüda qıldın məni,
Eylədin könlümdə ənduhu füzun.

Qılmadın bir gəz mana lütfü əta,
Liykən artırdın əzabı günbəgün.

Qoymadın qüvvət tənimdə zərrəcə,
Cismimi murdan betər qıldın zəbun.

Eylədin zarıncı mən dil xəsteyi,
Qoymadın könlümdə aramü sükun.

* * *

Key nigari-gülüzarım, gəl bu gün,
Ey dü zülfü süşkbarım, gəl bu gün.

Gözlərim gördü müsəlsəl zülfünü,
Getdi səbrü həm qərarım, gəl bu gün.

Gül camalın həsrətindən haq bilür,
Ərşə irdi ahü zarım, gəl bu gün.

Qəmzən oxu canıma kar eylədi,
Qan ilə doldu kənarım, gəl bu gün.

Qıl məni lütf eyləyib qəmdən xilas
Ey əmirü şəhriyarım, gəl bu gün.

Mübtəla qıldı fəraqın könlümü,
Getdi əldən ixtiyarım, gəl bu gün.

Bivəfalıq rəsmini tərk eylə gəl,
Ey vəfalı yari-qarım, gəl bu gün.

Səndən ayrı həq bilür kim zərrə tək
Təlx olubdur ruzigarım, gəl bu gün.

Eşq əzabından məni azad qıl,
Vəsli göyçək növbaharım, gəl bu gün.

# MƏHƏMMƏD FÜZULİ

*Şərqin ən böyük şairlərindən biri, Türk dünyasının iftixarı, dahi lirik Məhəmməd Füzuli 1494-cü ildə Kərbəla şəhərində dünyaya gəlmiş və 1556-cı ildə burada da vəfat etmiş, İmam Hüseyn türbəsinin bir hücrəsində dəfn edilmişdir. Füzuli Oğuzların Quzey və Güney Azərbaycanda, Anadoluda, İraqda ta qədimlərdən bəri məskun olduqları və Dədə Qorqudun da mənsub olduğu Bayat boyundandır. Bir çox araşdırıcıların fikrincə, şairin atası Süleyman İraqa Azərbaycandan köç etmişdir. M.Füzuli İslam Şərqinin üç əsas dilində – türk, fars və ərəb dillərində ölməz əsərlər yaratmışdır. Ancaq şah əsərləri – "Leyli və Məcnun" məsnəvisi, türkcə "Divan"ı doğma ana dilindədir, bu dilin bədii imkanlarının təsdiqi və inkişaf etməsi yolunda misilsiz xidmət göstərmiş örnəklərdir.*

*Füzulinin nəzm və nəsrlə yazdığı lirik, fəlsəfi, dini, alleqorik, hətta satirik əsərləri vardır. "Bəngü badə", "Səhhət və mərəz", "Ənis ül-qəlb", "Söhbət ül-əsmar", "Yeddi cam", "Rindü Zahid", "Hədiqət üs-süəda", "Mətlə ül-e'tiqad", "Şikayətnamə", həmçinin Ə.Camidən türkcəyə çevirdiyi "Hədisi-ərbəin" mənzuməsi, Füzulinin ən müxtəlif janrlarda, üç dildə yaratdığı ölməz əsərləri, Azərbaycanın, Türkiyənin, İraq türkmənlərinin milli sərvəti, ümumiyyətlə, Türk dünyasının və Şərq xalqlarının dünya mədəniyyəti xəzinəsinə qiymətli töhfəsidir.*

*1908-ci ildə Şərqin ilk operasını – "Leyli və Məcnun" muğam operasını yaradan böyük Azəri bəstəkarı Üzeyir Hacıbəyli də məhz Füzulinin bu məşhur əsərinə müraciət etmişdir.*

## QƏZƏLLƏR

Ey mələksima ki, səndən özgə heyrandır sana,
Həq bilir, insan deməz hər kim ki, insandır sana.

Verməyən canın sənə bulmaz həyati-cavidan,
Zindeyi-cavid ona derlər ki, qurbandır sana.

Aləmi pərvaneyi-şəm'i-cəmalın qıldı eşq,
Cani-aləmsən, fəda hər ləhzə min candır sana.

Aşiqə şövqünlə can vermək ikən müşkül degil,
Çün Məsihi-vəqtsən, can vermək asandır sana.

Çıxma yarım gecələr, əğyar tə’nindən saqın,
Sən məhi-övci-məlahətsən, bu nöqsandır sana.

Padşahim, zülm edib aşiq sana zalim demiş,
Xubrulardan yaman gəlməz, bu böhtandır sana.

Ey Füzuli, xubrulardan təğafüldür yaman,
Gər cəfa həm gəlsə onlardan, bir ehsandır sana.

* * *

Mənim tək hiç kim zarü pərişan olmasın, ya Rəb!
Əsiri-dərdi-eşqü daği-hicran olmasın, ya Rəb!

Dəmadəm cövrlərdir çəkdigim birəhm bütlərdən,
Bu kafərlər əsiri bir müsəlman olmasın, ya Rəb!

Görüb əndişeyi-qətlimdə ol mahi, budur virdim
Ki, bu əndişədən ol məh pəşiman olmasın, ya Rəb!

Çıxarmaq etsələr təndən, çəkib peykanın ol sərvin
Çıxan olsun dili-məcruh, peykan olmasın, ya Rəb!

Cəfavü cövr ilə mö’tadəm, onlarsız nolur halım,
Cəfasinə hədü cövrinə payan olmasın, ya Rəb!

Demən kim, ədli yox, ya zülmü çox, hər hal ilə olsa,
Könül təxtinə ondan qeyri sultan olmasın, ya Rəb!

Füzuli buldu gənci-afiyət meyxanə küncündə,
Mübarək mülkdür, ol mülk viran olmasın, ya Rəb!

* * *

Bəhri-eşqə düşdün, ey dil, zövqi-dünyani unut!
Baliğ oldun, gəl rəhimdən içdigin qani unut!

Verdi rehlətdən xəbər muyi-səfidü ruyi-zərd,
Çöhreyi-gülgun ilə zülfi-pərişani unut!

Çək nədamətdən gögə dudi-dilin, tək qanlı yaş,
Sərvi-nazin tərk tut gülbərgi-xəndani unut!

Gör qənimət fəqr mülkündə gədalıq şivəsin,
E'tibari-mənsəbü dərgahi-sultani unut!

Çəkmə aləm qeydini, ey sərbüləndi-fəqr olan,
Səltənət təxtinə irdin, bəndü zindani unut!

Lövhi-xatir surəti-cananə qıl ayinədar,
Onu yad et, hər nə kim yadındadır, ani unut!

Mə'siyət dərsin yetər təkrar qıl, döndər vərəq,
Özgə hərfin məşqin et, ol dərs-ünvani unut.

Ey Füzuli, çək məlamət rəhgüzarından qədəm
Ləhzə-ləhzə çəkdigin bihudə əfğani unut!

* * *

Könlüm açılır zülfi-pərişanını görgəc,
Nitqim tutulur qönçeyi-xəndanını görgəc.

Baxdıqca sənə qan saçılır didələrimdən,
Bağrım dəlinir navəki-müjganını görgəc.

Rə'nalıq ilə qaməti-şümşadı qılan yad,
Olmazmı xəcil sərvi-xuramanını görgəc?

Çox eşqə həvəs edəni gördüm ki, həvasın
Tərk etdi, sənin aşiqi-nalanını görgəc.

Kafər ki, degil mö'tərifi-nari-cəhənnəm,
İmanə gələr atəşi-hicranını görgəc.

Naziklik ilə qönçeyi-xəndanı edən yad,
Etməzmi həya lə'li-dürəfşanını görgəc?

Sən hali-dilin söyləməsən, nola, Füzuli,
El fəhm qılır çaki-giribanını görgəc.

* * *

Nalədəndir ney kimi avazeyi-eşqim bülənd,
Nalə tərkin qılmazam, ney tək kəsilsəm bənd-bənd.

Qıl mədəd, ey bəxt, vərnə, kami-dil mümkün degil,
Böylə kim, ol dilrüba bidərddir, mən dərdmənd.

Dağlərdir odlu könlümdə qarası qopmamış,
Ya səbati-eşq üçün od üzrə bir neçə sipənd.

Açılır könlüm gəhi kim, giryeyi-təlxim görüb,
Açar ol gülrüx təbəssüm birlə lə'li-nuşxənd.

Xaki-rahindən məni qaldıra bilməz sayə tək,
Qılsa gərdun afitabın hər şüaın bir kəmənd.

Cam tut, der, saqiyi-gülçöhrə, zahid, tərki-cam,
Ey könül, fikr eylə gör kim, qansıdır tutmalı pənd.

Ey Füzuli, surəti-fəqrin qəbuli-dustdur,
Hiç dərvişi sənin tək görmədim sultanpəsənd.

* * *

Pərişan xəlqi-aləm ahü əfqan etdigimdəndir,
Pərişan olduğum, xəlqi pərişan etdigimdəndir.

Təni-zarimdə dərdi-eşq gün-gündən füzun olmaq
Yetən bidərd tədbirilə dərman etdigimdəndir.

Gözüm kim, bağrımın qanın tökər pərkalə-pərkalə,
Dəmadəm aruziyi-lə'li-canan etdigimdəndir.

Degil bihudə, gər yağsa fələkdən başimə daşlar,
Binasın tişeyi-ahimlə viran etdigimdəndir.

Qaçan rusva olurdum, qan udub səbr edə bilseydim,
Məlamət çəkdigim bihudə əfğan etdigimdəndir.

Xəta səndən degil, cismim oxundan binəsib olsa,
Hübabi-əşki-gülgun içrə pünhan etdigimdəndir.

Füzuli, ixtilati-mərdümi-aləmdən ikrahim,
Pərivəşlər xəyalın munisi-can etdigimdəndir.

* * *

Canı kim cananı üçün sevsə, cananın sevər,
Canı üçün kim ki, cananın sevər, canın sevər.

Hər kimin aləmdə miqdarıncadır təb'ində meyl,
Mən ləbi-canani mi, Xizr abi-heyvanın sevər.

Başə dəm düşdükcə təqsir eyləməz, eylər mədəd,
Ol səbəbdən müttəsil çeşmim cigər qanın sevər.

Mişki-Çin avarə olmuşdur vətəndən mən kimi,
Qansı şuxun, bilməzəm, zülfi-pərişanın sevər.

Su ki, sərgərdan gəzər, başında vardır bir həva,
Qaliba, bir gülrüxün sərvi-xuramının sevər.

Aqibət rusva olub mey tək, düşər xəlq ağzına,
Kim ki, bir sərməst sali lə'li-xəndanın sevər.

Nolacaqdır, tərki-eşq etmə Füzuli, vəhm edib,
Qayəti derlər, ola bir bəndə sultanın sevər.

* * *

Ah eylədigim sərvi-xuramanın üçündür,
Qan ağladığım qönçeyi-xəndanın üçündür.

Sərgəştəligim kakili-mişkinin ucundan,
Aşüftəligim zülfi-pərişanın üçündür.

Bimar tənim nərgisi-məstin ələmindən,
Xunin cigərim lə'li-dürəfşanın üçündür.

Yaqdım tənimi vəsl günü şəm, tək, əmma,
Bil kim, bu tədarük şəbi-hicranın üçündür.

Qurtarmağa yəğmayi-qəmindən dilü canı,
Sə'yim nəzəri-nərgisi-fəttanın üçündür.

Can ver, könül, ol qəmzəyə kim, bunca zamanlar,
Can içrə səni bəslədigim anın üçündür.

Vaiz bizə dün duzəxi vəsf etdi, Füzuli,
Ol vəsf sənin külbeyi-əhzanın üçündür.

* * *

Tökdükcə qanımı oxun, ol asitan içər,
Bir yerdəyəm əsir ki, torpağı qan içər.

Əhli-zəmanə qanına çox təşnədir zəmin,
Qanın kimin tökərsə fələk, ol zəman içər.

Mey içmədən açılmaz imiş babi-məğfirət,
Sövgəndlər bu babdə piri-müğan içər.

Üqbadə Kövsər istəməsin rindi-meykədə,
Dünyadə bəs degilmi meyi-ərğəvan içər?

Qəmzən görünməyib gözə, qanlar içər müdam,
Zahid kimi ki, badəni eldən nihan içər.

Meydən əgərçi tövbə verir el Füzuliyə,
Ey sərv, sən qədəh sunar olsan, rəvan içər.

* * *

Məndə Məcnundan füzun aşiqlik iste'dadı var,
Aşiqi-sadiq mənəm, Məcnunun ancaq adı var.

Nola qan tökməkdə mahir olsa çeşmim mərdümi,
Nütfeyi-qabildürür, qəmzən kimi ustadı var.

Qıl təfaxür kim, sənin həm var mən tək aşiqin,
Leylinin Məcnunu, Şirinin əgər Fərhadı var.

Əhli-təmkinəm, məni bənzətmə, ey gül, bülbülə,
Dərdə yox səbri onun, hər ləhzə min fəryadı var.

Öylə bədhaləm kim, əhvalım görəndə şad olur,
Hər kimin kim, dövr cövründən dili-naşadı var.

Gəzmə, ey könlüm quşu, qafil fəzayi-eşqdə
Kim, bu səhranın güzərgəhlərdə çox səyyadı var.

Ey Füzuli, eşq mən'in qılma nasehdən qəbul,
Əql tədbiridir ol, sanma ki, bir bünyadı var.

* * *

Şəfayi-vəsl qədrin hicr ilə bimar olandan sor,
Zülali-zövq şövqün təşneyi-didar olandan sor.

Ləbin sirrin gəlib göftarə, məndən özgədən sorma,
Bu pünhan nüktəni bir vaqifi-əsrar olandan sor.

Gözü yaşlıların halın nə bilsin mərdümi-qafil,
Kəvakib seyrini şəb ta səhər bidar olandan sor.

Xəbərsiz olma fəttan gözlərin cövrün çəkənlərdən,
Xəbərsiz məstlər bidadını hüşyar olandan sor.

Qəmindən şəm’ tək yandım, səbadən sorma əhvalım,
Bu əhvalı şəbi-hicran mənimlə yar olandan sor.

Xərabi-cami-eşqəm, nərgisi-məstin bilir halım,
Xərabat əhlinin halini bir xummar olandan sor.

Məhəbbət ləzzətindən bixəbərdir zahidi-qafil,
Füzuli, eşq zövqün, zövqi-eşqi var olandan sor.

* * *

Əzəl katibləri üşşaq bəxtin qarə yazmışlar,
Bu məzmun ilə xət ol səfheyi-rüxsarə yazmışlar.

Xəvasi-xaki-payin şərhini təhqiq edib mərdüm,
Qübarilə bəyazi-dideyi-xunbarə yazmışlar.

Gülüstani-səri-kuyin kitabın bab-bab, ey gül,
Xəti-reyhan ilə cədvəl çəkib, gülzarə yazmışlar.

İki sətr eyləyib ol iki meygun lə’llər vəsfin,
Görənlər hər birin bir çeşmi-gövhərbarə yazmışlar.

Girib bütxanəyə qılsan təkəllüm, can bulur, şəksiz,
Müsəvvirlər nə surət kim, dərü divarə yazmışlar.

Mühərrirlər yazanda hər kəsə aləmdə bir ruzi,
Mənə hər gün dili-sədparədən bir parə yazmışlar.

Yazanda Vamiqü Fərhadü Məcnun vəsfin əhli-dərd
Füzuli adını, gördüm, səri-tumarə yazmışlar.

* * *

Könüldə min qəmim vardır ki, pünhan eyləmək olmaz,
Bu həm bir qəm ki, el tə’nindən əfğan eyləmək olmaz.

Nə müşkül dərd olursa bulunur aləmdə dərmanı,
Nə müşkül dərd imiş eşqin ki, dərman eyləmək olmaz.

Fəna mülkünə çox əzm etmə, ey dil, çəkmə zəhmət kim,
Bu tədbir ilə dəf’i-dərdi-hicran eyləmək olmaz.

Saqın, könlüm yıxarsan, pənddən dəm urma, ey naseh,
Həvayi-nəfs ilə bir mülkü viran eyləmək olmaz!

Dəhanın üzrə lə’lin istəmiş dil, dəf’i müşküldür,
Görünməz hiç cürmü, yox yerə qan eyləmək olmaz.

Dualar eylərəm, məndən yana bir dəm güzar etməz,
Nə çarə, sehrilə sərvi xuraman eyləmək olmaz.

Füzuli, aləmi-qeyd içrəsən, dəm urma eşqindən,
Kəmali-cəhl ilə də’vayi-irfan eyləmək olmaz.

* * *

Xəlqə ağzın sirrini hər dəm qılır izhar söz,
Bu nə sirdir kim, olur hər ləhzə yoxdan var söz.

Artıran söz qədrini sidqilə qədrin artırar,
Kim nə miqdar olsa, əhlin eylər ol miqdar söz.

Ver sözə ehya ki, tutduqca səni xabi-əcəl,
Edə hər saət səni ol uyqudan bidar söz.

Bir nigari-ənbərinxətdir könüllər almağa,
Göstərər hər dəm niqabi-qeybdən rüxsar söz.

Xazini-gəncineyi-əsrardır, hər dəm çəkər
Rişteyi-izharə min-min gövhəri-əsrar söz.

Olmayan qəvvasi-bəhri-mə'rifət arif degil
Kim, sədəf tərkibi-təndir, lö'löi-şəhvar-söz.

Gər çox istərsən, Füzuli, izzətin, az et sözü
Kim, çox olmaqdan qılıbdır çox əzizi xar söz.

* * *

Daği-hicran ilə yanmaqdan cigər qan olsa yey,
Mülki-dil qəm mənzili olunca, viran olsa yey.

Yarı əğyar ilə görmək aşiqə düşvar irür,
Böylə görməkdən əsiri-dərdi-hicran olsa yey.

Sinəmə peykanını göndər könül də'finə kim,
Sinədə suzan könül olunca peykan olsa yey.

Sirrimi rüsvalığım faş etmədən aləmlərə,
Zar cismim əşk girdabında pünhan olsa yey.

Dağıdırsa, nola, iqdi-zülfünü badi-səba,
Fitnə əhli olanın cəm'i pərişan olsa yey.

Dün Füzuli səhv edib, keçmiş meyü məhbubdən
Tövbə edib, bu yaman işdən peşiman olsa yey.

* * *

Dəhənin dərdimə dərman dedilər cananın,
Bildilər dərdimi, yoxdur dedilər dərmanın.

Olsa məhbublərin eşqi cəhənnəm səbəbi,
Hurü qılmanı qalır kəndisinə Rizvanın.

Keçdi meyxanədən el, məsti-meyi-eşqin olub,
Nə mələksən ki, xərab etdin evin şeytanın?

Vurmazam sihhət üçün mərhəm oxun yarəsinə,
İstərəm çıxmaya zövqi-ələmi-peykanın.

Nə bilir oxumayan müshəfi-hüsnün şərhin,
Yerə gögdən nə üçün endigini Qur'anın.

Yerdən, ey dil, gögə qovmuşdu sirişkin mələki,
Onda həm qoymayacaqdır oları əfğanın.

Ey Füzuli, olubam qərqeyi-girdabi-cünun,
Gör nə qəhrin çəkirəm dönə-dönə dövranın.

* * *

Eşqdən canımda bir pünhan mərəz var, ey həkim!
Xəlqə pünhan dərdim izhar etmə, zinhar, ey həkim!

Var bir dərdim ki, çox dərmandan artıqdır mənə,
Qoy məni dərdimlə, dərman eyləmə, var ey həkim!

Gər basıb əl nəbzimə, təşxis qılsan dərdimi,
Al əmanət, qılma hər bidərdə izhar, ey həkim!

Gəl mənim tədbiri-bihudəmdə sən bir sə'y qıl
Kim, olam bu dərdə artıqraq giriftar, ey həkim!

Gör təni-üryan ilə əhvalımı hicran günü,
Var imiş ruzi-qiyamət, qılma inkar, ey həkim!

Çəkməyincə çareyi-dərdimdə zəhmət bilmədin
Kim, olur dərmani-dərdi-eşq düşvar, ey həkim!

Rənc çəkmə, sihhət ümmidin Füzulidən götür
Kim, qəbuli-sihhət etməz böylə bimar, ey həkim!

* * *

Pənbeyi-daği-cünun içrə nihandır bədənim,
Diri olduqca libasım budur, ölsəm kəfənim.

Canı canan diləmiş, verməmək olmaz, ey dil!
Nə niza’ eyləyəlim, ol nə sənindir, nə mənim.

Daş dələr ahim oxu şəhdi-ləbin şövqindən,
Nola zənbur evinə bənzəsə beytül-həzənim.

Tövqi-zənciri-cünun daireyi-dövlətdir,
Nə rəva kim, məni ondan çıxara zə’fi-tənim.

Eşq sərgəştəsiyəm, seyli-sirişk içrə yerim,
Bir hübabəm ki, həvadən doludur pirəhənim.

Bülbüli-qəmzədəyəm, bağü baharım sənsən,
Dəhənü qəddü rüxün qönçəvü sərvü səmənim.

Edəmən tərk, Füzuli, səri-kuyin yarın,
Vətənimdir, vətənimdir, vətənimdir, vətənim.

* * *

Tutuşdu qəm oduna şad gördügün könlüm,
Müqəyyəd oldu ol azad gördügün könlüm.

Diyari-hicrdə seyli-sitəmdən oldu xərab,
Fəzayi-eşqdə abad gördügün könlüm.

Nə gördü badədə bilmən ki, oldu badəpərəst,
Mürid məşrəbü zöhhad gördügün könlüm.

Fəraqın odunu gördükcə mum tək əridi,
Səbatü səbrdə fulad gördügün könlüm.

Gətirdi əcz, görüb eşq müşkül olduğunu,
Qamu hünərlərə ustad gördügün könlüm.

Degildi böylə, dəmində bir əhli-işrət idi,
Bu qanlar içməgə mö’tad gördügün könlüm.

Füzuli, eylədi ahəngi-eyşxaneyi-Rum,
Əsiri-möhnəti-Bəğdad gördügün könlüm.

* * *

Dust bipərva, fələk birəhm, dövran bisükun,
Dərd çox, həmdərd yox, düşmən qəvi, tale’ zəbun.

Sayeyi-ümmid zail, afitabi-şövq gərm,
Rütbeyi-idbar ali, payeyi-tədbir dun.

Əql dunhimmət, sədayi-tə’nə yer-yerdən bülənd,
Bəxt kəmşəfqət, bəlayi-eşq gün-gündən füzun.

Mən qəribi-mülkü rahi-vəsl pürtəşvişü məkr,
Mən hərifi-sadəlövhü dəhr pürnəqşü füsun.

Hər səhiqəd cilvəsi, bir seyli-tufani-bəla,
Hər hilaləbru qaşı bir sərxəti-məşqi-cünun.

Yeldə bərgi-lalə tək, təmkini-daniş bisəbat,
Suda əksi-sərv tək, tə’siri-dövlət vajigun.

Sərhədi-mətlubə pür möhnət təriqi-imtəhan,
Mənzili-məqsudə pürasib rahi-azimun.

Şahidi-məqsəd nəvayi-çəng tək pərdənişin,
Sağəri-işrət hübabi-safi-səhba tək nigun.

Təfriqə hasil, təriqi-mülki-cəm’iyyət məxuf,
Ah, bilmən neyləyim, yox bir müvafiq rəhnümun.

Çöhreyi-zərdin Füzulinin tutubdur əşki-al,
Gör ona nə rənglər çəkmiş sipehri-nilgun.

* * *

Ucaldın qəbrim, ey bidərdlər, səngi-məlamətdən
Ki, mə'lum ola dərd əhlinə qəbrim ol əlamətdən.

Məzarim üzrə qoymun mil, əgər kuyində can versəm,
Qoyun bir sayə düşsün qəbrimə ol sərvqamətdən.

Görən saətdə ol qamət qiyamın, qıymadım canə,
Qiyamət həm gələ qurtulmayam mən bu nədamətdən.

Qiyamətdə hesabi olmayanlardandır ol qafil
Ki, fərq eylər fəraqın şamini sübhi-qiyamətdən.

Təriqi-səbrü tədbiri-səlamət ləzzətin bilmən,
Mənə eşqü məlamət yey gəlir səbrü səlamətdən.

Təbiət inhirafın gör həvayi-eşqdən təndə,
Əlac et düşmədən, saqi, mizacım istiqamətdən.

Füzuli, keç səlamət kuçəsindən, səbr kuyindən,
Fərağət olmayan yerdə səfər yeydir iqamətdən.

* * *

Yenə ol mah mənim aldı qərarım bu gecə,
Çıxacaqdır fələkə naleyi-zarım bu gecə.

Şəm'vəş məhrəmi-bəzm eylədi ol mah məni,
Yanacaqdır yenə eşq oduna varım bu gecə.

Həm vüsali vurur od canıma, həm hicrani,
Bir əcəb şəm' ilə düşdü sərü karım bu gecə.

Nə tütündür ki, çıxar çərxə, dili-zarə məgər
Hicr dağini urur laləüzarım bu gecə?

Sübhə saldı bu gecə şəm' kimi qətlimi hicr,
Ola kim, sübh gəlincə gələ yarım bu gecə.

Parə-parə cigərim itlərinə nəzr olsun,
Ol səri-kuyə əgər düşsə güzarım bu gecə.

Var idi sübh vüsalinə, Füzuli, ümmid,
Çıxmasa həsrət ilə cani-figarım bu gecə.

* * *

Məni candan usandırdı, cəfadən yar usanmazmı?
Fələklər yandı ahimdən, muradım şəm'i yanmazmı?

Qamu bimarinə canan dəvayi-dərd edər ehsan,
Neçün qılmaz mənə dərman, məni bimar sanmazmı?

Qəmim pünhan tutardım mən, dedilər yarə qıl rövşən,
Desəm, ol bivəfa bilmən, inanarmı, inanmazmı?

Şəbi-hicran yanar canım, tökər qan çeşmi-giryanım,
Oyadar xəlqi əfqanım, qara bəxtim oyanmazmı?

Güli-rüxsarinə qarşu gözümdən qanlı axar su,
Həbibim, fəsli-güldür bu, axar sular bulanmazmı?

Degildim mən sənə mail, sən etdin əqlimi zail,
Mənə tə'n eyləyən qafil səni görgəc utanmazmı?

Füzuli rindü şeydadır, həmişə xəlqə rüsvadır,
Sorun kim, bu nə sevdadır, bu sevdadən usanmazmı?

* * *

Heyrət, ey büt, surətin gördükdə lal eylər məni,
Surəti-halım görən, surət xəyal eylər məni.

Mehr salmazsan mənə, rəhm eyləməzsən bunca kim,
Sayə tək sevdayi-zülfün payimal eylər məni.

Zə'fi-tale', manei-tovfiq olur, hər necə kim,
İltifatın arizuməndi-vüsal eylər məni.

Mən gəda, sən şahə yar olmaq yox, əmma neyləyim,
Arizu sərgəşteyi-fikri-məhəl eylər məni.

Tiri-qəmzən atma kim, bağrım dələr, qanım tökər,
İqdi-zülfün açma kim, aşüftəhal eylər məni.

Dəhr vəqf etmiş məni növrəs cavanlar eşqinə,
Hər yetən məhvəş əsiri-xəttü xal eylər məni.

Ey Füzuli, qılmazam tərki-təriqi-eşq kim,
Bu fəzilət daxili-əhli-kəmal eylər məni.

## MÜRƏBBE

Pərişan halin oldum, sormadın hali-pərişanım,
Qəmindən dərdə düşdüm, qılmadın tədbiri-dərmanım,
Nə dersən, ruzigarım böyləmi keçsin, gözəl xanım!
Gözüm, canım, əfəndim, sevdigim, dövlətli sultanım!

Əsiri-dami-eşqin olalı, səndən vəfa görmən,
Səni hər qanda görsəm, əhli-dərdə aşina görmən,
Vəfavü aşinalıq rəsmini səndən rəva görmən,
Gözüm, canım, əfəndim, sevdigim, dövlətli sultanım!

Dəgər hər dəm vəfasız çərx yayından mənə bir ox,
Kimə şərh eyləyim kim, möhnətü ənduhü dərdim çox,
Sənə qaldı mürüvvət, səndən özgə hiç kimsəm yox,
Gözüm, canım, əfəndim, sevdigim, dövlətli sultanım!

Gözümdən dəmbədəm bağrım əzib yaşım kimi getmə!
Səni tərk etməzəm çün mən, məni sən dəxi tərk etmə!
İkən həm zalım olma, mən kimi məzlumi incitmə!
Gözüm, canım, əfəndim, sevdigim, dövlətli sultanım!

Qatı könlün nədən bu zülmilə bidadə raqibdir,
Gözəllər nisbəti olmaz cəfa, səndən nə vacibdir?
Sənin tək nazəninə, nazənin işlər münasibdir,
Gözüm, canım, əfəndim, sevdigim, dövlətli sultanım!

Nəzər qılmazsan əhli-dərd gözdən axıdan seylə,
Yamanlıqdır işin üşşaq ilə yaxşımıdır böylə?
Gəl, Allahı sevirsən, aşiqə cövr etmə, lütf eylə,
Gözüm, canım, əfəndim, sevdigim, dövlətli sultanım!

Füzuli şiveyi-ehsanın istər, bir gədayindir,
Dirildikcə sənin kuyin yolunda xaki-payindir,
Gərək öldür, gərək qoy, hökm – hökmün, rə’y – rə’yindir,
Gözüm, canım, əfəndim, sevdigim, dövlətli sultanım!

## QİTƏLƏR

Əhli-kəmalə cahil əgər qədr qılmasa,
Mə’zurdur, məlamətin etmək rəva degil.
Cahil təbiətində məzaqi-kəmal yox,
Hər nəfsə iqtidai-təbiət xəta degil.
Ülfət həmişə fər’i olur aşinalığın,
Cahil fəzilət əhli ilə aşina degil.

* * *

Elm kəsbilə rütbeyi-rif’ət
Arizuyi-məhal imiş ancaq.
Eşq imiş hər nə var aləmdə,
Elm bir qiylü qal imiş ancaq.

* * *

Zülm ilə ağçalar alıb, zalim
Eylər ən’am xəlqə minnət ilə.
Bilməz onu kim, etdigi zülmə
Görəcəkdir cəza məzəllət ilə.
Müddəası bu kim, rizayi-ilah
Ona hasil ola bu adət ilə.
Cənnəti almaq olmaz ağça ilə,
Girmək olmaz behiştə rüşvət ilə.

* * *

Hər kimin var isə zatında şərarət küfrü,
İstilahati-ülum ilə müsəlman olmaz.
Gər qara daşı qızıl qan ilə rəngin edəsən,
Təb'ə təğyir verib, lə'li-Bədəxşan olmaz.
Eyləsən tutiyə tə'lim ədayi-kəlimat,
Nitqi insan olur, əmma özü insan olmaz.
Hər uzun boylu, şücaət edə bilməz də'va,
Hər ağac kim boy ata, sərvi-xuraman olmaz.

* * *

Ey xəta ləfzilə Qur'anın şükuhin sındıran,
Mö'cüzi-ayati-Qur'andan həzər qılmazmısan?
Hər əlif bir xəncəri-xunrizi-bürrandır sənə,
Xəncəri-xunrizi-bürrandan həzər qılmazmısan?
Bir həkimi-kamilin darüş-şəfayi-hikmətin
Etmək istərsən xərab, ondan həzər qılmazmısan?

* * *

Padişahi-mülk, dinarü dirəm rüşvət verib,
Fəthi-kişvər qılmağa eylər mühəyya ləşkəri.

Yüz fəsadü fitnə təhrikilə bir kişvər alır,
Ol dəxi asari-əmnü istiqamətdən bəri.

Göstərən saətdə dövrani-fələk bir inqilab,
Həm özü fani olur, həm ləşkəri, həm kişvəri.

Gör nə sultanəm məni-dərviş kim, feyzi-süxən
Eyləmiş iqbalimi asari-nüsrət məzhəri.

Hər sözüm bir pəhlivandır kim, bulub tə'yidi-həq,
Əzm qıldıqda tutar tədric ilə bəhrü bəri.

Qanda kim, əzm etsə, mərsumü məvacib istəməz,
Qansı mülkü tutsa dəgməz kimsəyə şurü şəri.

Payimal etməz onu asibi-dövri-ruzigar,
Eyləməz tə’sir ona dövrani-çərxi-çənbəri.

Qılmasın dünyadə ultanlar mənə təklifi-cud,
Bəs dürür başımda tövfiqi-qənaət əfsəri.

Hər cəhətdən fariğəm, aləmdə haşa kim, ola
Rizq üçün əhli-bəqa, əhli-fənanın çakəri.

* * *

Ol səbəbdən farsi ləfzilə çoxdur nəzm kim,
Nəzmi-nazik türk ləfzilə ikən düşvar olur.
Ləhceyi-türki qəbuli-nəzmi-tərkib etməyib,
Əksərən əlfazi namərbutü nahəmvar olur.
Məndə tovfiq olsa, bu düşvarı asan eylərəm,
Novbahar olğac tikəndən bərgi-gül izhar olur.

## “LEYLİ VƏ MƏCNUN”

### QƏZƏLLƏR

### QƏZƏLİ-LEYLİ

Fələk ayırdı məni cövr ilə cananımdan,
Həzər etməzmi əcəb, naləvü əfğanımdan?

Oda yandırmasa gər şö’lə ilə nöh fələki,
Nə bitər atəşi-ahi-dili-suzanımdan?

Qəmi-pünhan məni öldürdü, bu həm bir qəm kim,
Gülrüxüm olmadı agəh qəmi-pünhanımdan.

Ah idi həmnəfəsim, ah ki, ol həm axır
Çıxdı ikrah qılıb külbeyi-əhzanımdan.

Mən, nə hacət ki, qılam daği-nihanım şərhin?
Aqibət zahir olur çaki-giribanımdan.

Həq bilir, yar degil canü dilimdən qaib,
Nola gər qaib isə dideyi-giryanımdan.

Can əgər çıxsa tənimdən əsəri-mehri ilə,
Əsəri-mehrini sanman ki, çıxar canımdan.

Lütf edib sən məgər, ey bad, bu gündən böylə
Verəsən bir xəbər ol sərvi-xuramanımdan.

Ey Füzuli, qəmi-hicr ilə pərişandır hal,
Kimsə agah degil hali-pərişanımdan.

## QƏZƏLİ-MƏCNUN

Ey xoş ol günlər ki, mən həmraz idim canan ilə,
Ne’məti-vəslin görüb, nazın çəkərdim can ilə.

Görməmişdi gülşəni-eyşim xəzani-təfriqə,
Olmamışdı tirə əyyamım şəbi-hicran ilə.

Məhvəşimdən, dustlar, dövran cüda istər məni,
Düşmənimdir, hiç bilmən netmişəm dövran ilə?

Yetsə gər aşiqlərin əflakə əfğanı, nə sud,
Yetmək olmaz mahvəşlər vəslinə əfğan ilə.

Yaşırıb saxlardım eldən daği-hicranın, əgər
Etmək olsaydı müdara dideyi-giryan ilə.

Zövqdən dibaçə bağlandı kitabi-ömrümə,
Qoymadı dövran keçə övqatım ol ünvan ilə.

Ey, Füzuli, əxtəribəxtim müsaid olmadı
Kim, olam bir dəm müqarin ol məhi-taban ilə.

## QƏZƏLİ-USTAD

Can vermə qəmi-eşqə ki, eşq afəti-candır,
Eşq afəti-can olduğu məşhuri-cahandır!

Sud istəmə sövdayi-qəmi-eşqdə hərgiz
Kim, hasili-sövdayi-qəmi-eşq ziyandır!

Hər əbruyi-xəm qətlinə bir xəncəri-xunriz,
Hər zülfi-siyəh qəsdinə bir əf'i ilandır!

Yaxşı görünür surəti məhvəşlərin, əmma
Yaxşı nəzər etdikdə, sərəncamı yamandır!

Eşq içrə əzab olduğun ondan bilirəm kim,
Hər kimsə ki, aşiqdir, işi ahü fəğandır!

Yad etmə qara gözlülərin mərdümi-çeşmin,
Mərdüm deyib aldanma kim, içdikləri qandır!

Gər dersə Füzuli ki: “Gözəllərdə vəfa var”,
Aldanma ki, şair sözü, əlbəttə, yalandır.

## QƏZƏL MƏCNUNİ-DİLPƏZİRİNDİR

Ya Rəb, bəlayi-eşq ilə qıl aşina məni!
Bir dəm bəlayi-eşqdən etmə cüda məni!

Az eyləmə inayətini əhli-dərddən,
Yə'ni ki, çox bəlalərə qıl mübtəla məni!

Olduqca mən, götürmə bəladən iradətim,
Mən istərəm bəlanı, çü istər bəla məni!

Təmkinimi bəlayi-məhəbbətdə qılma süst,
Ta dust tə'n edib deməyə bivəfa məni!

Getdikcə hüsnün eylə ziyadə nigarımın,
Gəldikcə dərdinə betər et mübtəla məni!

Mən qandanü mülaziməti-e’tibarü cah,
Qıl qabili-səadəti-fəqrü fəna məni!

Öylə zəif qıl tənimi firqətində kim,
Vəslinə mümkün ola yetirmək səba məni!

Nəxvət qılıb nəsib Füzuli kimi müənə,
Ya Rəb, müqəyyəd eyləmə mütləq mana məni!

## BU QƏZƏL LEYLİYİ-DİLPƏZİRİNDİR

Eşq daminə giriftar olalı zar olubam,
Nə bəladır ki, ona böylə giriftar olubam?

Dil deməkdən kəsilib, tən hərəkətdən, vəh kim,
Künci-qəmxanəyə bir surəti-divar olubam.

Qüdrətim yox ki, qılam kimsəyə şərhi-qəmi-dil,
Öylə kim, arizeyi-hicrilə bimar olubam.

Həzərim tə’nədən ol qayətə yetmişdir kim,
Yarə əğyar olub, əğyarım ilə yar olubam.

Deməzəm dəxi: “Sənə aşiqəm”, ey gül! Zira
Sənə aşiqligim izhar edəli xar olubam.

Əqlü səbrü dilü din getdi, bihəmdillah kim,
Səfəri-sahili-dəryayə səbükbar olubam.

Yox, Füzuli, xəbərim mütləq özümdən, bəs kim,
Valehi-nəqşi-xəyali-rüxi-dildar olubam.

## BU QƏZƏL MƏCNUNİ-ZARİNDİR

Vəfa hər kimsədən kim, istədim, ondan cəfa gördüm,
Kimi kim, bivəfa dünyada gördüm, bivəfa gördüm.

Kimə kim, dərdimi izhar qıldım, istəyib dərman,
Özümdən həm betər bir dərdə onu mübtəla gördüm.

Mükəddər xatirimdən qılmadı bir kimsə qəm dəfn,
Səfadan dəm uran həmdəmləri əhli-riya gördüm.

Əgər su damənin tutdum, rəvan döndərdi üz məndən,
Və gər güzgudən umdum sidq, əksi-müddəa gördüm.

Ayaq basdım dəri-ümmidə, sərgərdanlıq əl verdi,
Hünər sərriştəsin tutdum, əlimdə əjdəha gördüm.

Mənə göstərdi gərdun tirə bəxtim kövkəbin yüz gəz,
Məni-bədbəxt ona hər gah kim baxdım, qara gördüm.

Füzuli, eyb qılma üz çevirsəm əhli-aləmdən,
Nədən kim, hər kimə üz tutdum, ondan yüz bəla gördüm.

## BU QƏZƏL LEYLİ DİLİNDƏNDİR

Yar rəhm etdi məgər naləvü əfğanimizə
Ki, qədəm basdı bu gün külbeyi-əhzanimizə?

Əşk baranı məgər qıldı əsər kim, nagah
Bitdi bir şaxi-güli-tazə gülüstanimizə?

Bizə ah atəşinin yandığı ondan bilinir
Ki, çirağ eylədi rövşən şəbi-hicranimizə.

Bu vüsalə yuxu əhvalı demək mümkün idi,
Əgər olsaydı yuxu dideyi-giryanimizə.

Bir xəyal olsa məgər gördügümüz, yoxsa nigar,
Mütləqa xatirə gəlməz ki, gələ yanimizə.

Yar mehmanımız oldu, gəlin, ey canü könül,
Qılalım sərf nəmiz var isə mehmanimizə!

Dilbərin canə imiş qəsdi, Füzuli, gəl kim,
Can verib dilbərə, minnət qoyalım canimizə.

## BU QƏZƏL MƏCNUN DİLİNDƏNDİR

Küfri-zülfün salalı rəxnələr imanimizə,
Kafər ağlar bizim əhvali-pərişanimizə.

Səni görmək mütəəzzir görünür böylə ki, əşk
Sənə baxdıqda dolar dideyi-giryanimizə.

Cövrü çox eyləmə kim, olmaya nagəh tükənə,
Az edib, cövrü cəfalər qılıban canimizə.

Əskik olmaz qəmimiz bunca ki, bizdən qəm alıb,
Hər gələn qəmli gedər, şad gəlib yanimizə.

Var hər həlqeyi-zəncirimizin bir ağzı,
Müttəsil verməgə ifşa qəmi-pünhnimizə.

Qəmi-əyyam, Füzuli, bizə bidad etdi,
Gəlmişiz əcz ilə dad etməgə sultanimizə.

## MÜRƏBBE'

Qeyr ilə hər dəm nədir seyri-gülüstan etdigin?
Bəzm edib, xəlvət qılıb, yüz lütfü ehsan etdigin?
Əhd bünyadın mürüvvətdirmi viran etdigin?
Qanı, ey zalım, bizimlə əhdü peyman etdigin!?

Ləhzə-ləhzə müddəilər pəndini guş eylədin,
Qanə-qanə qeyr cami-şövqünü nuş eylədin,
Varə-varə əhdü peymanı fəramuş eylədin,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdigin!?

Qeyrə salıb mehrini bizdən sovutdun aqibət,
Tərki-mehr etdin, təriqi-zülm tutdun aqibət,
Əhdlər, peymanlar etmişdik, unutdun aqibət,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdigin!?

Cürmümüz noldu ki, bizdən eylədin bizarlıq?
Biz qəmin çəkdik, sən etdin özgəyə qəmxarlıq?
Sizdə adət bumudur? Böylə olurmu yarlıq?
Qanı, ey zalım, bizimlə əhdü-peyman etdigin!?

Çərxtək bədmehrlik rəsmini bünyad eylədin,
Yaxşı adın var ikən, döndün yaman ad eylədin,
Dönə-dönə bizi qəmnak, özgəni şad eylədin,
Qanı ey zalım, bizimlə əhdü peyman etdigin!?

Könlümüz minbə’d zülfünçün pərişan olmasın,
Bağrımız lə’lin həvasilə dəxi qan olmasın,
Bivəfasan! Çeşmimiz yadınla giryan olmasın,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdigin!?

Və’deyi-vəsl ilə aldın səbrimiz, aramımız,
Olmadı bir gün vüsalından müyəssər kamımız,
Keçdi hicr ilə, Füzulidən betər əyyamımız,
Qanı, ey zalım, bizimlə əhdü peyman etdigin!?

## BU MÜRƏBBE’ LEYLİ DİLİNDƏNDİR

Giriban oldu rüsvalıq əlilə çak, damən həm,
Mənə rüsvalığımda dustlar tə’n etdi, düşmən həm.
Rəhi-eşq içrə can qıldım giriftari-bəla, tən həm,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Əgər tutsam qəmim eldən nihan, səbrü qərarım yox,
Və gər şərhi-qəmi-pünhanım etsəm, qəmgüsarım yox,
Əsiri-bəndi-zindanəm, əlimdə ixtiyarım yox,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Olubdur əşki-xunab ilə gülgun çöhreyi-zərdim,
Yanıbdır atəşi-hicranə cani-dərdpərvərdim,
Cəfayi-çərxi-kəcrəftar əlindən var min dərdim,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Gəhi şövqi-vüsalü gəh bəlayi-hicr ilə zarəm,
Özüm həm bilməzəm dərdim nədir, mən necə bimarəm?
Qəmi-eşq içrə bir dərmanı yox dərdə giriftarəm,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Cüda səndən bəlavü dərdi-hicran ilə tutdum xu,
Qılır hər dəm mənə bidad dərd ayru, bəla ayru.
Bəlavü dərdə düşdüm, ruzigarım böylə, halım bu,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Təbibi-eşqə çün izhar qıldım dərdi-pünhanı,
Məni-bimarə mütləq olmadı bir səhhət imkanı,
Əzəldən var min dərdim ki, yoxdur hiç dərmanı,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

Füzuli, hər zaman bir tə'n ilə bağrım qılırsan qan.
Əcəb, bilməzmisən kim, eşqdən keçmək degil asan?
Bilirsən, düşmüşəm bir dərdə kim, yoxdur ona dərman,
Bu yetməzmi ki, bir dərd artırırsan dərdimə sən həm?

## QƏZƏL

Aşiq oldur kim, qılır canın fəda cananinə,
Meyli-canan etməsin hər kim ki, qıymaz caninə.

Canını cananə verməkdir kəmalı aşiqin,
Verməyən can, e'tiraf etmək gərək nöqsaninə.

Vəsl əyyamı verib canana can, rahət bulan,
Yeydir ondan kim, salır canın qəmi-hicraninə.

Eşq rəsmin aşiq öyrənmək gərək pərvanədən
Kim, göyər gördükdə şəm'in atəşi-suzaninə.

Fani ol eşq içrə kim, bənzər fənası aşiqin
Feyzi-cavid ilə Xızrın çeşmeyi-heyvaninə!

Eşq dərdinin dəvası qabili-dərman degil,
Tərki-can derlər bu dərdin mö'təbər dərmaninə.

Hiç kim canan üçün can verməgə laf etməsin
Kim, gəlibdir bu sifət ancaq Füzuli şaninə.

## BU QƏZƏL MƏCNUN DİLİNDƏNDİR

Öylə sərməstəm ki, idrak etməzəm dünya nədir,
Mən kiməm, saqi olan kimdir, meyü səhba nədir.

Gərçi canandan dili-şeyda üçün kam istərəm,
Sorsa canan, bilməzəm kami-dili-şeyda nədir.

Vəsldən çün aşiqi müstəğni eylər bir vüsal,
Aşiqə mə'şuqdən hərdəm bu istiğna nədir?

Hikməti-dünyavü mafiha bilən arif degil,
Arif oldur, bilməyə dünyavü mafiha nədir.

Ahü fəryadın, Füzuli, incidibdir aləmi,
Gər bəlayi-eşq ilə xoşnud isən, qovğa nədir?

## BU QƏZƏL LEYLİ DİLİNDƏNDİR

Ey qılan şeyda məni, məndən bu istiğna nədir?
Nişə sormazsan ki, əhvali-dili-şeyda nədir?

Gər mənə xəlq içrə pərva qılmadın, mə’zursan,
Böylə tənhalıqda qılmazsan mənə pərva, nədir?

Səhldir gər bilməyib halım, tərəhhüm qılmamaq,
Halımı bilmək, tərəhhüm qılmamaq əmda nədir?

Gül təmənnasında derlər bülbülün qövğaların,
Çün gülü gördükdə qılmaz meyl, bu qövğa nədir?

Ol pəri mütləq məni-rüsvayə qılmaz iltifat,
Ey Füzuli, bilməzəm cürmi-məni-rüsva nədir?

## BU QƏZƏL MƏCNUN DİLİNDƏNDİR

Biz cahan mə’murəsin mə’nidə viran bilmişiz,
Afiyət gəncin bu viran içrə pünhan bilmişiz.

Gər özün dana bilir təqlid ilə surətpərəst,
Aləmi-təhqiqdə biz onu nadan bilmişiz.

Bixəbərlər şərbəti-rahət bilirlər badəyi,
Biz həkimi-vəqtiz, onu tökmüşüz, qan bilmişiz.

Bilmişiz kim, mülki-aləm kimsəyə qılmaz vəfa,
Ol zamandan kim, onu mülki-Süleyman bilmişiz.

Ayrı bilmişsən, Füzuli, məscidi meyxanədən,
Səhv imiş ol kim, səni biz əhli-irfan bilmişiz.

## QƏZƏL

Yandı canım hicr ilə, vəsli-rüxi-yar istərəm,
Dərdməndi-firqətəm, dərmani-didar istərəm.

Bülbüli-zarəm, degil bihudə əfğan etdigim,
Qalmışam nalan qəfəs qeydində, gülzar istərəm.

Dəhr bazarında kasiddir mətai-himmətim,
Bu mətai satmağa bir özgə bazar istərəm.

Fani olmaq istərəm, yə'ni bəlayi-dəhrdən
Rahəti-cismi-zəifü cani-əfgar istərəm.

Nola gər qılsam şəbi-hicran təmənnayi-əcəl,
Neyləyim, çoxdur qəmim, dəf'inə qəmxar istərəm.

Çün bəqa bəzmindədir dildar, mən həm durmazam
Bu fəna deyrində, bəzmi-vəsli-dildar istərəm.

Ey Füzuli, istəməz kimsə rizasilə fəna,
Mən ki, bundan özgə bilmən çarə, naçar istərəm.

# F Ə Z L İ

*Fəzli böyük Azərbaycan şairi Məhəmməd Füzulinin oğludur. Kərbəla şəhərində doğulmuş və İraq mədrəsələrində mükəmməl təhsil almış, Bağdad, Nəcəf və Hilm şəhərlərində də yaşamışdır. Üç dildə – ərəb, fars və Azərbaycan dillərində gözəl şeirlər yazmışdır. Divanı bizə qədər gəlib çatmamışdır. Müasirləri onun o zaman çox dəbdə olan müəmma janrında və mənzum tarix söyləməkdə mahir olduğunu göstərirlər.*

*Şübhəsiz ki, şair atasının ölümü münasibətilə də tarix demişdir, bəlkə də şairin ölüm tarixi üçün "Köçdü Füzuli" cümləsini o demişdir.*

*Füzuli "Nəsihət" adlı əsərini ona yazmışdır. Fəzlinin ölüm ili məlum deyildir.*

## QƏZƏLLƏR

Mərdümləri gözün ki, bulaşdırdı qanlara,
Cəllad imiş ki, yazığı gəlməz cavanlara.

Dərdü qəmü ələm çü yüz verdi, ey könül,
Xoşhal olub təvazöh eylə, get həm anlara.

Ah, ol pəridən ayrılalı oncə ağladım,
Gözüm yaşıyla sellər axar bağbanlara.

Zahid, əgər xəta isə ol zülfü sevdiyim,
Qəbrim içində yalvarayım qoy ilanlara.

Ey Fəzli, söylə dərdin bir xəzəf itirməzəm,
Qanlı yaşımla yazım anı bir-bir divanlara.

* * *

Səbrim dükəndi, möhnətə qatlana bilməzəm,
Su başdan aşdı, eşq oduna yana bilməzəm.

Sən sərv boylu dilbəri tərk etməzəm əgər,
Ömrüm budağı cövr ilə utana bilməzəm.

Yarın başına ay ilə gün peykə çevrilir,
Ol şəm'ə məndən özgəni pərvana bilməzəm.

Aləm bilir ki, şol sənəmi sevmişəm, rəqib,
Başım gedərsə mən bu işi dana bilməzəm.

Vergil bu Fəzli kamına, fərdayə qoymagil,
Yoxdur vəfası ömrümün, inana bilməzəm.

* * *

Buldum saçında leylətül-əsra xəbərlərin,
Sordum ləbində möcüzi-İsa xəbərlərin.

Badi-səbayə zülf pəyamın gətir dedim,
Gəldi, gətirdi başıma sövda xəbərlərin.

Məcnun oturdu, illər ilə baxdı yollara,
Bir kimsə doğru vermədi Leyla xəbərlərin.

Didarə taqət edə bilirmisən, ey könül,
Eşitmədinmi nuri-təcəlla xəbərlərin?

Kipriklərin ki, ləşkərini yığdı bir yerə,
Ol saldı Fəzli canına qovğa xəbərlərin.

* * *

Dünyada gözəllər də'visin qılan,
Degil, anə necə yar olmaq gərək.
Xülqi-xoyi mələk, surəti insan,
Şəkər sözlü, şirin gar olmaq gərək.

Sürahi gərdənli, ləbləri qönçə,
Sədr vaseh ola, ol beli incə.
Miyanə boy ola, dalsı kənəkcə,
Ol püstə dəhanı dar olmaq gərək.

Qırmızısı qırmızı, ağa tay ola,
Ol qarası qara, qaşı yay ola.
Gül yanağı bədirlənmiş ay ola,
Sinəsində qoşa nar olmaq gərək.

Gözləri nərgis tək şö'ləvar ola,
Müjganları çöhrəsində xar ola,
Alıcı tərlan tək səbükbar ola,
Mə'rifətdən xəbərdar olmaq gərək.

On beş yaşlı ola, miyanə boylu,
Çox lağər olmaya, qucağa dolu,
Qolu uzun, ağ əlləri hənalı,
Sinəsi həm tazə qar olmaq gərək.

Şəkk olmaya anın əsil-soyuna.
Aqil-dana ola xülqü xoyuna,
Can asılı ola zülfü muyuna
. . . . . . . . . . . . . . . . . .

Xoş ana kim, ola bir belə yarı,
Hər kimin yox, mən tək olubdur zarı
Fəzliya, sən çağır ulu cabbarı,
Mənə məhşər günü yar olmaq gərək.

## MÜSTƏZAD

Ey sərvi-səhi, sən gələli seyr ilə bağə
            Sər çəkmədi ər-ər.
Çox alinəsəblər özünü saldi əyağə,
            Qul oldu sənubər.
Sünbül özünü zülfünə bənzətdi nigarın
            Gördü ki, xətadır.
Dağlarda bitər yüzi qara, başı aşağə,
            Qayqulu, mükəddər.
Şol xalın içün zülfünə çoxlar dolaşıbdır,
            Ancaq məni bilmən,

Bir danə pərvanə içün gör neçə quş düşdü duzağə,
Ram oldu müsəxxər.
Ey ruzi-qiyamət gününə münkir olanlar,
Dilbər gedər oldu,
Eşitməmisən suri-rəvani çalındı qulağə,
Qopdu mənə məşhər.
Ey nuri-təcəlla günəşi pərdə yüzündən,
Bir gecə götürsən,
Pərvanə kimi özü yana şə'mü çirağə,
Göylərdəki əxtər.
Sən tək pərinin mənzili viranə gərəkdir,
Ya çeşmələr üsti,
Könlüm təki viranə, gözüm təki bulağə,
Gəl hey pəripeykər.
Bir badə şərab istədim ol safi ləbindən,
Sərxoşmudu bilmən,
Çeşmin məni öldürməyə yapışdı biçağə,
Çəkdi mənə xəncər.
Zülfün sarıdan könlümə sevda yeli əsdi,
Reyhanmıdı bilmən,
Xansı çiçəgin qoxusudur doldu dimağə,
Can oldu müəttər.
Dünyadan əgər Fəzli gözü sayğulu getsə,
Yüzün həvəsindən,
Rəhmət yağışı torpağının üstünə yağə,
Qəbri ola ənvər.

# RƏHMƏTİ

*Azərbaycan və fars dillərində gözəl şeirlər yazmış bu şair haqqında ilk məlumatı öz dövrünün təzkirəçisi Təqi Əvhədi* (*1565-1620*) *"Ərəfat ül-aşiqin və ərəsat ül-arifin" adlı təzkirəsində* (*1613-1615-ci illərdə yazılıb*) *vermişdir. Bu məlumata əsasən şair nəsx və süls xətlərini gözəl yazmışdır. Təzkirəçi öz Hindistan səfərindən əvvəl* (*1605-ci ildən əvvəl*) *onun 7-8 min beytlik bir divanını Şirazda gördüyünü qeyd edir. Şair XVI əsrin ortalarında Təbrizdə anadan olmuş, dövrünün qarışıq siyasi hadisələrinin, İran-Türkiyə müharibələrinin şahidi olmuşdur. Təzkirə yazılan illərdə Hindistana səfər etmiş şair bir neçə ildən sonra 1616-cı ildə orada, Aqra şəhərində vəfat etmişdir.*

*Şairin elm aləminə məlum olan "Divanı"nın yeganə əlyazma nüsxəsi Azərbaycan SSR EA Respublika Əlyazmalar fondunda saxlanılır. Əsasən fars dilində yazılmış qəzəl, qəsidə, rübai və qitələrdən ibarət olan bu nəfis əlyazmasında şairin Azərbaycan dilində yazdığı şeirlərindən iyirmi beş qəzəl və bir rübaisi verilmişdir.*

## QƏZƏLLƏR

Bəzmi-vəslin məhrəmi gər verdi çoq həsrət mana,
Leyk hər bir həsrət oldu hicrdə rahət mana.

Göz yaşı gər durmasa naseh, məni mən' eyləmə,
Netmək olur böylə tə'lim eyləmiş adət mana.

Mən biləm yar ilə ey dil ol mənimdir mən anın,
Gəl sən imdi çıq aradan, vermə çoq zəhmət mana.

Öldürüb hicran məni qurtardı qəmdən ey əcəl,
Sən nə etdin kim, qoyarsan bu qədər minnət mana.

Rəhməti, Fərhad ilən Məcnun aradan çıqdılar,
İmdi meydanda mənəm, döndərdi yüz söhbət mana.

* * *

Eşq mə’ni aləmində bir əcəb me’mar imiş,
Hər yıxılmış xatirin tə’mirinə sərkar imiş.

Göstərir hər ləhzə yarın surətin yüz rənglə,
Eşq bir tərrahi-çabuk-dəsti-şirinkar imiş.

Ey könül, təqdiri təğyir eyləmək mümkün degil
Sana qismət eşq odu, İbrahimə gülzar imiş.

Xosrovu Şirin necə məhv etdi gör kim heç deməz,
Bisitun dağında bir Fərhad adlı var imiş.

Rişteyi-zülfüni zahid tari-təsbih eylədi,
Tari-təsbihi-ibadət rişteyi-zünnar imiş.

Dudi-ahim nə yerə sığar, nə gögə, Rəhməti,
Yer ilə gög aşiqin başinə gircək dar imiş.

* * *

Gəzərəm bir muğ içün guşeyi-meyxanələri,
Görməyəcək uraram daşlara peymanələri.

Söylə məndən, dəxi Məcnun ilə Fərhadı unut,
Nə ögərsən bu qədər bir neçə divanələri.

Zəhd əhlinə qədəh dut, başin içün, saqi,
Aşina eyləyə gör lütf ilə biganələri.

Əhli-təqva göricək, daneyi-xalın əlüdən
Buraxırlar yerə tez səbheyi-səddanələri.

Gər tarəğ diş ilə, ey Rəhməti, ol zülfü aça,
Düşə od canına yeldən yana dəndanələri

* * *

Tə’n eyləmək nə lazım Fərhadi-namuradə,
Heç kimsə bu cahanda yetişməmiş murədə.

Zahid əgər bənimlə oturmasa rəvadır,
Bir yerdə başə varmaz səccadə ilə badə.

İllər rizasıyçün zülfin dağıtma, ey yel
Dur, özgələr söziylən ömrüni vermə badə.

Kirpiklərin xədəngi sanma ki, zaye’ oldu,
Naziknihal olubdur hər biri bir yaradə.

Məcnunü şuri-Leyli, Fərhadü eşqi-Şirin,
Biçarə Rəhməti tək hər kimsə bir bəladə.

* * *

Ayəti-rəhmət kibi könlümə etdi rahlər,
Müshəf hüsnündə ol peyvəstə bismillahlər.

Yüzə gəldi gözlərim mərdümləri ta ağladum,
Qarə etdilər yüzümi yardən bədxahlər.

Gər kül olmuş təndə canü dil bulunsa niy əcəb,
Hind mülkündə çoq olur böylə atəşgahlər.

Tuba ilə sərvi qəddinə müşabih etməzəm,
Sana xanda yetişür hər qaməti-kutahlər.

Gül götürgəc vəsl xanını aradən, Rəhməti,
Bülbüli-şuridə sufilər kibi Allahlər.

* * *

Bizə bağrı qan olmuş bir neçə biçarələr derlər,
Sizə qanlar içici bağrı daş xunxarələr derlər.

Nə lazımdır ki, bədnam olasız bizdən kənar edün
Sizə pakizə-damanlar bizə xəmmarələr derlər.

Münəccimlər gözüm yaşın görəndə iztirab edib,
Neyçün qana dönüpdir yenə bu səyyarələr derlər.

Ağarmış başa rüsvalıq gətürdilər bu vəchilə,
Qara geymiş xəttü xalına yüzi qarələr derlər.

Əcəb gündür gəl imdi, Rəhməti, beyt-ül-həzəndən çıq,
Bu gün seyranə çıqmış bir-iki məhparələr derlər.

* * *

İtlər ilən sübhədək hər gecə fəryad eylərəm,
Xatiri-naşadimi bu növ ilə şad eyləyəm.

İtləri yadımğa ta düşcək qaranqu gecələr,
Yağa yırtıb, baş açıb ölüncə fəryad eylərəm.

Dəsti-qeyrət zəxmi-mühlik urdi canə, ey könül,
Ölürəm qəmdən səni, qəm çəkmə, azad eylərəm.

Eşq yar olsa əgər aləm yıxılsa qəm yemən,
Yüz pozuxnu eşq ilə bir dəmdə abad eylərəm.

Kuhi-qəm görgəc gəlürsin xatirimğə, Rəhməti,
Bisitun görkən kibi Fərhadını yad eylərəm.

* * *

Necə aşiqdir çəkər bir dağ içün Fərhad ah,
Aşiqi-sadiq mənəm birdir yanımda kuhü-kah.

İki gözdür yüzünqi seyr etməyə açmış fələk,
Birinə qoymuş münəccim mehr ad, birinə mah.

Eşq məsti ol dilavərdür ki, gər yüz cürm edər,
Dəftəri əmalinə səbt eyləməzlər bir günah.

Kuyinə getgəc gözümdən tökülür qanlı sirişk,
Qorxuram kim, lə'li-əşkim ola axir səngi-rah.

Qəbrim üzrə lalə neylər, mən fəna dəryasıyam,
Ol hübabımdır mənim, ey Rəhməti, biiştibah.

* * *

Bisitun dağını çapdım der urar Fərhad laf
Bilməmiş kim, aşiqin gözünə gəlməz kuhi-Qaf

Çoq bənimlə münhərif oturma-durma, ey hərif,
Dutmaya nagəh, məzacın daq, təriqi-inhiraf.

Daxili-hikmət degil nəfyi-mey etmək, əbsəm ol,
Aqil olan eylər öz cəhlinə hərgiz e'tiraf?

Nə yüz ilə daş urarsan mey xuminə, mühtəsib,
Sənin içün qarə yüzün kibi onun könlü saf.

Zahid abi-Kövsər istər, mən-şərabi-laləgün,
Var bizim ma-beynimizdə, Rəhməti, çoq ixtilaf.

* * *

Dəhr əsbabinə, ey dil, çoq dəxi etmə həvəs,
Çün məhəbbətdən dəm urdun, qeyrdən peyvənd kəs!

Eşq məsti, ey könül, mə'zurdur, asudə ol.
Kim sanqa nə şəhnə eylər hökm, niy miri-əsəs.

Eşq gəlgəc canü-dil təndən fərar etdi, bəli,
Dözə bilməz yanar odun şö'ləsinə xarü xəs.

Məhmili ardınca, bilmən, könlüm əfsanı nədür,
Kusi-rihlətmi ola bu, yoxsa fəryadi-cərəs?

Dil pəri bu cismi-bi candan nə istər, Rəhməti,
Quş ki, pərvaz eylədi, bilmən nəyə yarar qəfəs?

* * *

Ey pəriru, ta sənə yüz çeşmi-giryanım dutar,
Aqə-aqə yer yüzünü əşki-qəltanim dutar.

Qanlı yaş göz rövzənin dutdi varırkən kuyinə,
Qanda varsam qanı dolmuş kişi tək qanım dutar.

Canqa yetdim, bu könlünün əlkidən fəryad kim,
Tilbə yanlıq nə sözüm dinlər, nə fərmanım dutar.

İstərəm əğyar rəşkidən çıxam bu bəzmdən,
Dəsti-qeyrət duricək çaki-giribanım dutar.

Əzmi-tofvi-kuyin etsəm Rəhməti tək, gah-gah,
Getməmişkən bir qədər yüz xar damanım dutar.

* * *

Qana döndi yürəgim sibi-zənəxdanın içün,
Vermənəm istəgümi elimə öz canın içün.

Bas qədəm qəbrimə, naz ilə əzabım rə'f et,
Yüzün üzrə yazılan ayəti-Rəhmanın içün.

Arizin bağidə bir quş oxur idi dün gün,
Ol bənim könlüm idi saxla gülüstanın içün.

Gələ gər yanimə, ey tilbə könül, qəm çəkmə,
Rəgi-can riştə edim çaki-giribanın içün.

Çün xəyalı qonaq oldu sənə ehmal etmə
Cani qurban edə gör Rəhməti mehmanın içün.

* * *

Dudi-ahın, ey könül, göydə hüveydalanmasun,
Söylə öz həddini bilsin, çoq da babalanmasun.

Gördün ol sərvi-səhi qəddi, dur indi, ey səba,
Bağ ara sərvə xəbər ver çoq da yektalanmasun.

Zülfüni görgəc könül zünnar eylər arizu,
Qorxuram kim, şeyx Sə’an kibi tərsalanmasun.

Ey könül, sən xanda, Məcnun xanda, bari əbsəm ol,
Hər kim öz yerini bilsin, pəşşə-ənqalanmasun.

* * *

Bənim yerim fəna bəhrivü Məcnun yeri sahildür,
Bana bənzətmə anı ol bənim yanımda aqildür.

Yüzün görgəc ləbindən busə umsam incimə məndən,
Təsərrüfsüz tamaşa eyləmək eşq içrə müşküldür.

Giysun bağrımnı gər yüz parə etsə tan imas zira,
Fərağın şərbəti qayimməqam zəhri-qatildir.

Qara zülfini yad eylər dəma-dəm səbrsiz könlüm,
Cünuni ğalib olğan tilbədək zəncirə mayildir.

Könüllər naləsin, ey Rəhməti eşitgəc ol ğafil,
Edür məxsuslərlə kim, bu nə avazi-hayildür.

* * *

Arizin tək xansı bağın laleyi-sirabı var,
Lalə çoq, amma anun bir özgə abü tabı var.

Hicrdən çoq da məlul olma, könül, səbr eylə kim ta
Bu qaranqu gecənin əlbəttə bir məhtabı var.

Bilməzəm yarəb, nə müshəfdir cəmalın səfhəsi
Kim, müənbər xəttü mişkin xalilə e'rabı var.

Gözlərimdən tökülür qan yaş yerə baran kibi,
Ehtiraz et boylə yağışnın yaman seylabı var.

Anınçün başı yüksəkdir gögün, ey Rəhməti
Kim, anun daq sən kibi xurşidi-aləmtabı var.

* * *

Aşiqəm, aşiq nədür pəs bu sirişki-çöhrəgah,
Nəfyi isbat eyləmə, də'viyə mə'nidür günah.

Eşqə münkir düşmə, ey şeyxi riyayi, əbsəm ol,
Eylə şə'ni-əmalını bu e'tiqat etdi təbah.

Seyl çeşmim rəhgüzarində deyüz bir qətrə su,
Sər-səri-ahım yanında Bisitun bir bərgi-kah.

Tə'n edərlər göz götürsəm bir zaman səndən, bəli,
Yüz səvab etsən degil mənzur illa bir günah.

Rəhməti, ol türreyi- tərrar başdan tirədür,
Ya sənin dudlikindən öylə olmuşdur siyah.

* * *

Çakəri-piri-muğanuz büti-tərsa sevərüz,
Biz məhəbbət quluyuz hər kim olursa sevərüz.

Daği-xunin yaxaruz sineyi-çak üzrə müdam,
Bisitun dağı kibi laleyi-həmra sevərüz.

Kamımız verməz isən ərzi-tələbdən bari,
Bizi mən' etmə ki, izhari-təmənna sevərüz.

Gəlicək kuyində didar dəriğ etmə ki, biz,
Rindi firqətzədəyüz, Turü Təcəlla sevərüz.

Dəlqü təsbihü müsəlla nə deməkdür, zahid,
Munca yildür bütü zünnarü kəlisa sevərüz.

Ey könül, eşq ətəgin can əli birlə duta gör,
Qoy nə derlərsə desinlər ruxi-ziba sevərüz.

Rəhməti xum ətəgin dürdsifət dut, nə olur,
Qatı daq eyb degil sağəri-səhba sevərüz.

## RÜBAİ

Məclis içində Rəhməti mahi-siyam,
Meyxanəyə sübh baş çəkər, məscidə şam
Ta zahidü rahib ola andan xoşnud
Bir əlində təsbih, birisində cam.

## MÜNDƏRİCAT

ƏSSAR TƏBRİZİ



DASTANİ-ƏHMƏD HƏRAMİ

## YUSİF MƏDDAH

“V ə r q a  v ə  G ü l ş a h” p o e m a s ı (*parçalar*)



## MARAĞALI ƏVHƏDİ

C a m i - C ə m (*parçalar*)



## İMADƏDDİN NƏSİMİ

Q ə z ə l l ə r

## QASİM ƏNVAR

MİRZƏ CAHANŞAH HƏQİQİ

## XƏLİLİ

Q ə z ə l l ə r



## HAMİDİ

Q ə z ə l l ə r



## HİDAYƏT

Q ə z ə l l ə r

## ŞEYX İBRAHİM GÜLŞƏNİ

Q ə z ə l l ə r

## KİŞVƏRİ

Q ə z ə l l ə r

## BƏSİRİ



## HƏBİBİ

ŞAH İSMAYIL XƏTAYİ

XƏLİFƏ

SÜRURİ



ŞAHİ



HƏQİRİ

MƏHƏMMƏD FÜZULİ

FƏZLİ



RƏHMƏTİ

# AZƏRBAYCAN KLASSİK ƏDƏBİYYATINDAN SEÇMƏLƏR

ÜÇ CİLDDƏ

II CİLD

## XIII-XVI ƏSRLƏR AZƏRBAYCAN ŞERİ

"ŞƏRQ-QƏRB"

BAKI-2005

